**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**Yanvar-Fevral**
**№ 1 (659)**
**2014**

**Elmi-nəzəri, pedaqoji jurnal**

**BU NÖMRƏDƏ**

**Tarixin unudulmaz səhifələrindən**



**XIV qurultaydan sonra nümayəndələri düşündürən məsələlər**

**(Müsahibələr)**

---

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş:

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, “Ərgünəş” FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

# AZƏRBAYCAN MÜƏLLİMLƏRİNİN XIV QURULTAYINA

Hörmətli qurultay iştirakçıları!

Sizi və sizin simanızda bütün Azərbaycan müəllimlərini səmimi-qəlbdən salamlayır, hamınıza cansağlığı və xoşbəxtlik, fəaliyyətinizdə yeni-yeni nailiyyətlər arzulayıram.

Azərbaycan müəlliminin tarixən xalqımızın intellektual potensialının formalaşdırılmasında böyük xidmətləri vardır. Dilimizin, ədəbiyyatımızın, mədəniyyətimizin və mənəviyyatımızın keşiyində dayanan müəllim daim cəmiyyətimizdə hörmət və ehtiramla əhatə olunmuşdur. Azərbaycanın əldə etdiyi bütün nailiyyətlərin əsasında məhz müəllimin gərgin zəhməti və gündəlik fəaliyyəti durur. Təhsil sistemində həyata keçirilən bütün işlər, o cümlədən son on il ərzində 2700 məktəbin tikilməsi, təhsilin maliyyələşməsinin artırılması, idarə edilməsinin təkmilləşdirilməsi və digər islahatlar bütövlükdə təhsilimizin aparıcı qüvvəsi olan müəllimin mövqeyinin gücləndirilməsi üçün möhkəm zəmin yaradır.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın qəbul olunmasından sonra keçirilməsi qurultayınızı Azərbaycan müəllimlərinin əvvəlki ali məclislərindən fərqləndirən mühüm hadisədir. Strategiya qarşıdakı dövr üçün milli təhsil sisteminin prioritet istiqamətlərini və başlıca məqsədlərini müəyyən edərək sizin qarşınızda xalqımızın gələcəyi naminə həyati əhəmiyyətli yeni vəzifələr qoyur. Onun tələbi sürətlə modernləşən ölkəmizdə təhsil sisteminin insan kapitalının inkişafına xidmət etməsinin, təhsilin keyfiyyət göstəricilərinin ən yüksək səviyyəyə çatdırılmasının və bütün pillələrində köklü dönüş yaradılmasının, həmçinin müəllimin səmərəli fəaliyyətinin dünya standartlarına uyğun təşkilinin təmin olunmasından ibarətdir.

Qurultayınızın ötən müddət ərzində görülən işləri obyektiv qiymətləndirəcəyinə, taleyüklü məsələlər ətrafında müzakirələri və qərarları ilə ölkənin təhsil sisteminin təkmilləşdirilməsinə öz layiqli töhfəsini verəcəyinə ümidvar olduğumu bildirir və hər birinizə uğurlar arzu edirəm. İnanıram ki, Azərbaycan müəllimi gənc nəslin vətənpərvərlik ruhunda tərbiyə olunması, azərbaycançılıq məfkurəsinə sadiq və qloballaşan dünyada ölkəmizi layiqincə təmsil etməyə qadir vətəndaş yetişdirilməsində bundan sonra da var qüvvəsini əsirgəməyəcəkdir.

Dərin hörmətlə,

**İlham ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***

***Bakı şəhəri, 13 dekabr 2013-cü il***

# AZƏRBAYCAN MÜƏLLİMLƏRİNİN XIV QURULTAYI KEÇİRİLDİ




Dekabrın 14-də Heydər Əliyev Mərkəzində Azərbaycan müəllimlərinin XIV qurultayı keçirilib.

İlk öncə qurultay iştirakçıları Fəxri xiyabana gələrək ümummilli lider Heydər Əliyevin əziz xatirəsini yad edib, məzarı önünə gül dəstələri qoyublar. Görkəmli oftalmoloq-alim, akademik Zərifə xanım Əliyevanın da məzarı ziyarət olunub. Sonra Şəhidlər xiyabanında Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda mübarizədə şəhid olanların xatirəsi anılıb, məzarları üzərinə qərənfillər düzülüb.

Azərbaycanın bütün bölgələrindən nümayəndələrin seçildiyi XIV qurultayda Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri Ramiz Mehdiyev, Azərbaycan Respublikası Baş nazirinin müavini Elçin Əfəndiyev, Azərbaycan Respublikası Prezidenti Administrasiyası Humanitar siyasət məsələləri şöbəsinin müdiri Fatma Abdullazadə, Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarov, Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti Akif Əlizadə, Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyasının sədri Səttar Mehbalıyev, Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının sədri Məleykə Abbaszadə, Naxçıvan Muxtar Respublikasının təhsil naziri Piri Nağıyev, millət vəkilləri, işəgötürən təşkilatların təmsilçiləri, QHT nümayəndələri, ümumtəhsil, ilk peşə-ixtisas,

orta ixtisas və ali təhsil müəssisələrinin, yerli təhsil qurumlarının rəhbərləri, nüfuzlu müəllimlər və ziyalılar iştirak ediblər.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin qurultay iştirakçılarına ünvanlanmış təbrik məktubunu Azərbaycan Respublikası Prezidenti Administrasiyası Humanitar siyasət məsələləri şöbəsinin müdiri Fatma Abdullazadə nəzərə çatdırıb.

Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarov qurultay iştirakçılarını salamlayaraq Azərbaycan müəllimlərinin XIV qurultayının işinə uğurlar arzulayıb, geniş məruzə ilə çıxış edib.

Çıxış edən Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti Akif Əlizadə, Naxçıvan Muxtar Respublikasının təhsil naziri Piri Nağıyev, Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyasının sədri Səttar Mehbalıyev, Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının sədri Məleykə Abbaszadə, millət vəkili Bəxtiyar Əliyev, Bakı Ali Neft Məktəbinin prorektoru Ramiz Hümbətov, Azərbaycan Diplomatik Akademiyasının prorektoru Fariz İsmayılzadə, Zərifə Əliyeva adına liseyin direktoru Məhəbbət Vəliyeva, İsmayıllı Peşə Tədris Mərkəzinin direktoru Zaur Muradov, Bakı şəhəri 43 nömrəli məktəb-lisey kompleksinin direktor müavini Kəmalə Bədəlova, “Zəngi” liseyinin tarix müəllimi Taleh Şahbazov, Şuşa Rayon Təhsil Şöbəsi metodkabinetinin müdiri Rəsmiyyə Məmmədova və “Ernst & Yanq Holdinqs” Şirkətinin Azərbaycan üzrə idarəedici tərəfdaşı İlqar Vəliyev Azərbaycan müəllimlərinin XIV qurultayının təhsil sisteminin gələcək inkişaf perspektivlərinin müəyyənləşdirilməsi baxımından əhəmiyyətini qeyd ediblər. Müasir dövrdə Azərbaycan təhsilinin dünyanın qlobal təhsil ənənələrinə uyğunlaşması və insan resurslarının inkişafı baxımından qurultayda müzakirə edilən məsələlərin dəyərləndirilməsinin vacibliyi vurğulanıb.

Qurultayda “Azərbaycanda təhsilin inkişafı üzrə Dövlət Strategiyası”ndan irəli gələn məsələlər və qarşıya qoyulan vəzifələr təhlil olunub, Dövlət Strategiyasında nəzərdə tutulmuş əsas istiqamət və hədəflərin reallaşdırılması yolları haqqında maraqlı fikirlər səsləndirilib. Bundan əlavə, təhsilin bütün pillə və səviyyələri üzrə islahatların həyata keçirilməsi, biliklərə əsaslanan iqtisadiyyatın təşəkkülü, təhsil sisteminin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi istiqamətində atılacaq addımlar müzakirə olunub.

Çıxışlarda, həmçinin müəllim nüfuzu, idarəetmə, yeni maliyyələşdirmə mexanizminin tətbiqi, səmərəli təhsil mühitinin yaradılması, təhsilin keyfiyyətinin yüksəldilməsi və digər vacib məqamlardan söhbət açılıb. Müzakirələr zamanı müvafiq təkliflər səsləndirilib, qarşıda duran vəzifələrin həllinə dair mülahizələr irəli sürülüb.

Azərbaycan təhsilinin dünyanın qabaqcıl təhsil sistemləri sırasında yer tutması üçün həyata keçiriləcək islahatların yeni mərhələsinin müvafiq hədəflərə çatmağa imkan verəcəyinə əminlik ifadə olunub.

Sonda qurultayın qətnaməsi oxunub.

# AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL NAZİRİ MİKAYIL CABBAROVUN MƏRUZƏSİ




Hörmətli qurultay iştirakçıları!

Əziz qonaqlar!

Xanımlar və cənablar!

Azərbaycan Respublikasının Təhsil Nazirliyi adından, ölkəmizin bütün təhsil işçiləri adından sizi ürəkdən salamlayır, hörmət və ehtiramımı bildirir, ən xoş arzularımı yetirirəm.

Bu gün biz bu möhtəşəm saraya - müasir Bakının rəmzlərindən birinə çevrilən və dahi Heydər Əliyevin adını daşıyan Mərkəzə Azərbaycan müəllimlərinin XIV qurultayına toplaşmışıq.

Qurultayın keçirilməsi üçün müasir dünya memarlığının incisi sayılan bu məkanın seçilməsi müstəqil dövlətimizin memarı və qurucusu Heydər Əliyev şəxsiyyətinə Azərbaycan müəllimlərinin dərin hörmət və ehtiramının ifadəsidir. Öz quruluşu ilə zamanın davamlılığını, həyatın əbədiliyini təcəssüm etdirən, keçmişlə gələcəyin vəhdətini bildirən,



ağ rəngdə olması ilə aydın gələcəyi simvolizə edən bu Mərkəzdə dünənimizdən bu günümüzə, bu günümüzdən sabahımıza bir mənəvi körpü rolunu oynayan təhsil sisteminin mövcud durumunu dəyərləndirəcək, qloballaşan dünyada təhsilimizin gələcək inkişaf yollarını, yeni strateji istiqamətləri və qarşıda duran başlıca hədəfləri birgə müzakirə edəcəyik.

Hörmətli qurultay iştirakçıları!

Düz 107 il bundan qabaq, 1906-cı ildə Bakıda Həbib bəy Mahmudbəyovun rəhbərlik etdiyi rus-Azərbaycan məktəbində Azərbaycan müəllimlərinin I qurultayı keçirilmişdir. Qurultayın işində Həsən bəy Zərdabi, Nəriman Nərimanov, Əli bəy Hüseynzadə, Əhməd bəy Ağaoğlu, Firidun bəy Köçərli, Üzeyir bəy Hacıbəyli, Süleyman Sani Axundov kimi o dövrün tanınmış maarifçi ziyalıları iştirak etmişlər. XX əsrin əvvəllərində maarifçilik ideyaları ətrafında birləşən bu böyük ziyalıların istiqlal mübarizəsi Azərbaycan Xalq Cümhuriyyətinin yaranması ilə nəticələndi.

Qısa ömür sürməsinə baxmayaraq, milli dövlətçilik ideyaları xalqımızın qəlbində möhkəm kök saldı, onu daim irəliyə, dövlətçiliyin əsaslarının qurulmasına istiqamətləndirdi. Bu tarixi missiyanı, yəni hər bir xalqın öz inkişafında arzulaya bildiyi ən yüksək və müqəddəs məqsəd - müstəqil dövlətin qurulması və onun ən çətin sınaqlardan keçirilərək möhkəm bünövrə üzərində bərqərar olunması missiyasını ulu öndərimiz Heydər Əliyev şərəflə yerinə yetirdi. Onun siyasətini layiqincə davam etdirən İlham Əliyev cənabları qısa müddət ərzində ölkəmizi inanılmaz şəkildə dəyişdirməyə nail oldu və dövlətimizi ən uca zirvələrə qaldırdı. Cənab Prezidentin andiçmə mərasimində söylədiyi “Azərbaycan öz tarixində heç vaxt bugünkü kimi güclü olmamışdır” sözlərini istənilən sahədə əyani olaraq görürük və hiss edirik.

İlham Əliyevin ölkəyə rəhbərliyi dövründə həyata keçirdiyi düşünülmüş və uzaqgörən daxili və xarici siyasət, iqtisadi sahədə aparılan məqsədyönlü və ardıcıl islahatlar müstəqil Azərbaycanı siyasi və iqtisadi baxımdan sabit, davamlı inkişaf edən dövlət, beynəlxalq aləmdə etibarlı tərəfdaş, regionda lider ölkə kimi tanıtmışdır.

Ölkədə siyasi sabitlik və məqsədyönlü islahatlar prosesi misilsiz iqtisadi artımla müşayiət olunmuş, sosial həyatın hər bir sahəsində tərəqqiyə güclü təkan vermişdir.

Son 10 ildə aparılan sosialyönümlü islahatlar nəticəsində müasir tələblərə cavab verən infrastruktur layihələri həyata keçirilmiş, yüksək standartlara cavab verən təhsil, səhiyyə, mədəniyyət və idman obyektləri inşa edilib istifadəyə verilmişdir. Bu nailiyyətlər ölkədə sosial sfera, o cümlədən təhsil sahəsində əsaslı islahatların aparılmasına təkan vermiş, onun davamlı inkişafına stimul yaratmışdır.

Lakin həyat yerində durmur, dünya hər gün dəyişir, inkişaf edir. Bu dəyişikliklərlə hər zaman ayaqlaşmaq, onlardan geri qalmamaq üçün üzərimizdə hər gün çalışmalı, böyük zəhmət hesabına qazandığımız nailiyyətlərin qorunub saxlanılmasını və geridönməzliyini təmin etməliyik.

Bu baxımdan Azərbaycan Respublikasının dövlət bayrağındakı rənglərin daşıdığı məna və onların yuxarıdan aşağı yerləşmə ardıcıllığı ilə bu gün təhsil sistemimizin qarşısında duran əsas hədəflərin prioritetliyi arasında müəyyən bir paralelliyi müşahidə et-

mək olar: təhsil sisteminin yetişdirdiyi vətəndaş, ilk növbədə, öz köklərinə bağlı və milli mənsubiyyəti ilə fəxr edən vətənpərvər, dərin biliyə malik müasir baxışlı və mütərəqqi insan, öz xalqının adət-ənənələrinə və mənəvi dəyərlərinə sadiq bir şəxs olmalıdır.

Bu bir reallıqdır ki, müasir dövrdə ölkələrin inkişafı yalnız təhsil vasitəsilə əldə edilə bilər. Dünya təcrübəsi göstərir ki, istənilən dövlətin inkişaf səviyyəsini ölkənin təbii sərvətlərinin bolluğu deyil, bu sərvətlərin yüksək potensiala malik insan kapitalına çevrilməsi təmin edir.

Bu baxımdan Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin böyük uzaqgörənliklə dediyi: "Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik. Neft, qaz Tanrıdan verilən böyük nemətdir, biz bundan uğurla və məharətlə istifadə edirik. Amma gec-tez bu təbii sərvətlər tükənəcək və bilik, zəka, səviyyə isə ölkəmizin dayanıqlı inkişafını uzun illər bundan sonra da təmin edəcəkdir. Ən inkişaf etmiş ölkələrin təcrübəsinə baxsaq görərik ki, o ölkələrin inkişafında ən aparıcı rol oynayan neft, qaz deyil, bilikdir, elmi-texniki tərəqqidir, yeni texnologiyalardır," - konseptual fikrinin əsasında da məhz həmin tələb, müasir təhsil sisteminin yetişəcəyi əsas strateji hədəf dayanır.

Ölkədə aparılan təhsil islahatlarına və təhsilin inkişafına öz layiqli töhfələrini vermiş Heydər Əliyev Fondunun prezidenti, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban xanım Əliyevanın bu yaxınlarda Azərbaycanın YUNESKO-ya üzv qəbul olunmasının 20 illiyi münasibətilə Parisdə keçirilən mərasimdə söylədiyi: "Son 20 ildə biz ölkəmizdə təhsil sisteminin inkişafına və müasirləşdirilməsinə xüsusi diqqət yetirmişik. Biz dərindən inanırıq ki, yalnız yüksək səviyyəli təhsilə malik olan ölkə uğurlar əldə edə və xalqı üçün daha yaxşı həyat keyfiyyətini təmin edə bilər" - sözlərinin təməlində də yüksək intellektə malik insan kapitalının yetişdirilməsini təmin etmək üçün beynəlxalq standartlara uyğun müasir təhsil sisteminin qurulmasının vacibliyi ideyası durur. İnanırıq ki, Heydər Əliyev Fondunun təşəbbüsü ilə təhsil sistemində gerçəkləşdirilən irimiqyaslı layihələrin davamı olaraq YUNESKO və Azərbaycan hökuməti arasında bu il iyulun 18-də təhsil, elm, mədəniyyət və kommunikasiya sahəsində əməkdaşlığa dair Çərçivə Sazişinin imzalanması Azərbaycanda təhsil sahəsində aparılacaq islahat prosesində yeni mərhələnin başlanmasına güclü təkan verəcəkdir.

Bildiyiniz kimi, Azərbaycan iqtisadi sahədə keçid dövrünü başa vurduğundan ölkəmizin qarşıdakı illərdə sosial-iqtisadi və mədəni inkişaf yollarını müəyyənləşdirən "Azərbaycan 2020: Gələcəyə baxış" İnkişaf Konsepsiyası hazırlanmış və dövlət başçısının 29 dekabr 2012-ci il tarixli Sərəncamı ilə təsdiq edilmişdir. Həmin tarixi sənəddə ənənəvi iqtisadiyyatdan "bilik iqtisadiyyatı"na keçidin əsasının qoyulması, bunun üçün həlledici amil olan insan kapitalının adekvat inkişafının ön plana çəkilməsi nəzərdə tutulmuşdur. Bu, təhsil sisteminin də kökündən dəyişdirilməsinə, əlavə təhsil, ömürboyu təhsil kimi komponentlərin əhəmiyyətinin artırılmasına gətirib çıxarır. Eyni zamanda İKT və virtual tədrisin, kompyuter şəbəkə biliklərinin rolunun artırılmasını nəzərdə tutur. Başlıca strateji məqsədi davamlı iqtisadi artım və sosial rifah olan Konsepsiyada təhsil-

də keyfiyyətin yüksəldilməsi və müasir təhsil sisteminin qurulması da əsas strateji istiqamətlərdən biri kimi ön plana çəkilmişdir.

Hörmətli qurultay iştirakçıları!

Ölkəmizin İnkişaf Konsepsiyasından irəli gələrək dövlət başçısının yeni prezidentlik müddətində ilk imzaladığı sənədlərdən biri "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" olmuşdur. Sənədin missiyası ölkəmizin modernləşdirilməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirmək və bununla Azərbaycanın beynəlxalq rəqabət qabiliyyətini yüksəltməkdən ibarətdir. Strategiya təhsil sahəsində aparılacaq islahatların başlıca istiqamətlərini müəyyənləşdirir, Azərbaycan təhsilinin XXI əsrin çağırışlarına uyğun inkişaf üfüqlərini özündə ehtiva edir və təhsilin bütün pillələrində keyfiyyətcə yeni mərhələyə başlamağı - "qara qızılı insan qızılına çevirək" fəlsəfəsini qarşımıza əsas vəzifə kimi qoyur.

Bu sənəd təhsil ilə bağlı olan bütün subyektləri və fəaliyyət sahələrini əhatə edir. Bu əhatəlilik həmçinin Azərbaycanın gələcək inkişafının davamlı xarakter alması üçün peşəkar bilik və bacarıqlara yiyələnən və rəqabətədavamlı insan resurslarının yetişdirilməsi missiyasına xidmət edir, Azərbaycan təhsilinin yeni keyfiyyət mərhələsinə keçidi istiqamətində genişmiqyaslı tədbirlərin həyata keçirilməsini nəzərdə tutur. Dövlət Strategiyasında təhsilin keyfiyyətinin yaxşılaşdırılması, təhsili idarəetmə sisteminin yenidən qurulması, kadr hazırlığının gücləndirilməsi, müəllim peşəsinin nüfuzunun artırılması, müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması, müasir təfəkkürlü Azərbaycan vətəndaşının yetişdirilməsi əsas hədəflər kimi götürülür.

Düşünürəm ki, Strategiyanın reallaşdırılması təhsilin məzmununun mənimsənilməsini təmin edən səriştəli təhsilverənlərin formalaşdırılmasına, təhsildə nəticələrə görə cavabdeh, şəffaf, səmərəli tənzimləmə və idarəetmə mexanizmlərinin, müasir tələblərə uyğun və ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılmasına zəmin yaradacaqdır. Bu sənəd, həmçinin ölkəmizin modernləşməsi üçün zəruri olan insan kapitalının inkişaf etdirilməsinə, təhsil infrastrukturunun Azərbaycanın perspektiv inkişaf konsepsiyasına uyğun yenidən qurulmasına imkan verəcək, ölkədə biliklərə əsaslanan iqtisadiyyatın və informasiya cəmiyyətinin təşəkkülünü, davamlı inkişafını təmin edəcəkdir. Bu sənəddə biz bilik cəmiyyətinin, kreativ təhsil düşüncəsinin, hədəfləri ölçülə bilən fəaliyyət çərçivəsinin və yeni təhsil fəlsəfəsinin ana xətlərini görə bilərik. Burada əsas ehtiva olunan dəyər odur ki, təhsil dövlət siyasətimizin əsas prioritetinə çevrilir. Bu baxımdan Strategiyanın icrası istiqamətində Təhsil Nazirliyi bütün maraqlı tərəflərlə, hədəf qrupları ilə faydalı əməkdaşlıq əlaqələri yaratmaq niyyətindədir. Strategiyada nəzərdə tutulan hədəflərə nail olunması prosesində birgə iş aparılmalı və problemlərin həlli yolları birgə araşdırılmalıdır.

Strategiyanı reallaşdıran əsas vasitə kimi "Açıq təhsil" modelinin qurulması və tətbiqi nəzərdə tutulur. Bu model aşağıdakı konseptual yanaşmalar üzərində qurulacaq:

• Məzmunda - dərs və dərsdənkənar fəaliyyətin inteqrasiyası təmin ediləcək;

• Müəllim-təhsil prosesinin istiqamətləndiricisi və koordinatoru rolu oynayacaq;

• Əlyetərlilik - hamıya ömürboyu təhsil almaq üçün imkanlar və zəruri infrastruktur

yaradılacaq;

• İdarəetmədə-tənzimləmə və əməliyyat funksiyaları bir-birindən ayrılacaq, idarəetməyə onun nəticələrində maraqlı olan bütün tərəflər cəlb olunacaq və ən əsası, nəticələrə görə cavabdehlik prinsipi işə salınacaq;

• Maliyyələşdirmədə-maliyyələşdirmənin dayanıqlı və adekvat olmasını təmin edən səmərəli və nəticəyönlü yeni model qurulacaq;

• İnfrastrukturda - elektron təhsil üçün geniş imkanlar yaradılacaqdır.

Strategiyanın birinci istiqaməti səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılmasını və təhsilin bütün pillələri üzrə kurikulumların inkişafı kimi vacib hədəfi əhatə edir. Tədris proqramı vaxtaşırı yenilənməli olan bir sistemdir. Bu xüsusilə də sürətlə dəyişən bir dünyada daha mühümdür. Məktəb proqramları şagirdlərimizə elmlərin əsasını dərindən öyrənməyə və məktəbdə aldıqları bilikləri həyatda işlətməyə kömək etməlidir. Təhsilin məzmunu uşaqlarımızda dərrakəni inkişaf etdirməyə, hadisələrin səbəblərini dərk etməyə və düzgün qərar qəbul etmək bacarıqları aşılamağa xidmət etməlidir. Müasir dünyanın tələbi olaraq gənc yaşlarından başlayaraq qrup tapşırıqlarının verilməsinə də xüsusi yer ayrılmalıdır.

Xüsusi diqqət xarici dillərin və dəqiq elmlərin tədrisinə verilməli, bu fənlərə ayrılan saatlar artırılmalıdır. İbtidai təhsil səviyyəsində məntiqli düşüncə, ümumi savad və həyati vərdişlərin öyrədilməsi əsas xətt kimi qoyulmalı, ana dilinin və riyaziyyatın tədrisinə böyük önəm verilməlidir. Fənn kurikulumlarının mahiyyətinin valideynlər tərəfindən mənimsənilməsi üçün maarifləndirmə işinin gücləndirilməsi də böyük əhəmiyyət kəsb edir.

Növbəti tədris ilində artıq təhsilalanların həftəlik və gündəlik dərs yükünü azaltmaqla paralel olaraq tədris ilinin müddətinin artırılması istiqamətində addımlar atılacaqdır. Bunun həyata keçirilməsində əsas məqsəd 32 həftəlik tədris ili və 5 günlük iş rejimi şəraitində şagirdlərin həddən artıq yüklənməsinin qarşısını almaq, 3 ay yarım tədrisdən ayrılmanın onların akademik davamiyyətinə mənfi təsirini azaltmaq, şagirdlərin sağlamlığının qorunmasını təmin etmək, ən başlıcası isə tədris prosesinin optimallaşdırılmasını və səmərəli təşkilini təmin etməkdən ibarətdir. Həmçinin yuxarı siniflərdə məcburi və seçmə fənlər modelinin tətbiqi nəzərdə tutulur. Bu modelin yuxarı siniflərdə tətbiqi şagirdlərin meyil və maraqlarının nəzərə alınmasına və ali məktəbə hazırlaşmalarına kömək etmək məqsədi güdür.

Təmayüllü məktəb və siniflərin yaradılması istiqamətində işlərin daha da genişləndirilməsi nəzərdə tutulur, şagird və valideynlərə tam orta təhsil səviyyəsində-təmayülləşmə və ya ümumi təhsil proqramı çərçivəsində qalmağa seçim imkanı yaradılacaqdır.

12 illik ümumi təhsilə keçid kurikulumların yenilənməsinə və tam orta təhsil səviyyəsində təlimin profilləşməsinə təkan verəcəkdir, təmayüllü məktəb və siniflər şəbəkəsi uşaqların gələcək əmək fəaliyyətinin sahəsinin seçilməsinə kömək göstərəcəkdir.

Eyni zamanda, biz pedaqoji təlimi təhsilin ikinci əsas funksiyasından-tərbiyədən ayırmamalıyıq, uşaqlarımızı erkən yaşdan düzgün-saf və təmiz tərbiyələndirməliyik. Birinci sinifdən şagirdlərdə mərdlik, məsuliyyət, yoldaşlıq, Vətənə məhəbbət, millətə, xalqa bağlılıq kimi keyfiyyətlər aşılanma-

lıdır. Şagirdlərin mənəvi aləmi bu keyfiyyətlər üstündə qurulduğu zaman müəllim bir tərbiyəçi kimi öz məqsədinə çatmış hesab oluna bilər. Uşaqların tərbiyəsinə onların böyüdüyü mühitin, ətrafdakı insanların və xüsusilə ailənin böyük təsiri vardır. Ona görə də təhsilin məzmunu onların bir cəmiyyətdə, bir-birinə qarşılıqlı hörmət və dəstək formasında inteqrasiya edilməsinə yardım etməli, məktəbi "sosial lift" funksiyasını yerinə yetirməyə sövq etməlidir. Məktəbdə uşaqlar yalnız biliyinə görə fərqləndirilməlidir. Şagirdlərin marağının artırılması və dünyagörüşünün inkişafını təmin etmək məqsədilə məktəbdənkənar müəssisələrin işi də mütləq yaxşılaşdırılmalıdır. Bu sahədə olan vəziyyət bizi qətiyyən qane etmir.

Təhsilin məzmununun təkmilləşdirilməsindən söhbət getdikdə dərslik mövzusuna toxunmamaq olmaz. Əvvəlki illərdə də olduğu kimi, indi də yaxşı dərs vəsaitlərinə və metodik ədəbiyyata böyük ehtiyacımız vardır. Təhsilin səviyyəsi xeyli dərəcədə bunların keyfiyyətindən və məzmunundan asılıdır. Problemi həll etmək üçün onun kökünə varmaq lazım gəlir. Kökü isə müəllifdir, daha doğrusu, müəlliflərin az olmasıdır. Təhsil Strategiyasında kurikuluma əsaslanan yeni dərsliklərin yaradılması, şagird və müəllimlərin müvafiq dərslik seçiminin təmin olunmasına böyük diqqət ayrılır. Eyni zamanda, müasir tələblər təhsilverənlər qarşısında təkcə dərsliyin məzmununun təhsilalanlar tərəfindən mənimsənilməsini deyil, həmçinin və bəlkə də daha vacib - lazımi bilikləri necə və haradan əldə etmək yollarını onlara öyrətməyi tələb edir. Ona görə də dərsliklərlə yanaşı, təfəkkürün və şəxsiyyətin inkişafına yönəlmiş, yeni kurikulum və informasiya-kommunikasiya texnologiyaları əsasında təhsilverənlər üçün təlim metodologiyaları, metodiki vəsaitlər, didaktik materiallar və digər təlim vasitələrinin hazırlanmasını stimullaşdıran mexanizmlər də yaradılmalıdır.

Tərəfimizdən dərsliklərin keyfiyyətini yüksəltmək məqsədi ilə dərslik müəlliflərinə kurikulumun tələblərinin dərindən öyrədilməsinin təşkili nəzərdə tutulmuşdur. Bu işin əsas məqsədi kurikulumun əsas tələblərinin, standart və alt-standartların dərsliyin məzmununa çevrilməsi yollarının öyrədilməsi, dərsliklərin qiymətləndirilməsi meyarlarının izah edilməsindən ibarətdir.

İkinci strateji istiqamət təhsil sahəsində insan resurslarının müasirləşdirilməsini nəzərdə tutur. Bu istiqamət innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin formalaşdırılmasına xidmət edir.

Heç bir təhsil sisteminin gücü onun tərkibində fəaliyyət göstərən müəllimlərin gücündən üstün ola bilməz. Təhsildə olan qüsurların əsas səbəblərindən biri pedaqoji heyətin xeyli hissəsinin hələ də kifayət qədər ixtisaslı olmamasından irəli gəlir. Son 20 ildə, ildən-ilə artan templə məktəblərə çoxlu sayda yeni, təcrübəsiz və bəzi hallarda kifayət qədər pedaqoji təhsili olmayan təhsilverənlər gəlmişdir. Hətta onların arasında saxta diplomlarla işləyənlərə də rast gəlinir. Bir tərəfdən bunun kökü müəllim peşəsinin çətin və ağır olması ilə yanaşı, az maaşlı olduğundan cəmiyyətdə öz cəlbediciliyini itirməsi və nəticədə savadlı gənclərin özləri üçün daha perspektivli olan başqa peşələri seçməsi olmuşdursa, digər tərəfdən ali təhsil müəssisələrinə mövcud qəbul qaydalarının

müəllim peşəsi üçün ən aşağı bal ilə qəbul olunmaq imkanı yaratdığından çox aşağı bilik səviyyəli insanların bu ixtisasa axınını stimullaşdırmışdır.

Hazırda müəllim hazırlığı sistemində paradoksal vəziyyət yaranmışdır. Təkcə ali təhsil müəssisələrinin hazırladıqları pedaqoji kadrların sayı onlara olan real tələbatı 3 dəfə üstələyir. Bunun üstünə kollecləri də əlavə etsək, sistemin nə qədər qeyri-səmərəli çalışdığını aydın görə bilirik. Ona görə də mövcud vəziyyəti dözülməz hesab edərək, pedaqoji kadr hazırlığı məsələlərinə xüsusi diqqət ayrılmasını, bu sahədə nəticələri davamlı olaraq aşağı olan təhsil müəssisələrinin fəaliyyətinin dayandırılmasını vacib sayırıq.

Müəllim peşəsinin ictimai nüfuzunun artırılması, onun yüksək maddi və mənəvi motivasiyası, pedaqoji təhsilə istedadlı gənclərin cəlb olunması - bunlar islahatların uğurla həyata keçirilməsi üçün ən vacib amillərdir. Müəllim sənətinə istedadlı gənclərin cəlb edilməsi məqsədi ilə dövlət sifarişinin imkanlarından səmərəli istifadə olunması, tələbə dövründən başlayaraq maddi stimullaşdırma mexanizmləri işə salınmalıdır.

Təhsil sisteminin keyfiyyət göstəricilərinin kəskin yaxşılaşdırılmasını təmin etmək məqsədi ilə biz mövcud müəllim korpusunun təkmilləşdirilməsi ilə eyni vaxtda bu gün müəllim kimi fəaliyyət göstərməyən, lakin müvafiq bilik və səriştəyə malik olan peşəkarların və elm mütəxəssislərinin təhsil sektoruna cəlb edilməsinə nail olmalıyıq. Bu məqsədlə Təhsil Nazirliyi onlar üçün pedaqoji hazırlıq kursları təşkil etməyə hazırdır.

Müəllim hazırlığında başlıca strategiya fənn biliklərinin mənimsənilməsindən daha çox tələbələrin peşəuyarlığına, pedaqoji ustalığın inkişafına, zəruri kompetensiyaların formalaşdırılmasına, müasir təlim metodlarının mənimsənilməsinə yönəldilməlidir.

Təhsilin keyfiyyətini yüksəltmək üçün pedaqoji-metodiki bacarıqları, fənn üzrə bilikləri artırmaq, innovativ təlim metodologiyasının və resursların mənimsənilməsi üçün hər bir müəllimi ixtisasartırma tədbirlərinə cəlb etmək lazımdır.

Paralel olaraq müəllimlərin peşəkarlıq səviyyəsinin könüllü əsaslarla yoxlanılması nəzərdə tutulur. Keçiriləcək könüllü attestasiya nəticəsində uğur əldə edən müəllimlərə aldıqları dərəcələrə görə diferensiallaşdırılmış əməkhaqqının verilməsi təmin ediləcək, attestasiyadan keçməyən müəllimlər üçün isə təlimlər təşkil ediləcək, növbəti attestasiyaya hazırlaşmaq üçün imkan yaradılacaqdır.

Müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması üzrə yeni sistemin yaradılması üçün müvafiq addımlar atılacaq, pedaqoji fəaliyyətinin qiymətləndirilməsindən sonra onun maddi motivasiya və vəzifə yüksəlişinin təmin olunması üzərində işləmək lazım gələcəkdir.

Üçüncü strateji istiqamət təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılmasını nəzərdə tutur. Müasir təhsili idarəetmə strukturunda tənzimləmə və əməliyyat funksiyaları ayrılmalı, akkreditasiya, sertifikatlaşdırma və peşə təhsili üzrə yeni idarəetmə strukturları yaradılmalı, təhsil müəssisələrinin sayı və növləri rasionallaşdırılmalı, pillələr və səviyyələr üzrə təhsilin strukturu təkmilləşdirilməlidir.

Bu istiqamət üzrə ilk addımımız hazırkı məktəb direktorları və məktəb direktoru olmaq arzusunda olan digər şəxslər üçün

müasir peşə standartları əsasında təlimlərin təşkili olacaqdır. Təlimi uğurla bitirən və imtahanda yüksək nəticə göstərib keyfiyyət sertifikatı almış şəxslər məktəb direktoru təyin olunacaqlar. Bu kateqoriyadan olan məktəb direktorlarının əməkhaqqına əlavələr təyin ediləcəkdir. Nəticə etibarilə müasir idarəetmə, hesabatlılıq və məsuliyyətin bölüşdürülməsi prinsiplərinin tətbiq edilməsi yolu ilə məktəblərin idarə edilməsində şəffaflığın və aşkarlığın artırılmasını təmin etmiş olacağıq.

Tənzimləmə və idarəetmə funksiyalarını həyata keçirən dövlət qurumlarının səlahiyyət və məsuliyyət dairəsinin yenidən müəyyənləşdirilməsinə ehtiyac duyulur. Hesab edirik ki, yerli qurumlar passiv müşahidəçi rolundan idarəetmə funksiyalarını tam olaraq öz əllərinə almalı, məktəblərdəki vəziyyətlə, kadrların yerləşdirilməsi, tədris prosesi ilə gündəlik maraqlanmalı, lazımi dəstək göstərməlidirlər. Təhsil müəssisələrinin özünüidarəolunmasına, ilk növbədə, məsuliyyəti dərketmə prizmasından yanaşılmalı, bu prosesə yalnız və yalnız müəssisənin fəaliyyətinin obyektiv parametrlərə uyğunluğu təsdiqləndikdən sonra başlanılmalıdır.

Ali təhsil müəssisələrinin idarəolunmasının mütərəqqi prinsiplərə əsaslanan, iqtisadi cəhətdən səmərəli və akademik göstəricilərin yüksək olmasını təmin edən yeni tələblər üzərində qurulmasının vaxtı artıq gəlib çatmışdır. Bugünkü gündə universitetlərimizin elmi kadr, zəngin təcrübə və maddi bazasının potensialından ali təhsildən kənarda, demək olar ki, istifadə olunmur. Diqqət yalnız qəbula yönəlmiş, gəlir mənbəyi kimi yalnız tələbələrin təhsil haqqı əsas götürülür. Halbuki, dünyanın ən reytinqli təhsil ocaqlarında təhsil haqqı onların büdcəsinin heç dörddə birini təşkil etmir.

Qəbuldan söhbət düşdüyü üçün Strategiyada bununla bağlı ali və orta ixtisas təhsili müəssisələrinə qəbul və yerləşdirmə mexanizminin təkmilləşdirilməsi, dövlət və özəl ali təhsil müəssisələrinə ödənişli təhsil üzrə qəbul planının ləğv edilməsi və dövlət sifarişinin yalnız ixtisaslar üzrə müəyyənləşdirilməsi nəzərdə tutulmuşdur. Bizim bu məsələyə yanaşmamız ondan irəli gəlir ki, keyfiyyətli təhsil vermək imkanlarına, maddi-texniki şəraitlərinə, elmi-pedaqoji heyətin potensialına görə bütün ali təhsil ocaqları - istər dövlət, istərsə özəl iki qrupa bölünməlidir - milli statuslu universitetlər və adi universitetlər. Dövlət sifarişi yalnız milli statuslu universitetlər arasında bölüşdürülməli, eyni zamanda bura qəbul olunmaq istəyən abituriyentlər üçün keçid balı yüksək olmalıdır. Adi universitetlərin keçid balı minimal səviyyədə saxlanılmalı, eyni zamanda ödənişli təhsil üzrə qəbul planı tədricən ləğv edilməlidir. Bu baş verdikdə, biz yüksək reytinqə və yaxşı təhsil vermək imkanlarına malik ali məktəblərimizi orada oxumağa layiq olan, bilikli tələbə kontingenti ilə təmin edə biləcəyik. Digər tərəfdən, tələb olunan balı toplamadığı üçün xaricə üz tutmağa ehtiyac qalmayacaq, ali təhsil almaq istəyən və minimal tələblərə cavab verən hər bir şəxs təhsilini vətənində adi universitetlərdə davam etdirmək imkanı qazanacaqdır.

Fəaliyyət göstəricilərindən asılı olaraq ali təhsil müəssisələri bir kateqoriyadan digərinə keçə biləcəklər.

Məlum bir faktdır ki, bugünkü dünya rəqabət dünyasıdır. Bizim uşaqlarımızın gələcək rəqibləri hazırda Çində, ABŞ-da, Çilidə və istənilən digər ölkədə böyüyür. Bu, o de-

məkdir ki, bizim təhsil sistemimiz çevik və ömürboyu öyrənmə imkanına malik kadrları formalaşdırmağı bacarmalıdır. Digər tərəfdən, maddi dəyəri olan hər bir şey uğrunda kəskin mübarizə getdiyi kimi, dünyanın lider ölkələri arasında beyin, zəka uğrunda da ciddi mübarizə gedir. Belə ki, inkişaf etmiş ölkələr öz iqtisadi qüdrətini daha da artırmaq üçün digər ölkələrdən yüksək təhsilli və ixtisaslı peşəkarların mühacirətini fəal surətdə təbliğ edir, bu məqsədlə həm birbaşa proqramlarından istifadə edir, həm də tanınmış universitetləri və transmilli korporasiyaları buna təşviq edirlər. Bizim regiondan söhbət açarkən, cəmi 2 gün bundan öncə Rusiya Federasiyasının prezidenti Federal Məclisə ünvanladığı illik müraciətində MDB ölkələrindən olan istedadlı gənclərin Rusiyanın ali təhsil müəssisələrinə qəbulunun asanlaşdırılması barədə tapşırıq vermişdir. Bu tendensiyalar ildən-ilə daha da artacaqdır. Belə vəziyyət bizim qarşımızda yaxşı təhsilalanların vətənində öz potensialını tam realizə etməsi və bununla ölkənin sosial-iqtisadi inkişafına töhfə verə bilməsini təmin edən təhsil sisteminin və təhsil mühitinin yaradılması kimi yeni vəzifəni qoyur. Ona görə də uşaqlarımızın, gənclərimizin yüksək intellektə malik hissəsi ölkəmizin gələcək elitası kimi xüsusi qayğı ilə əhatə olunmalıdır.

Növbəti tədris ilindən başlayaraq ali təhsil müəssisələri üzrə "SABAH" qruplarının, yəni savadlı, bacarıqlı və hazırlıqlı tələbələrdən ibarət qrupların təşkili üçün seçimin aparılması nəzərdə tutulur. Bu yeniliyin məqsədi xüsusi istedadı ilə seçilən və təhsildə göstəriciləri ilə fərqlənən tələbələrə yüksək keyfiyyətli təhsil almaq üçün əlverişli şəraitin yaradılmasından ibarətdir.

Dördüncü strateji istiqamət müasir tələblərə uyğun və ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılmasını nəzərdə tutur. Bu istiqamət təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyaları əsaslı təlim metodologiyasına uyğun infrastrukturun yaradılması, təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması, distant təhsil, istedadlı və xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün təhsil və inkişaf, yaşlıların təhsili, peşə-ixtisas və təhsil məsələləri üzrə məsləhət xidmətləri göstərən regional universal mərkəzlərin, müasir təminatlı peşə-tədris mərkəzlərinin və komplekslərinin qurulması, kampusların yaradılması kimi tədbirləri ehtiva edir.

Bunların arasında təhsil müəssisələrinin şəbəkəsinin rasionallaşdırılması üzərində ayrıca dayanmaq istərdim. Ali təhsil müəssisələrinin iriləşdirilməsi, bir universitetdə tələbə kontingentinin azı 10-15 minə çatdırılması təmin olunmalıdır. Rasionallaşdırma tədbirləri, eyni zamanda, ümumi təhsil pilləsində həyata keçirilməli, müəllim-şagird nisbəti tədricən iki dəfəyədək artırılmalı, məktəb müəllimlərinin həftəlik dərs yükü hazırkı 12 saatdan 18 saata qaldırılmalıdır.

Biz resurslarımızı səpələmək hesabına deyil, əksinə, onları güclü mərkəzlərdə toplamaqla qısa müddət çərçivəsində yaxşı nəticələr əldə edə bilərik.

Erkən yaşlı uşaqların məktəbəqədər təhsillə əhatə səviyyəsi əhəmiyyətli dərəcədə artırılmalı və yekunda 90 faiz səviyyəsinə çatmalıdır. Bunun üçün böyük maliyyə və pedaqoji resurslar təminatı məsələsi həll olunmalıdır. Birnövbəli və 5 günlük rejimdə fəaliyyət göstərən ümumtəhsil məktəb şəbəkəsinin yaradılması üçün yeni məktəb bina-

rının inşası təmin olunmaqla yanaşı, həmçinin mövcud infrastrukturun imkanlarından tam bəhrələnməliyik.

Bütün növ təhsil müəssisələri 100 faiz İnternetlə, "ağıllı lövhə"lər və digər müasir rəqəmsal texnologiyalarla, ümumi orta təhsil səviyyəsində isə hər bir şagirdin elektron dərsliklərlə yüklənmiş kompyuter-planşetlə təmin olunması üçün hazırlıq işləri aparılmalıdır.

Beşinci strateji istiqamət Azərbaycan Respublikasında iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartları ilə eyni səviyyəyə uyğun təhsil sisteminin maliyyələşdirilməsi modelinin qurulmasıdır. Bu istiqamət, o cümlədən müxtəlif mənbələrdən istifadə olunmaqla təhsili maliyyələşdirmə mexanizminin təkmilləşdirilməsini, təhsil müəssisələrinin adambaşına maliyyələşdirilməsinə keçidi, ödənişli təhsil xidmətlərinin göstərilməsinin dəstəklənməsini, Təhsilin İnkişafı Fondunun yaradılmasını nəzərdə tutur.

Təhsil sistemi ölkənin inkişafını müəyyənləşdirən sahə olduğundan ən prioritetli sahələr səviyyəsində maliyyələşdirilməlidir. Bunu dedikdə biz yükün altında yalnız dövlətin olduğunu başa düşməməliyik. Bu yük bütün cəmiyyət, biznes dairələri, valideynlər, ümumiyyətlə, faydagötürənlərin üzərinə düşür. Təbii ki, maliyyələşdirmə xərclərində əsas və aparıcı rolu dövlət həyata keçirir, amma beynəlxalq təcrübə göstərir ki, düzgün yanaşma sayəsində təhsil müəssisələrinin özünümaliyyələşdirmə prinsiplərinin təşviqi, ödənişli təhsil xidmətlərinin göstərilməsinin dəstəklənməsi ümumi sistemin dayanıqlığı üçün çox müsbət effekt verir.

Hörmətli qurultay iştirakçıları!

Bugünkü təhsil sistemimizin ölçülərini və əhatəsini ifadə edən bir neçə statistik rəqəm səsləndirmək istərdim. Hazırda Azərbaycan Respublikasının ümumi təhsil sistemində 4 min 513 təhsil müəssisəsi, 1 milyon 288 min şagird, 151 min 538 nəfər müəllim heyəti vardır. Ümumi müəllim-şagird nisbəti 1:8, sinifdə orta şagird sıxlığı 16 nəfər təşkil edir. Son illər ölkəmizdə müsbət demoqrafik dəyişikliklərin baş verməsi nəticəsində hər il birinci sinfə gedən şagirdlərin sayı durmadan artır, belə ki, 2013-2014-cü dərs ilində 137 mindən çox şagird ilk dəfə məktəbə qədəm qoymuşdur. Bu rəqəm növbəti illərdə daha da artacaq, ona görə də biz həm madditexniki tərəfdən, həm pedaqoji kadr təminatı baxımından onları qəbul etməyə və yaxşı təhsil verməyə hazır olmalıyıq.

İlk peşə-ixtisas təhsili pilləsində mövcud olan 108 müəssisədə 29 min 337 nəfər şagird tədris prosesinə cəlb olunub.

Orta ixtisas təhsili pilləsində 64 min 116 nəfər tələbə 59 müəssisədə təhsil alır.

44 mülki ali təhsil ocağında bakalavr səviyyəsində 136 min 682 nəfər, magistratura səviyyəsində 11 min 245 nəfər təhsil alır.

Ötən dövrdə Azərbaycan təhsili sahəsində başlanılmış islahatlar bilavasitə dövlət başçısı tərəfindən yürüdülən, ölkəmizin modernləşdirilməsinə yönəlmiş sosial-iqtisadi siyasətlə bağlı olmuşdur. Təhsil sahəsinə ayrılan büdcə vəsaitlərinin ümumi həcminin əhəmiyyətli dərəcədə yüksəlməsi nəticəsində son 10 ildə ölkəmizdə təhsil infrastrukturunun müasirləşdirilməsi istiqamətində önəmli işlər görülmüş, 2700-dən çox orta məktəb tikilmiş və ya əsaslı təmir olunmuşdur. Nəticədə 1 milyondan artıq şagirdin təlim şəraitinin yaxşılaşdırılması təmin olunmuşdur. Bu dövrdə təhsilin məzmunca yeniləşdirilmə-

sinə yönəlmiş islahatlar aparılmış, Azərbaycan təhsilinin Avropa təhsil məkanına inteqrasiyası istiqamətində əhəmiyyətli addımlar atılmışdır. Bununla yanaşı, “2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı” çərçivəsində indiyədək 2612 azərbaycanlı gənc Dövlət Neft Fondu hesabına maliyyələşdirilməklə dünyanın inkişaf etmiş ölkələrinin tanınmış universitetlərinə ali təhsil almağa göndərilmişdir. Nəzərə almaq lazımdır ki, dövlət vəsaiti hesabına xaricdə təhsil məsələsi hətta dünyanın ən zəngin dövlətləri üçün nadir hadisədir. Hesab edirik ki, müstəqil Azərbaycan üçün bu faktın özü əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulan ənənənin davamı kimi ölkə Prezidenti cənab İlham Əliyevin bu addımı ölkənin gələcəyinə yönəlmiş tarixi addım kimi dəyərləndirilməlidir.

Ötən müddətdə təhsil sisteminin informasiyalaşdırılması sahəsində də müəyyən nailiyyətlər qazanılmışdır. Belə ki, bu dövrdə təhsilin informasiyalaşdırılması sahəsində 2 Dövlət Proqramının icrası nəticəsində 2004-cü ildə hər 1063 şagirdə bir kompyuter düşdüyü halda, hazırda hər 18 şagirdə bir kompyuter nisbəti təmin olunmuş, məktəblərin 37 faizi İnternet şəbəkəsinə qoşulmuşdur.

Təhsil sistemində şəffaflığın təmin edilməsi, müasir idarəetmə modelinin tətbiqi, kadr potensialının səriştə və kompetensiya baxımından gücləndirilməsi sahəsində son yeddi ay ərzində Təhsil Nazirliyi tərəfindən bir sıra əhəmiyyətli addımlar atılmışdır. Belə addımlardan biri XI sinfi bitirən 91 mindən çox gəncin hamısına attestat almaq hüququnun verilməsi olmuşdur.

Statistik məlumatlara əsasən 2009-2010-cu dərs ilində şagirdlərin ümumi sayının 22 faizi, 2010-2011-ci dərs ilində 24 faizi, 2011-2012-ci dərs ilində 10,5 faizi attestat almamışdır. Rəqəmlərlə ifadə etsək, on minlərlə vətəndaşın sosial həyatda aktiv iştirak etmək və ya əmək fəaliyyəti ilə məşğul olmaq imkanları süni olaraq məhdudlaşdırılmışdır. Ölkə Prezidentinin tapşırığı əsasında orta məktəbləri bitirən şagirdlərin hamısına attestatın verilməsi barədə nazirliyin təklifi hökumət səviyyəsinə çıxarılmış və Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 23 may 2013-cü il tarixli qərarı ilə qanunvericilik aktlarına müvafiq dəyişikliklər edilmişdir.

Xüsusilə bir faktı da vurğulamaq istərdik ki, bu il buraxılış imtahanlarında “2” almış yüzlərlə məzun qəbul imtahanlarında uğurlu nəticələr göstərərək ali və orta ixtisas müəssisələrinə qəbul olunmuşdur. Onların arasında hətta 559 bal toplamış abituriyent də olmuşdur.

Bu bir daha nümayiş etdirir ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin təşəbbüsü ilə qəbul olunmuş qərar hər bir məzun üçün ali məktəblərə qəbul prosesində bərabər imkanların yaradılması baxımından düzgün qərar olmuşdur. Ali və orta ixtisas məktəbləri ilə yanaşı, həmin şəxslərin ilk peşə-ixtisas təhsili müəssisələrinə qəbul olunmaq şanslarının olduğunu da nəzərə alsaq, bununla həmin gənclərin sosial həyata aktiv şəkildə qoşulmaq imkanları xeyli artmışdır.

Növbəti böyük əhəmiyyətə malik tədbirimiz respublika ümumtəhsil və ilk peşə-ixtisas təhsili müəssisələrinə müəllimlərin işə qəbulu olmuşdur. Əvvəlki dövrdə müəllimlərin işə qəbulu ilə bağlı təkcə test imta-

hanları 6-7 həftə ərzində aparılırdı. Cari ildə bu proses cəmi 13 gün çəkdi. Qeyd edək ki, bu il 3286 vakant yer müsabiqəyə çıxarılmışdır. Vakant yerlərə 18782 nəfər elektron ərizə vermiş, imtahanlarda onlardan 15030 nəfər iştirak etmişdir. Müəllimlərin işə qəbulu üzrə müsabiqənin yekun nəticələrinə görə, ümumilikdə 1281 nəfər işə qəbul olunmuşdur. Əvvəlki illərdən fərqli olaraq, cari ildə müəllimlərin işə qəbulu üzrə vakant yerlərin sayı artsa da keçid balı aşağı salınmamış, işə qəbul olunacaq müəllimlərin peşəkarlıq kompetensiyalarının daha yüksək olması müsabiqənin əsas meyarı kimi götürülmüşdür.

Eyni zamanda onu da vurğulamaq istərdim ki, bu il müsabiqədən keçmiş 244 nəfər iş yerinə getməkdən imtina etmişdir. İmtina edən müəllimlərin ən çoxu rayonların ucqar ərazilərində yerləşən məktəblərin payına düşür. İş yerinə getməyənlərin 82 faizi qadınlardır. Nazirliyin apardığı sorğuya əsasən imtinaların əsas səbəbləri iş yerinin rayon mərkəzindən xeyli uzaq olması, normal yaşayış şəraitinin təmin edilməməsi, həvəsləndirmə üçün verilən vəsaitin azlığı göstərilir. Hesab edirik ki, müəllim çatışmazlığı olan kəndlərdə müəllimlər üçün yaşayış şəraitinin təmin olunması, xüsusi ipoteka rejiminin tətbiqi və digər müasir mexanizmlər təklif olunmalıdır.

Növbəti yenilik - dərs ilinin başlanmasına qədər 6 yaşı tamam olmamış xüsusi istedadı ilə seçilən uşaqların vaxtından əvvəl məktəbə qəbul üzrə yeni Qaydaların qəbulu olmuşdur. Yeni Qaydalara uyğun yaradılmış komissiyaların fəaliyyəti nəticəsində 8 min 846 nəfər uşaq bu il vaxtından əvvəl birinci sinfə qəbul olunmuşdur.

Təhsil Nazirliyi tərəfindən bu il həmçinin, ilk peşə-ixtisas təhsili müəssisələrinin infrastrukturunun inkişafına yönəlmiş və dövlət-biznes partnyorluğuna əsaslanan sosial xarakterli "Müasir Azərbaycan peşəkarları" layihəsinin icrasına başlanılmışdır. Layihə peşə təhsili sisteminin əhatə dairəsinin genişləndirilməsinə və kadr hazırlığı prosesinin keyfiyyətinin yüksəldilməsinə xidmət edir.

Bu layihə çərçivəsində müxtəlif dövlət və özəl, o cümlədən xarici tərəfdaşlarla əməkdaşlıq qurularaq bir sıra peşə məktəblərinin bazasında müasir resurs mərkəzləri yaradılmışdır.

Uğurlarımız arasında "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı" üzrə layiqli namizədlərin seçilməsi prosesini qeyd etmək istərdim. Proqramın icra olunduğu 6 il ərzində ilk dəfə namizədlərlə tam şəffaf şəkildə təhsil alacaqları dildə ali təhsil müəssisələrinin, nazirliklərin, qeyri-hökumət təşkilatlarının əməkdaşlarından ibarət tərkibdə komissiyalar müsahibələr aparmış və obyektiv seçim etmişdir. Bu il əvvəlki illərlə müqayisədə sayca ən çox tələbə - 787 nəfər xarici ölkələrin aparıcı ali məktəblərində təhsil almaq hüququ qazanmışdır.

Cari ildə təhsil sistemində dərin kök salmış neqativ hallarla mübarizə gücləndirilmişdir. Nazirliyin mərkəzi aparatında aparılmış struktur dəyişiklikləri nəticəsində Daxili nəzarət şöbəsi yaradılmış və daxil olan siqnalların birbaşa həmin şöbədə araşdırılması təmin olunmuşdur. Edilən xəbərdarlıqlara baxmayaraq, son 6 ayda ciddi nöqsanlara yol vermiş 15 təhsil müəssisəsinin rəhbəri vəzifəsindən azad edilmiş, 21 şəxs barəsində digər intizam tənbehi görülmüşdür. İki hal üzrə toplanmış materiallar araşdırılmaq üçün hü-

quq-mühafizə orqanlarına göndərilmişdir. Bundan irəli gələrək bildirirəm ki, məktəblərdə baş verən mənfi hallara qarşı Təhsil Nazirliyinin mövqeyi barışmaz olacaq, təhsil sistemində mövcud olan neqativ hallarla mübarizədə sistemli yanaşma tətbiq ediləcəkdir.

Məktəb elə bir məkandır ki, burada biz uşaqlarımızın gələcəyinin əsaslarını qoyuruq. Məktəblərdə hökm sürən psixoloji atmosfer övladlarımızın həyat yoluna, mənəvi dəyərlərinə və əqidələrinə, milli identifikasiyasına və vətəndaşlıq hisslərinə bilavasitə təsir edir. Uşaq məktəbdə necə formalaşacaqsa, elə də vətəndaş olacaq. Burada bumeranq prinsipi hökm sürür-hansı keyfiyyətlərə malik insanı biz məktəbdən buraxırıqsa, bir müddət sonra o, artıq öz keyfiyyətlərini inkişaf etdirmiş durumda qarşımıza çıxır. Bilikli, tərbiyəli uşağı hazırlayırıqsa, bir neçə ildən sonra savadlı, peşəkar və vətənini sevən gənci gördükdə onunla və haqlı olaraq özümüzlə fəxr edirik. Ya da əksinə, bisavad, mədəniyyətsiz və pis vərdişli şəxs məktəbdən buraxılırsa, bu adamın gələcəyi olmadığı üçün pis yola düşəndə, cinayətkar olaraq qarşımızı kəsəndə yalnız özümüzü günahlandırmalı oluruq.

Müəllim peşəsinə ən şərəfli peşə adı ona görə verilib ki, ölkənin və cəmiyyətin gələcəyi dövlətin başçısından və ya hökumətdən daha çox sizdən, müəllimlərdən asılıdır. Dövlətin əsası xalqdır, insanlardır, onların tam əksəriyyətinin həyatında keçdiyi yeganə sosial institut isə məktəbdir. Məktəbimiz nə qədər keyfiyyətli təhsil, müəllimlərimiz uşaqlara nə qədər yaxşı tərbiyə verə biləcəklərsə, cəmiyyətimiz və dövlətimiz o qədər güclü olacaq və daha da inkişaf edəcəkdir.

Hörmətli qurultay iştirakçıları!

Əziz müəllimlər və təhsil işçiləri!

Tarixi reallıq belədir ki, Azərbaycan son on ildə iqtisadi inkişaf tempinə görə regionda lider ölkəyə çevrilmiş, dövlətimizin iqtisadi qüdrəti möhkəmlənmiş, dünyada siyasi nüfuzu artmış, ölkə daxilində siyasi və iqtisadi sabitlik tam bərqərar olmuşdur.

Hesab edirəm ki, bu inkişafın davamlı və dayanıqlı olması, xalqımızın xoşbəxt gələcəyi, dövlətimizin daha da möhkəmlənməsi, regionda lider dövlət imicinin qorunub saxlanması naminə Azərbaycanın bütün təhsil işçiləri və ziyalıları mənim bu çağırışıma həmrəylik nümayiş etdirərək ölkəmizin iqtisadi yüksəlişi və millətimizin rifahı, dövlət başçısının qarşımızda qoyduğu ali məqsədlər, o cümlədən əzəli torpaqlarımızın düşmən tapdağından azad olunması naminə öz fəaliyyətini əsirgəməyəcəklər!

Ölkəmizdə təhsilin inkişafı bizdən, bizim fəaliyyətimizdən, üzərimizə düşən vəzifələri necə yerinə yetirməyimizdən birbaşa asılıdır. İnanıram ki, Azərbaycan təhsili özünün zəngin ənənələrinə, milli mənəvi və ümumbəşəri dəyərlərinə, beynəlxalq təcrübəyə əsaslanaraq daha da inkişaf edəcək, dünya təhsil sistemində öz layiqli yerini tutacaqdır. Bu yolda hamınıza yeni-yeni nailiyyətlər arzulayıram.

Diqqətinizə görə təşəkkür edirəm!

# AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASININ PREZİDENTİ AKİF ƏLİZADƏNİN ÇIXIŞI

Hörmətli qurultay iştirakçıları! Çox hörmətli müəllimlər!

Mən sizin hamınızı səmimiyyətlə, ürəyimin ən dərin guşələrindən gələn bir səslə salamlayır, qurultayın işinə uğurlar arzulayıram.

Mənim çıxışımın mövzusu respublikamızda elmlə təhsilin vəhdətinin zəruriliyinə həsr olunub. M.V.Lomonosovun gözəl bir sözü var. Deyir ki, akademiya elə bir qurumdur ki, o, bizim ölkəyə alimləri yaymaq üçün yaranmışdır. Universitetlər isə akademiya ilə qardaşdırlar. Amma universitet nəzdində də gimnaziyaların olması çox vacibdir. Çünki belə olmasa o, toxumsuz bir tarlaya oxşaya bilər. Bu, həqiqətdir. Çünki elmlə təhsilin vəhdəti daim olmalıdır. Azərbaycan elminin inkişafı bu vəhdətdən çox asılıdır. Bu fikirlərlə biz neçə illərdir ki, akademiyada təhsillə elmin vəhdətini yaratmağa çalışırıq. Bu sahədə ilk addımlar atmaq istəyərkən bizdə belə bir fikir yarandı ki, akademiyada magistratura açaq. Fikirləşdik ki, bu, elmimizə olduqca yardım edə bilər. Lakin bu ideya hələ reallaşmadığından elmimizin başqa bir yolla - gənc kadrların hazırlığının artırılması yolu ilə inkişafına təkan vermək qənaətinə gəldik. Sirr deyil ki, indi elmə gələn bəzi gənclərin səviyyəsi o qədər də yüksək olmur. Biz istərdik ki, onların istedadları, savadları daha yüksək olsun.

Mən özüm neçə illər universitetlərdə, Neft Akademiyasında diplom işlərinin müdafiəsində iştirak etmişəm və fikir vermişəm ki, bu işlərin bir çoxu ildən-ilə bir-birini təkrarlayır. Bunları gördükdən sonra belə qənaətə gəldim ki, biz tələbələri dəvət edib onları akademiyada, onun institutlarındakı laboratoriyalarda işlə təmin edək. Məqsədimiz bu idi ki, tələbə bilavasitə görkəmli alimin, püxtələşmiş bir elmi işçinin yanında çalışmaqla həm elmi baxımdan inkişaf etsin, həm də elmin ən qabaqcıl, ən ümdə problemlərinin həllində iştirak etsin. Biz belə fikirləşirdik ki, bu istiqamətlərin cəmlənməsi tələbələri intellektual baxımdan daha da inkişaf etdirər. Bu, gözlənilən səmərəni verdi. Sonra ikinci addımı atmalı olduq. Fikirləşdik ki, elmimizlə təhsilimizin vəhdətini təmin etmək üçün akademiyanın nəzdində baza kafedralarının yaradılması faydalı olar.

Bunu Bakı Dövlət Universitetinin, Azərbaycan Dövlət Neft Akademiyasının rektorları ilə müzakirə etdik. Onlar bu ideyaya dəstək verdilər. Buna görə mən fürsətdən istifadə edərək onlara təşəkkür edirəm. Onların dəstəyi ilə biz bu baza kafedralarını da yaratdıq. Tələbələr gəlib bu baza kafedralarında elmin ən qabaqcıl, ümdə proqramları üzrə təhsil alırlar.

Mən Prezident Administrasiyasının rəhbəri cənab Ramiz Mehdiyevin, Humanitar siyasət məsələləri şöbəsinin müdiri Fatma xanım Abdullazadənin, təhsil naziri Mikayıl Cabbarovun burada iştiraklarından istifadə edərək bir məsələyə də toxunmaq istəyirəm. Bizə belə gəlir ki, təhsil proqramlarına bir də baxılmalıdır. Bugünkü elmin ən qabaqcıl, həll edilmiş və həll edilən problemləri orada mütləq öz əksini tapmalıdır.

Məsələn, deyək ki, bizim alimlərin neftlə bağlı son elmi nailiyyətləri. Biz neft

ölkəsiyik. Təbii ki, bu sahədə elmimiz də çox geniş inkişaf etmişdir. Məsələn, hövzə modelləşməsi sahəsində aparılmış tədqiqatları buna misal göstərmək olar. Azərbaycan alimlərinin uğuru sayılan bu modelləşməyə görə yer təkinin zəruri inkişaf tarixi nə cür formalaşıbsa, biz onu kompyuter proqramı ilə bərpa edib o hövzənin inkişaf mərhələlərini müəyyən edirik. Bu haqda universitetlərin müvafiq proqramlarında məlumat çox azdır, bəlkə də heç yoxdur. Bu bizim elmimizin ən qabaqcıl sahə proqramlarından biridir. Tələbə gəlib bizim laboratoriyalarda çalışmaqla bu sahədə dərin bilik qazana bilər.

Başqa bir məsələ. İndi dünyada xeyli inkişaf etmiş elm istiqamətləri vardır. Məsələn, nanosistemlərin fizikası. Bu da fizika fakültələrinin proqramlarında öz əksini tapmalıdır. Bəlkə də tapıbdır, mən indi bunu dəqiq bilmirəm. Amma güman edirəm ki, bu yeni istiqamətlər orada əksini tapsa, bizim təhsilə xeyli kömək ola bilər.

Bir fikir də irəli sürmək istəyirəm. Baxmayaraq ki, biz akademiyada elmlə təhsilin vəhdətini yaratmağa çalışırıq, eyni zamanda universitetlərin özlərində də bu sahədə addımlar atılmalıdır. Bizcə, universitetlərdə yeni elmi istiqamətləri əhatə edən kafedraların açılması zərurətini həyat özü diktə edir. Ənənəvi kafedralarla yanaşı, belə kafedraların da olması vacibdir.

Bildiyiniz kimi, akademiya təşkil olunan zaman o, universitet təhsilindən ayrılmış, yəni burada deinteqrasiya yaranmışdır. Bir vaxtlar bu bir mərhələ kimi bəlkə də zəruri idi. Amma indi zaman dəyişib, inteqrasiya zərurəti yaranıb. Və bu gün təhsillə elmin çox böyük inteqrasiyası göz qabağındadır. Bu haqda da düşünmək lazımdır. Məktəblər, müəllimlər bunu nəzərə almalıdırlar. Gələcəyə baxan gənc istedadın məktəb vaxtından inkişafı çox vacib amillərdən biridir.

Mən müzakirə üçün bir təklif də irəli sürmək istəyirəm. Yaxşı olar ki, ümumtəhsil məktəblərində, özü də hər bir məktəbdə elm guşəsi yaradılsın və o, şagirdlər üçün maraqlı bir yerə çevrilsin. Həmin guşələrdə Azərbaycan və dünya elminin bugünkü dinamik inkişafını əks etdirən materiallar toplansın. Elmin dinamik inkişafının, elmlə təhsilin vəhdətinin bu guşələrdə kifayət qədər öz əksini tapması, güman edirəm ki, şagirdlər üçün də maraqlı olar. Onlar həmin guşələrin önünə yığışıb elmin öncül istiqamətləri ilə bağlı müzakirələr apararlar ki, bu da həmin istiqamətlərə onlarda maraq yaradar. Fikrimcə, Azərbaycanın gələcək inkişafının təmin olunması məhz bu gün məktəblərdə, universitetlərdə, akademiyalarda elmə maraq və diqqətin yaradılmasından çox asılıdır.

Hörmətli qurultay iştirakçıları!

Bilirsiniz ki, Azərbaycan Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə “Azərbaycan 2020: Gələcəyə baxış” İnkişaf Konsepsiyası təsdiq olunmuşdur. Konsepsiya 2020-ci ilədək Azərbaycan Milli Elmlər Akademiyasının da inkişaf perspektivlərini özündə əks etdirir. Güman edirəm ki, konsepsiyanın işlənilməsində, əlbəttə, təhsillə elmin vəhdəti geniş öz əksini tapmalıdır.

Çox biliyə nail olmaq üçün, püxtələşmək üçün çox oxumaq gərəkdir. Mən sizə gənclərimizi, şagirdlərimizi, tələbələrimizi öyrətməkdə sağlıq və uğurlar arzu edirəm.

Sağ olun.

# NAXÇIVAN MUXTAR RESPUBLİKASININ TƏHSİL NAZİRİ PİRİ NAĞIYEVİN ÇIXIŞI

Hörmətli qurultay nümayəndələri!

Müstəqil Azərbaycan dövlətinin qurucusu və memarı, Azərbaycan təhsilinin böyük hamisi, ümummilli lider Heydər Əliyevin xalqımız qarşısında ən böyük xidmətlərindən biri də Azərbaycan təhsilini himayə etməsi, təhsilin gələcək inkişaf yollarını müəyyənləşdirməsidir. Heydər Əliyev şəxsiyyəti olmasaydı, Azərbaycan təhsili də bugünkü səviyyəyə gəlib çata bilməzdi.

Ulu öndər Heydər Əliyevin əsasını qoyduğu ənənələr, bütövlükdə müasir təhsil siyasəti Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Azərbaycan Respublikasının bütün bölgələrində olduğu kimi, Naxçıvan Muxtar Respublikasında da ölkə Prezidentinin təhsil sahəsində müəyyənləşdirdiyi vəzifələr uğurla həyata keçirilməkdədir.

Son illər Naxçıvan Muxtar Respublikasının şəhər və kəndlərində 200-dən artıq yüksək keyfiyyətli, dünya standartlarına cavab verən, yeni avadanlıqlarla təchiz edilən, kompyuter dəstləri və elektron lövhələrlə təmin olunan təhsil müəssisəsi tikilmiş və əsaslı təmir olunaraq şagirdlərin istifadəsinə verilmişdir.

Heydər Əliyev Fondu tərəfindən də Naxçıvan Muxtar Respublikasının rayon mərkəzlərində və ucqar dağ kəndlərində, ümumilikdə 1072 şagird yerlik müasir avadanlıqlarla tam təmin olunan məktəblər tikilib istifadəyə verilmişdir.

Ölkə Prezidenti cənab İlham Əliyev Naxçıvan Muxtar Respublikasına tarixi səfərləri zamanı təhsil ocaqlarının açılışında iştirak etmiş, öz tövsiyə və tapşırıqlarını, xoş arzularını ifadə edərək demişdir: "Naxçıvanın uğurlu inkişafı məni xüsusilə sevindirir. Muxtar Respublikanın rayonlarının abadlaşması, yeni-yeni binaların tikintisi, iş yerlərinin açılması Naxçıvanı möhkəmləndirir, Naxçıvanın yaşaması üçün bütün infrastruktur layihələri həyata keçirilir".

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 21 avqust 2004-cü il tarixli sərəncamı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminatı Proqramı (2005-2007-ci illər)"na və 10 iyun 2008-ci il tarixli sərəncamı ilə təsdiq edilmiş "2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı"na uyğun olaraq muxtar respublikanın ümumtəhsil məktəblərində 542 elektron lövhə quraşdırılmış, hər 14 şagirdə bir kompyuter düşməklə 3355 kompyuter dəsti verilmiş, bu kompyuterlərin 84 faizi İnternetə qoşulmuşdur.

Naxçıvan Muxtar Respublikasının ümumtəhsil məktəblərində təhsil alan şagirdlərə 1753282 nüsxə dərslik paylanmış, ümumtəhsil məktəblərindəki kitabxanalara hədiyyə olaraq 620117 nüsxə bədii ədəbiyyat verilmişdir.

Həyata keçirilən uğurlu təhsil islahatı özünü ali məktəblərə qəbulda da qabarıq şəkildə göstərir. 2012-2013-cü tədris ilində muxtar respublikanın ümumtəhsil məktəblərini 4186 nəfər bitirmiş və onlardan 3238 nəfəri ali məktəblərə sənəd vermişdir. İmtahanda iştirak edən abituriyentlərdən 1677 nəfəri ali məktəblərə qəbul olmuşdur ki, bu da sənəd verənlərin 51,79 faizi deməkdir. Ali məktəblərə qəbul olanlardan 312 nəfəri 500-700 intervalında bal toplamışdır. Bu da ötən ilə nisbətən 45 nəfər çoxdur.

Qeyd etmək yerinə düşər ki, 2012-ci ildə ali məktəblərə qəbulda 500-600 arası bal toplayanlar 197 nəfər idisə, 2013-cü ildə bu göstərici 204 nəfər təşkil etmişdir. Ötən il

600-700 arası bal toplayan 70 nəfər idisə, bu il 108 nəfər olmuşdur. Keçən il 650-700 arası bal toplayan 17 nəfər idisə, bu il 31 nəfər təşkil etmişdir.

2012-2013-cü tədris ilində orta ixtisas məktəblərinə qəbul da yüksək səviyyədə aparılmış və ötən ilə nisbətən irəliləyişlər olmuşdur. 2012-ci ildə 382 nəfər orta ixtisas məktəblərinə daxil olmuşdusa, 2013-cü ildə 554 nəfər orta ixtisas məktəblərində oxumaq hüququ qazanmışdır.

Muxtar respublikada hərbi peşəyə maraq ildən-ilə artmaqdadır. 2013-cü ildə Heydər Əliyev adına hərbi liseyə 995 nəfər sənəd vermiş, onlardan 257 nəfəri liseyin kursantları sırasına daxil olmuşdur.

2013-cü ildə 6 nəfər məzun yüksək bal topladığına görə Prezident təqaüdünə layiq görülmüşdür.

Ötən dərs ilində muxtar respublikada təhsildə yüksək nəticələrə nail olan 20 şagirdə medal verilmişdisə, bu il medal alanların sayı 24 nəfər olmuşdur. Həmin məzunlar onlara göstərilən etimadı doğrultmuş, 3 nəfəri 550-600, 7 nəfəri 600-650, 14 nəfəri isə 650-700 intervalında nəticə göstərmişdir.

Muxtar respublikanın ümumtəhsil məktəblərində müəllim və şagirdlər üçün vahid forma tətbiq olunur. Məktəbli formasının tətbiqi tədris müəssisələrində təlim-tərbiyənin yüksəldilməsinə, şagird intizamının yüksək səviyyəyə qaldırılmasına, şagirdlər arasında olan fərqin aradan götürülməsinə müsbət təsir göstərən amillərdəndir.

Qeyd etmək yerinə düşər ki, muxtar respublikamızın ali və orta ixtisas məktəblərində də müəllim və tələbə heyəti üçün vahid forma tətbiq olunur. Bu da orta ixtisas və ali məktəblərdə tədrisin keyfiyyətinin yüksəldilməsində və tələbələr arasında intizamın gücləndirilməsində mühüm rola malikdir.

Pedaqoji kollektivlərin fəaliyyətinin qiymətləndirilməsi sahəsində həyata keçirilən tədbirlərin nəticəsidir ki, 2012-2013-cü tədris ilində keçirilmiş “Ən yaxşı ümumtəhsil məktəbi” müsabiqəsinin nəticələrinə uyğun olaraq Naxçıvan şəhər 10 nömrəli, Şərur şəhər 1 nömrəli və Ordubad şəhər 3 nömrəli tam orta məktəbləri ölkə Prezidentinin 6 avqust 2013-cü il tarixli sərəncamı ilə mükafatlandırılmışlar. Son 6 ildə muxtar respublika üzrə bu mükafata layiq görülən məktəblərin sayı 18-ə çatmışdır.

2013-cü ildə muxtar respublikamızın 5 nəfər müəllimi “Ən yaxşı müəllim” müsabiqəsinin qalibi olmuş və beləliklə də muxtar respublikamızda həmin müsabiqənin qaliblərinin sayı ümumilikdə 30-a çatmışdır.

Son 10 ildə Naxçıvan Muxtar Respublikasında təhsilin inkişafındakı xidmətlərinə görə 54 nəfərə “Azərbaycan Respublikasının əməkdar müəllimi” fəxri adı verilmiş, 52 nəfər isə “Tərəqqi” medalı ilə təltif edilmişdir. Bu dövrdə 63 nəfər qabaqcıl təhsil işçisinə “Naxçıvan Muxtar Respublikasının əməkdar müəllimi” fəxri adı verilmişdir. 30 avqust 2013-cü il tarixində isə Azərbaycan Respublikasının Prezidentinin müvafiq sərəncamı ilə təhsil işçilərinin əməkhaqları artırılmışdır. Bütün bunlar ölkə Prezidenti cənab İlham Əliyevin təhsilə göstərdiyi qayğı və diqqətin bariz nümunəsidir.

Azərbaycan təhsilində gedən keyfiyyət dəyişiklikləri və ümumtəhsil məktəblərində aparılan yeniliklər, təhsilə göstərilən ən yüksək dövlət qayğısı təhsil işçilərini ürəkdən sevindirir, onları Azərbaycan müəllimlərinin XIV qurultayında qəbul olunacaq qərarları layiqincə yerinə yetirməyə ruhlandırır.

Hörmətli qurultay nümayəndələri!

Naxçıvan Muxtar Respublikasının təhsil işçiləri bundan sonra da öz üzərlərinə düşən çətin və şərəfli işin yerinə yetirilməsində məsuliyyətlərini daha da artıracaq, vətənimizin çiçəklənməsi və Azərbaycan xalqının rifahı üçün öz layiqli töhfələrini verəcəklər.

Diqqətinizə görə sağ olun!

# AZƏRBAYCAN HƏMKARLAR İTTİFAQLARI KONFEDERASİYASININ SƏDRİ SƏTTAR MEHBALIYEVİN ÇIXIŞI

Hörmətli sədarət!

Əziz qurultay iştirakçıları!

Xanımlar və cənablar!

İlk növbədə, hər birinizi Azərbaycan müəllimlərinin XIV qurultayında salamlayır, Azərbaycanın bütün təhsil işçilərini bu münasibətlə təbrik edir, hər birinizə xoşbəxtlik və səadət arzulayıram!

Hörmətli qurultay iştirakçıları!

Sirr deyildir ki, müasir dünyada hər bir ölkənin uğurlu gələcəyi təhsilin səviyyəsi ilə müəyyən olunur. Azərbaycan Respublikasının inkişafında təhsil mühüm yer tutur. Bu, ilk növbədə, ölkə rəhbərinin təhsilin inkişafına verdiyi önəmin, bu sahəyə diqqət və qayğısının real nəticəsidir. Azərbaycanda təhsilin inkişafı, gənclərimizin sağlam və savadlı böyüməsi dövlət siyasətinin prioritet istiqamətini təşkil edir.

Bilirsiniz ki, ümummilli lider Heydər Əliyevin siyasi kursunun mühüm istiqamətlərindən biri təhsilin qayğı ilə əhatə olunması, bu sahədə əldə olunmuş nailiyyətlərin qorunub saxlanması və inkişaf etdirilməsi idi. “Cəmiyyət təhsilsiz inkişaf edə bilməz” deyən Heydər Əliyev Azərbaycanın gələcəyinin təhsilin bugünkü vəziyyətindən asılı olduğunu dönə-dönə vurğulayır və işinin çoxluğuna baxmayaraq, müəllimlərlə, gənclərlə, məktəblilərlə tez-tez görüşür, onların uğurlarına sevinirdi. Təhsil sahəsinin inkişafı, müəllimlərin sosial vəziyyətinin yaxşılaşdırılması, cəmiyyətdə müəllim nüfuzunun daha da artırılması ulu öndərin həyata keçirdiyi dövlət siyasətinin mühüm sahələrindən biri idi.

Heydər Əliyev öz müəllimini xatırlayaraq deyirdi: “Mən yer üzündə müəllimdən yüksək ad tanımıram. Məhz müəllim doğma yurdumuzu sevməyi, hamının rifahı naminə vicdanla işləməyi müdrikliklə və səbirlə bizə öyrətmiş və öyrədir. Hər birimizin öz müəllimi vardır və biz bütün ömrümüz boyu onun xatirəsini hörmətlə, minnətdarlıqla qəlbimizdə yaşadırıq”. Heydər Əliyevin təhsil işçilərinə qarşı qəlbində bəslədiyi ülvi hislərin nəticəsi idi ki, onun hakimiyyəti illərində, hətta ölkənin iqtisadi durumu nisbətən ağır olan vaxtlarda da dövlət büdcəsindən təhsilə ayrılan vəsait heç vaxt azaldılmamış, əksinə, bu sahəyə ayırmaların miqdarı müntəzəm surətdə artmışdır.

Təhsilin inkişafı ulu öndərin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin daim diqqət mərkəzində olmuş və onun siyasətində əsas prioritet istiqamətlərdən biridir.

Bu gün əminliklə demək olar ki, strateji sahə olan təhsil cəmiyyətin bütün sahələrinə nüfuz etmiş, dünya təhsil sisteminə inteqrasiyası sahəsində yeni uğurlar əldə etmişdir. Cənab Prezident ölkəyə rəhbərliyinin ilk illərindən başlayaraq təhsilin keyfiyyətinin yüksəldilməsi, müasir informasiya və kommunikasiya texnologiyalarının təhsil sisteminə tətbiqi, bu sahədə çalışan işçilərin sosial müdafiəsinin təmin edilməsi, tələbə və aspirantların sosial və maddi durumunun yaxşılaşdırılması və s. istiqamətlərdə əhəmiyyətli fərman və sərəncamlara imza atmışdır.

Azərbaycan təhsilinin sürətli inkişaf yolu keçərək hazırkı səviyyəyə çatmasında Heydər Əliyev Fondu və şəxsən Fondun

prezidenti, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın da böyük əməyi vardır.

Azərbaycanda yeni-yeni məktəb binaları tikilir, köhnə məktəb binaları əsaslı təmir edilir, laboratoriyalar, emalatxanalarla təchiz edilir. Təhsil müəssisələrinin maddi-texniki bazası möhkəmləndirilir, Azərbaycan Respublikasının dövlət büdcəsindən təhsilə ayrılan vəsaitin həcmi də ilbəil artırılır. Müəllim əməyinin qiymətləndirilməsi, onların sosial durumunun yaxşılaşdırılmasına yönəlmiş addımlar atılır.

Bir neçə ay öncə biz ölkə başçısının müəllim əməyinin qiymətləndirilməsinə yönəlmiş daha bir addımının şahidi olduq. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 30 avqust 2013-cü il tarixində imzaladığı sərəncamla təhsil işçilərinin əməkhaqları, eləcə də doktorantların, ali, orta ixtisas və peşə təhsili müəssisələrində təhsil alan tələbə və şagirdlərin təqaüdləri növbəti dəfə artırıldı. Hesab edirəm ki, ölkə başçısının bu sərəncamları təhsil işçilərinin həyat səviyyəsinin artırılmasına, ali və orta ixtisas təhsili müəssisələrində təhsil alan tələbələrin sosial problemlərinin aradan qaldırılmasına töhfə olacaqdır.

Ölkəmiz üçün savadlı və bacarıqlı kadrların hazırlanması məsələsi də diqqətdən kənarda qalmır, vaxtaşırı olaraq tələbə və aspirantların təqaüdləri artırılır, gənclərin xarici ölkələrdə təhsil imkanları daha da genişləndirilir. Təsadüfi deyildir ki, hazırda "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı"na əsasən 2600-dən çox Azərbaycan gənci dünyanın inkişaf etmiş ölkələrinin aparıcı ali təhsil müəssisələrində dövlət hesabına təhsil alır, onların bütün xərcləri dövlətimiz tərəfindən ödənilir. Bu gənclərin gələcəkdə layiqli vətəndaş kimi yetişərək ölkəmizin inkişafına xidmət etmələri üçün hər cür şərait yaradılır.

Hörmətli qurultay nümayəndələri!

Azərbaycanda təhsil siyasətini həyata keçirən dövlət orqanı Azərbaycan Respublikasının Təhsil Nazirliyidir. Hesab edirik ki, bu dövlət qurumu uğurlu fəaliyyəti ilə seçilir və üzərinə düşən vəzifələri layiqincə icra edir. Lakin bu, o demək deyildir ki, digər qurumlar, ictimai təşkilatlar bu sahənin inkişafına kömək göstərməməlidir. Bu sahənin inkişafına hər birimiz öz töhfələrimizi verməliyik. Biz Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı olaraq bu prinsipi fəaliyyətimizdə əsas istiqamət elan etmişik.

Hörmətli qurultay iştirakçıları!

Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqının fəaliyyətinin əsas istiqamətləri təhsil sahəsində oxuyan və işləyən ittifaq üzvlərinin əmək, sosial, iqtisadi hüquqlarının və qanuni mənafelərinin müdafiəsi, işəgötürənlə əməkdaşlıq çərçivəsində ittifaq üzvlərinin mənafelərini təmsil etməsi, kollektiv danışıqların aparılması, kollektiv müqavilələrin, sazişlərin bağlanması və onların yerinə yetirilməsinə nəzarətin həyata keçirilməsidir.

Eyni zamanda ittifaq üzvlərinin, onların ailə üzvlərinin sağlamlığına qayğı göstərilməsinə, onların pensiya təminatının, sanatoriya, kurort müalicəsinin və istirahətlərinin təşkil edilməsinə, bədən tərbiyəsi və idmanın inkişaf etdirilməsinə, əməyin mühafizəsinə, ətraf mühitə, sağlamlığa mənfi təsir göstərən faktorların aradan qaldırılmasına, üzvlərin sağlam və təhlükəsiz iş şəraiti ilə təmin edilməsinə ittifaq ciddi nəzarət edir. Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı yuxarıda qeyd olunan istiqamətlər üzrə qarşısında duran vəzifələrin uğurla həyata keçirilməsinə çalışır.

Hörmətli nümayəndələr!

Öz növbəsində Azərbaycan Respubli-

kasının Təhsil Nazirliyi və onun yerli strukturları həmkarlar ittifaqı təşkilatları ilə sosial partnyorluq və mövcud qanunlar əsasında əməkdaşlıq edir. Təhsil Nazirliyi təhsil işçilərinin əmək, sosial, iqtisadi hüquqları və qanuni mənafelərinin müdafiəsi ilə bağlı həmkarlar ittifaqı təşkilatları tərəfindən həyata keçirilən tədbirlərdə ən yaxın tərəfdaşlarımızdan biridir.

Nəzərinizə çatdırım ki, 1992-ci ildən başlayaraq Azərbaycan Respublikasının Nazirlər Kabineti ilə Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyası arasında Baş Kollektiv Saziş bağlanır. 2001-ci ildən Baş Kollektiv Sazişin hazırlanmasında və bağlanmasında Azərbaycan Respublikasının Sahibkarlar Təşkilatları Milli Konfederasiyası da iştirak edir.

Tərəflər sazişdə mövcud qanunvericiliyə əsaslanaraq sosial-iqtisadi siyasəti və sosial-əmək münasibətləri üzrə razılaşdırılmış mövqelərini və birgə fəaliyyətlərini müəyyən edirlər. Saziş ölkə iqtisadiyyatının daha da gücləndirilməsinə, rəqabət qabiliyyətinin artırılmasına, əmək bazarının səmərəli inkişafına, təhlükəsiz iş şəraitinin yaradılmasına, sosial stabilliyin qorunub-saxlanmasına və əhalinin sosial müdafiəsinin təmin edilməsinə istiqamətlənir.

Bildiyiniz kimi, Baş Kollektiv Saziş əsasında 1998-ci ildən başlayaraq Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsi ilə Təhsil Nazirliyi arasında Kollektiv Saziş, rayon həmkarlar ittifaqı komitələrinin və onların xidmətlərində olan ilk həmkarlar ittifaqları təşkilatları ilə müvafiq təhsil müəssisələri rəhbərləri arasında isə kollektiv müqavilələr bağlanır.

Bu il iyulun 10-da biz Təhsil Nazirliyi ilə növbəti 2013-2015-ci illər üçün Kollektiv Saziş imzaladıq. Sənəd təhsil işçilərinin və təhsilalanların sosial hüquqlarının müdafiəsi ilə bağlı bir çox vacib məqamları özündə əks etdirir. Biz həmkarlar təşkilatları olaraq bu sənəddə öz əksini tapan müddəaların yerinə yetirilməsinə bilavasitə nəzarət edir, həmçinin öz öhdəliklərimizi yerinə yetirməyə çalışırıq. Kollektiv Sazişdə üzərimizə götürdüyümüz öhdəliklərdən biri də ittifaq üzvlərinin və onların ailə üzvlərinin müalicə və istirahətlərinin təşkili ilə bağlıdır.

Biz hər il minlərlə təhsil işçisi və onların ailə üzvlərinin müalicə və istirahətini təmin edirik. İttifaq üzvlərinin ehtiyacını nəzərə alaraq büdcəmiz hesabına əlavə yollayışlar alaraq hər il daha çox sayda təhsil işçisinin müalicə və istirahətini təşkil edirik. Bu sahədə daha çox müsbət nəticə əldə etmək üçün əlavə kompleks tədbirlər də həyata keçiririk.

Bilirsiniz ki, ATİAHİ Respublika Komitəsi öz üzvlərinin istirahətini daha yaxşı təşkil etmək məqsədi ilə Nabran istirahət zonasında 5,8 hektar torpaq sahəsi almış və 2008-ci ildən başlayaraq "Təhsil" istirahət kompleksinin tikintisinə başlamışdır. Bu ilin 1 iyul tarixində biz istirahət kompleksinin rəsmi açılış mərasimini keçirdik. Sizi əmin etmək istəyirəm ki, ATİAHİ ittifaq üzvlərinin əmək, sosial, iqtisadi hüquqlarının və qanuni mənafelərinin müdafiəsi ilə əlaqədar üzərinə götürdüyü öhdəliklərin yerinə yetirilməsi ilə bağlı fəaliyyətini bundan sonra da davam etdirəcək və təhsilimizin inkişafına öz töhfələrini verən pedaqoji ictimaiyyətin, təhsil sahəsində çalışan insanların qayğısına qalacaqdır.

Hörmətli qurultay iştirakçıları!

Mən sonda bir daha müqəddəs peşə sahibi olan müəllimlərimizi təbrik edir, onlara uzun ömür və qurultayın işinə uğurlar arzulayıram.

Diqqətinizə görə təşəkkür edirəm!

# TƏLƏBƏ QƏBULU ÜZRƏ DÖVLƏT KOMİSSİYASININ SƏDRİ MƏLEYKƏ ABBASZADƏNİN ÇIXIŞI

Hörmətli qurultay iştirakçıları, dəyərli qonaqlar, əziz müəllimlər!

Sizi Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının kollektivi adından və şəxsən öz adımdan salamlayıram. Bu gün sizin qarşınızda çıxış etməkdən, sizin fikirlərinizi dinləməkdən böyük sevinc və şərəf hissi duyaraq, sizə gənc nəslin tərbiyəsi və təhsilinə həsr etdiyiniz nəcib və fədakar işinizdə yeni-yeni uğurlar arzulayıram.

Möhtərəm Prezidentimiz İlham Əliyev demişdir: “Təhsil bizim gələcəyimizdir. Təhsilin səviyyəsi ölkəmizin perspektivlərini müəyyən edəcəkdir. Biz çalışırıq ki, Azərbaycanda bu sahəyə daim diqqət göstərilsin, praktiki tədbirlər görülsün, həm təhsil sisteminin maddi-texniki bazası güclənsin, eyni zamanda və ən önəmlisi, təhsilin keyfiyyəti artsın. Həm orta, həm də ali məktəblərdə bu proses ardıcıllıqla, vahid sistem şəklində aparılmalıdır”. Bu fikirlərdə həm müasir mərhələdə təhsil sahəsində görülən işlər, həm də perspektiv vəzifələrimiz aydın şəkildə göstərilib.

Hazırda, XXI əsrin öz tələblərini irəli sürdüyü dövrdə yeni texnologiyaların cəmiyyətin bütün sahələrini, eləcə də gündəlik həyatımızı dəyişdiyinin şahidi oluruq. Hər bir mütərəqqi cəmiyyətin əsasında biliklərin, qeyri-maddi dəyərlərin istehsalı və biliklərin mübadiləsi durur. Bununla əlaqədar, YUNESKO XXI əsr təhsilinə həsr olunmuş Beynəlxalq Komissiya yaratmışdır. Bu komissiya müasir dövrün problemlərinin həlli yolu kimi məhz ömürboyu (fasiləsiz) təhsili görür.

Beynəlxalq elmi dairələr isə XXI əsrdə öyrənilməsi vacib olan aşağıdakı bacarıqları ön plana gətirirlər:

- Mürəkkəb problemlərə adekvat cavab vermə
- Effektiv ünsiyyət qura bilmə
- Məlumatı dinamik idarəetmə
- Komandada işləmə və problemlərin həllini tapma
- Texnologiyalardan effektiv istifadə etmə
- Davamlı olaraq yeni bilik yaratma

Oktyabr ayında möhtərəm Prezident cənab İlham Əliyevin Sərəncamı ilə çox mühüm bir sənəd - “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” təsdiq edildi. Sənəddə təhsilin inkişafı üzrə müəyyən edilmiş 5 əsas istiqamət beynəlxalq aləmdə qəbul edilmiş yuxarıda qeyd etdiyim əsas pinsiplərlə tam uyğunluq təşkil edir. Şübhəsiz ki, Strategiyada ölkəmizin reallıqları və xüsusiyyətləri də nəzərə alınmışdır. Strategiya ölkəmizdə biliklərə əsaslanan cəmiyyətin qurulması üçün çox ciddi siyasi sənəddir.

Biliklərə əsaslanan cəmiyyətdə əsas istehsal qüvvəsi müəllimlərdir. Ona görə də müəllimlərin qarşısında çox önəmli məqsəd və tələblər qoyan Strategiya, ilk növbədə, məhz pedaqoji ictimaiyyət tərəfindən öyrənilməli və dərk edilməlidir. Sabah gələcək nəsildən gözlədiyimiz nəticələri, bilik və bacarıqları, kompetensiyaları bu gün cəmiyyətimiz müəllimin qarşısında tələb kimi qoyur. Müəllim daim zamanın nəbzini tutmaq üçün öz üzərində ömürboyu çalışmalıdır.

Fikrimcə, müəllim olmaq üçün insanın, ilk növbədə, zamanın çağırışlarına cavab verən bilikləri, qəlbən peşəsinə bağlılığı və ali vətəndaş mövqeyi olmalıdır.

Məlum olduğu kimi, biliyin qiymətləndirilməsi təhsil prosesinin ayrılmaz bir hissəsidir. Təhsil sahəsində yeniliklər baş verdikcə, qiymətləndirmə özü də xeyli dəyişikliyə məruz qalır. Bu dəyişiklik, ilk növbədə, qiymətləndirmənin məzmun və ya məqsədini ayrı-ayrı bilik və bacarıqlardan bütöv səriştə və qabiliyyətlərə - kompetensiyalara doğru yönəltmişdir. XXI əsrin bacarıqlarını qiymətləndirmək daha çətindir, ancaq eyni zamanda, zəruridir.

Tələbə Qəbulu üzrə Dövlət Komissiyası qiymətləndirmə sahəsində 20 illik təcrübəyə malik olan qurum kimi bu sahədə dünyada gedən yenilikləri izləyir, onları Azərbaycanda tətbiq etmək imkanlarını öyrənir, bu istiqamətdə müxtəlif elmi-pedaqoji araşdırmalar aparır. Bu işdə yüzlərlə orta və ali məktəb müəllimi, Milli Elmlər Akademiyasının əməkdaşları ekspert qismində yaxından iştirak edirlər. Məsələnin vacibliyini nəzərə alaraq, hesab edirik ki, müasir qiymətləndirmə nəzəriyyəsi üzrə dərslər pedaqoji kadrları hazırlayan ali təhsil müəssisələrinin bakalavriat səviyyəsində tədris proqramlarına daxil edilməlidir.

Digər təklifimiz Strategiyanın həyata keçirilməsi üzrə proqramların, "yol xəritəsi"nin tərtib edilməsi zamanı regionlar üzrə fərdi yanaşmanın tətbiq edilməsi ilə bağlıdır. Strategiyada hər bir təhsilalana fərdi yanaşma prinsipi əks olunmuşdur. Buna nail olmaq üçün ardıcıl olaraq əvvəl ölkə daxilində mərkəzdən hər bir regiona, sonra hər region daxilində hər məktəbə, sinfə və nəhayət, şagirdə fərdi yanaşma prinsipi tətbiq edilməlidir. Bunun həyata keçirilməsi üçün TQDK-nın məlumat bazalarında 20 il ərzində hər bir regiona, məktəbə dair toplanılmış ölçmə materiallarının istifadə olunması vacibdir. Belə ki, hər bir regionun əldə edəcəyi nəticə ölkə üzrə orta statistik göstəricilərlə yanaşı, onun özünün başlanğıc göstəriciləri ilə müqayisə olunmalı, beləliklə də inkişaf dinamikası müşahidə edilməlidir. Pedaqoji kollektivin fəaliyyətinə qiymət vermək üçün onun işlədiyi şagird auditoriyası nəzərə alınmalıdır və s. Bu yanaşma "Mənim məktəbim" portalında artıq tətbiq edilmişdir. Bildiyiniz kimi, "Mənim məktəbim" portalı məktəb məzunlarının 1994-cü ildən başlayaraq qəbul və son iki il üzrə buraxılış imtahanlarında göstərdikləri nəticələrin tarixini əks etdirən portaldır. Buradakı məlumatlar məktəbin fəaliyyətinin qiymətləndirilməsinin tərkib hissəsi kimi qəbul edilə bilər.

Təbii ki, Strategiyanın həyata keçirilməsi istiqamətində çox böyük işlər görülməlidir. Mən inanıram ki, Strategiyada əks olunmuş hədəflərin gerçəklənməsi yolunda bütün cəmiyyətimizin qüvvələri səfərbər olunacaq və biz ömürboyu təhsil almaq imkanından istifadə edərək əsl biliklərə yiyələnən, öz şəxsi taleyi ilə yanaşı, xalqının, ölkəsinin taleyi üçün məsuliyyət daşıyan gənc nəsil yetişdirəcəyik.

Diqqətinizə görə minnətdaram.

# BAKI ALİ NEFT MƏKTƏBİNİN PROREKTORU, PROFESSOR RAMİZ HÜMBƏTOVUN ÇIXIŞI

Hörmətli qurultay iştirakçıları!

Ölkəmizin təhsil işçiləri və müəllimlər ordusunun nüfuzlu qurultayında Bakı Ali Neft Məktəbinin kollektivi adından sizləri salamlamaqdan və fikirlərimi bölüşməkdən şərəf duyuram.

Təhsil sistemi ölkəmizin aparıcı qüvvəsi olaraq Azərbaycanın iqtisadiyyatının bütün sahələrinin uğurlu fəaliyyətinin təminatı üçün kadr hazırlayan, onların keçmişdəki və bugünkü nailiyyətlərində və gələcək inkişafında əvəzsiz rol oynayan sahədir.

Təhsil məkanındakı yeni ab-hava və təhsilin inkişafı üzrə Dövlət Strategiyasının təsdiq edilməsi Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin təhsil sisteminin inkişafına göstərdiyi diqqət və qayğının təzahürü olaraq hər bir təhsil işçisinin qarşısına yeni məsul vəzifələr qoymuşdur.

Ötən əsrin 70-80-ci illərində ümummilli liderimiz Heydər Əliyevin təşəbbüsləri nəticəsində çoxsaylı təhsil müəssisələrinin yaradılması, yeni ixtisaslar üzrə mütəxəssis hazırlığının həyata keçirilməsi, unikal ixtisaslar üzrə digər respublikaların aparıcı təhsil mərkəzlərində mütəxəssis hazırlığının təşkili, Ümumittifaq statuslu ixtisasartırma və yenidənhazırlanma institutlarının fəaliyyəti Azərbaycanı dünyanın bir çox ölkələri üçün yüksək ixtisaslı mütəxəssislər hazırlayan bir məkana çevirmişdir.

Həmin layihələr çərçivəsində o vaxt təhsil almış gənclərin mütləq əksəriyyəti hazırda ölkə iqtisadiyyatının aparıcı qüvvələridirlər. Təəssüflər olsun ki, müstəqillik illərinin əvvəllərində həm obyektiv, həm də subyektiv səbəblərdən ali təhsil sahəsində əldə edilmiş uğurlar kifayət dərəcədə inkişaf etdirilməmişdir.

Müstəqil Azərbaycanın ali təhsil sisteminin Avropa təhsil məkanına inteqrasiya yolunda Bolonya prosesinə qoşulması, beynəlxalq təhsil qurumları ilə ildən-ilə genişlənən əlaqələr, kredit sisteminin tətbiqi, mütəxəssis hazırlığı aparılan ixtisasların siyahısının YUNESKO-nun standartlarına uyğunlaşdırılması, çoxballı qiymətləndirmə sisteminə, çoxpilləli təhsilə keçid, infrastrukturun əsaslı şəkildə yenilənməsi, yeni maliyyələşmə mexanizminin tətbiqi, təəssüflər olsun ki, əsas məqsəd olan təhsilin keyfiyyətini beynəlxalq səviyyəyə gətirib çıxarmamışdır. Ona görə də işəgötürənlər ali təhsil müəssisələrinin məzunlarını ya tələblərə cavab vermədiklərinə görə işə götürmür, yaxud da əlavə xərc çəkərək onlara yeni biliklər verməyə məcbur olurlar.

İşəgötürənlərin əmək bazarında mütəxəssislərin bilik və təcrübəsinə ildən-ilə artan tələbatları kadrlara ehtiyacın ödənilməsi üçün ali təhsil sisteminə yeniliklərin gətirilməsi zərurəti yaratdığından ölkə Prezidentinin fərmanları əsasında yeni ali təhsil müəssisələrinin - Azərbaycan Diplomatik Akademiyasının, M.Lomonosov adına Moskva Dövlət Universitetinin Bakı filialının, İnformasiya Texnologiyaları Universitetinin və s. yaradılması cəmiyyətdə rəğbətlə qarşılanmışdır.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 29 noyabr 2011-ci il tarixli Fərmanı ilə artıq transmilli şirkətə çevrilmiş və ingilis dilində təhsil almış mütəxəssislərə böyük ehtiyacı olan Dövlət Neft Şir-

kətinin strukturunda yeni, müasir tipli Bakı Ali Neft Məktəbinin yaradılması bu prosesin məntiqi davamıdır. Bu cür qərarlar mütəxəssis hazırlığında sağlam rəqabətin bərqərar olmasına, abituriyentlər üçün isə ən keyfiyyətli təhsil imkanı təklif edən ali məktəbləri seçməyə imkan yaradır. Bakı Ali Neft Məktəbinin quruculuğu prosesində dünyanın aparıcı elm və təhsil mərkəzlərinin təcrübəsi öyrənilərək keyfiyyətli mühəndis kadrları hazırlığının təmin edilməsi üçün vacib olan 6 əsas komponent- yüksək potensiallı professor-müəllim heyəti, mütərəqqi tədris proqramları, yüksək hazırlıqlı orta məktəb məzunları - tələbələr, tədris prosesinin istehsalatla sıx əlaqəsinin təmin olunması, tədrisin müasir informasiya resursları ilə təmin edilməsi və ən müasir tələblərə cavab verən maddi-texniki baza əsas götürülmüşdür. Hazırda Bibiheybətdə Bakı Ali Neft Məktəbi üçün kampus tikilir və orada da bu komponentlərin özünə yer tapması ilə bağlı iş aparılır.

Qısa zaman kəsiyində Bakı Ali Neft Məktəbində müasir tələblərə cavab verən infrastruktur yaradılmış, professor-müəllim və idarəetmə heyəti formalaşdırılmış, Böyük Britaniyanın dünyada tanınmış Heriot-Vatt Universiteti (HVU) ilə tədris proqramlarının tətbiqi ilə bağlı müqavilə imzalanmış, genişmiqyaslı tanıtım aksiyaları nəticəsində 2012-ci ildə “Neft-qaz mühəndisliyi”, “Kimya mühəndisliyi” ixtisaslarına, 2013-cü ildə isə həmin ixtisaslara və əlavə olaraq “Proseslərin avtomatlaşdırılması mühəndisliyi” ixtisasına tələbə qəbulu həyata keçirilmiş, 2012-ci ildə orta bal 631, Prezident təqaüdçülərinin sayı 11, 2013-cü ildə isə müvafiq olaraq, 656 və 15 olmuş, bu göstəricilərə görə BANM Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının tərtib etdiyi reytinq cədvəlində mütləq lider olmuşdur.

Tədrisin təşkilində, tədris texnologiyalarının tətbiqində, tələbə-müəllim münasibətlərinin tənzimlənməsində, biliklərin qiymətləndirilməsi prosesində şəffaflığın və obyektivliyin təmin edilməsində, müəllimlərin və tədris proqramlarının seçimində, tədrisin istehsalatla əlaqəsinin möhkəmləndirilməsində, çoxsaylı transmilli şirkətlərlə və aparıcı ölkələrin təhsil mərkəzləri ilə əlaqələrin qurulmasında, mühəndislik fəaliyyətinin təbliğində, tələbələrin yerli gənclər və beynəlxalq mühəndislik cəmiyyətlərinin fəaliyyətinə qoşulmasında ən mütərəqqi yanaşmalar həyata keçirilmiş, ali məktəbdə sağlam və səmərəli təhsil mühiti yaradılmış, əldə edilmiş nəticələr və onların ictimaiyyət arasında yayılması Bakı Ali Neft Məktəbinə cəmiyyətdə böyük nüfuz qazandırmış, abituriyentlər üçün cəlbedici etmişdir.

Tədris prosesi istehsalatla sıx əlaqədədir, tələbələr həm semestr boyu, həm də tətillərdən qabaq mütləq ARDNŞ-ın Heydər Əliyev adına Bakı Neft Emalı Zavodunda və digər müəssisələrdə tərcübə keçirlər. Bu məqsədlə BANM ARDNŞ-ın və AMEA-nın bir sıra müəssisə və təşkilatları ilə, eləcə də “BP”, “Total”, “Statoil” şirkətləri, “Microsoft”, “British Council” təşkilatları ilə müqavilələr bağlamışdır. “Hallburton”, “KCA Deutag”, “Schlumberger” və “Emersonprocessmanagement” şirkətləri ilə danışıqlar yekunlaşmaq üzrədir.

Ali məktəbimizdə rektorluqla professor-müəllim heyəti, idarəetmə qurumları, tələbələr və valideynlər arasında sıx və işgüzar münasibətlərin uğurlarımızda əhəmiyyətini qeyd etmək istərdim. Hər bir tələbə, müəllim, işçi və valideyn üçün rəhbərlik həmişə açıqdır. Xüsusi psixoloji xidmət və sosioloji sorğular vasitəsilə bu münasibətlər daim tənzimlənir.

Bütün bu işlərin nəticəsi kimi məzunlarımıza BANM-in və Heriot-Vatt Universitetinin diplomlarının veriləcəyini də qeyd

etmək istərdim.

Bu yaxınlarda qəbul edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" və Təhsil Nazirliyinin fəaliyyətində nəzərəçarpan dinamika ölkəmizin ali təhsil sisteminin fəaliyyətini mükəmməlləşdirmək üçün bizə unikal bir şans vermişdir. Əsaslı şəkildə işlənmiş bu sənədin tələblərinin bir qismi ilə bağlı fikirlərimi bölüşmək istərdim.

Tədris proqramlarının yaradılması və tətbiqi işlərində uzun müddət bərqərar olmuş konservativ yanaşma əmək bazarının mütəxəssislərə ildən-ilə dəyişən ehtiyaclarını nəzərə almadığından hazırlanan kadr potensialından səmərəli istifadə olunmur. Ona görə də tədris proqramlarının işlənməsi prosesi işəgötürən müəssisələrin inkişafı və bu inkişafın tempi ilə uzlaşmalıdır.

Digər bir yanaşma isə tədris proqramlarının ekspertizası üçün heç bir dövlət qurumunun tərkibində olmayan müstəqil ekspert qrupunun yaradılması və onların işinə təhsil sahəsində beynəlxalq ekspertlərin cəlb olunmasıdır.

Ali məktəblər arasında tədris proqramlarının qarşılıqlı tətbiqi həm tələbələr, həm də müəllimlər üçün mobilliyi təmin edə bilər.

Mütəxəssis hazırlığı ixtisaslarının sərt şəkildə bir siyahıda təsdiq olunması proqramların tətbiqində çevikliyi təmin etməyə imkan vermir. Proqramların qəbulu və tətbiqi işində bürokratik sənədləşdirmə mövcuddur, halbuki, məsələn, bizim partnyor olduğumuz HVU-ndə əsas sənədlər senatın (Elmi Şuranın) təsdiq etdiyi semestr üzrə dərslərin siyahısı (kreditləri göstərməklə), fənlərin məzmunu və dərs cədvəlləridir.

Ali təhsil müəssisələrində xarici dillərin tədrisinin mükəmməlləşdirilməsi həddindən artıq vacib olan məsələdir. Çünki xarici dilləri bilən həm tələbə, həm də müəllim dünyanın bütün informasiya resurslarından bilik əldə etmək, beynəlxalq elm və təhsilyönümlü layihələrə qoşulmaq, müasir tədris texnologiyalarını tez və asanlıqla mənimsəmək imkanı əldə edir. Məsələn, Bakı Ali Neft Məktəbində 1-ci kursda hazırlıq mərhələsində oxuyan tələbələrdən hər biri ingilis dilindən IELTS tələbləri ilə minimum 6.0 bal toplayaraq, bakalavriatda ixtisas təhsilinə başlayırlar.

Ali təhsil müəssisələri statuslarına görə tədrisi elmi fəaliyyətlə vəhdətdə həyata keçirməlidirlər. Lakin ildən-ilə maddi-texniki bazası inkişaf etməyən, ştatlarında cəmi bir neçə aşağı və orta səviyyəli elmi dərəcəsiz mütəxəssislər olan karlik-laboratoriyalardan yüksək nəticələr gözləmək əbəsdir. Hesab edirəm ki, bu vəziyyətdən çıxış yollarından biri elmi-tədqiqat işlərinin müsabiqə əsasında qrantlar vasitəsilə həyata keçirilməsidir.

Elmi-tədqiqat işlərinin səmərəliliyinin və məqsədyönümlüyünün artırılmasının yollarından biri də qabaqcıl ölkələrdə geniş təşəkkül tapmış və ali məktəblərin nəzdində azad iqtisadi zona statusunda fəaliyyət göstərən elmi texnoparklardır.

Ali məktəblərin elmi potensialını artırmaq üçün daha bir yol onlara qısa zaman kəsiyində xarici ölkələrin aparıcı elm və tədris mərkəzlərində magistr hazırlığını həyata keçirmək imkanı vermək və daha sonra doktorantura təhsili hesabına professor-müəllim heyətinin potensialını artırmaqdır. Mövcud vəziyyəti nəzərə alaraq xarici ölkələrdə staj-keçmə, ixtisasartırma və yenidənhazırlanma kurslarında istər müəllimlərin, istərsə də elmi işçilərin təhsilinin təşkili çox vacibdir. Bununla paralel olaraq mərhələ-mərhələ ölkədə ixtisaslaşdırılmış (məqsədli) treninq mərkəzlərinin yaradılması, müasir avadanlıqla təchiz edilməsi və xaricdən dəvət olunmuş mütəxəssislər tərəfindən yeni texnolo-

giyaların tədrisinin təşkili fayda verə bilər.

Hesab edirəm ki, ali məktəbin reytinqini müəyyən edərkən orada məzunlarla hansı real işin aparılması və məzunların işlə təmin olunması dərəcəsi mütləq nəzərə alınmalıdır. Bunu Təhsil Nazirliyində məzunların vahid verilənlər bazasının yaradılması ilə qiymətləndirmək və reytinqdə nəzərə almaq olar.

Ayrıca olaraq özəl yerli və transmilli şirkətlərin mütəxəssis hazırlığında iştirakı məsələsinə toxunmaq istərdim. Hazırda yüzlərlə bu cür şirkət ali məktəblərə heç bir vəsait ödəmədən ali təhsil müəssisələrinin məzunlarını işə götürür və onların bilik və təcrübəsindən bəhrələnir. Bir sıra ölkələrdə, o cümlədən Rusiya Federasiyasında universitetlər öz məzunlarını belə şirkətlərə, sözün əsl mənasında, satırlar.

Kiçik özəl müəssisələrdən mütəxəssis hazırlığına maliyyə dəstəyi gözləmək faydasızdır. Lakin iri şirkətlər universitetlərin fəaliyyətinə uzunmüddətli maliyyə dəstəyi verməklə sonradan məzunlara sahib çıxa bilərlər.

İnanıram ki, ali məktəblər işəgötürənlərin tələblərinə cavab verən kadrları hazırlayarlarsa, şirkətlər hər məzuna görə təhsil müəssisəsinə ödəniş verə və onun büdcəsini artıra bilərlər. Belə artırmaları formal yox, işlək olan Məzunlar Assosiasiyaları da həyata keçirə bilər.

Hörmətli qurultay iştirakçıları!

Hazırda ictimaiyyət və təhsil işçiləri Strategiyanın həyata keçirilməsi üçün tədbirlər planının təsdiqini gözləyir. Ümidvarıq ki, bu plan hökumət tərəfindən kifayət qədər maliyyə dəstəyi alacaq və uğurla həyata keçiriləcəkdir. Strategiya təhsil işçisinin, müəllimin cəmiyyətdə nüfuzunun bərpasına, təhsil müəssisələrində şəffaf mühitin, sağlam istehsal münasibətlərinin yaranmasına, bir çox ölkələrdə olduğu kimi "Qiymətləndirmədə meyar yalnız bilikdir" şüarının hər bir təhsil ocağında normaya çevrilməsinə şərait yaradacaqdır.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev gənclərin xarici universitetlərdə təhsilinin təşkili ilə yanaşı, müasir ixtisaslar üzrə yüksək ixtisaslı mütəxəssislərin Azərbaycanda hazırlanmasını da bir vəzifə kimi təhsil işçilərinin qarşısında qoymuşdur. Sözügedən Strategiyanın da hədəflərindən biri məhz bu vəzifənin icrasının təmin olunmasıdır.

Bizim hər birimiz isə vətəndaşlıq, dövlətçilik, təəssübkeşlik, biliklərin yayılması işində fədakarlıq və təmənnasızlıq nümayiş etdirərək doğma Vətənimizin gələcək inkişafına xidmət göstərməliyik!

Mən sizin hər birinizə müqəddəs müəllimlik fəaliyyətinizdə uğurlar diləyirəm!

Diqqətinizə görə sağ olun!

# MİLLİ MƏCLİSİN DEPUTATI BƏXTİYAR ƏLİYEVİN ÇIXIŞI

Hörmətli qurultay iştirakçıları, əziz müəllimlər!

Sizin hər birinizi bu gözəl gün münasibəti ilə təbrik edir, qurultayın işinə və gələcək fəaliyyətinizdə hər birinizə uğurlar arzulayıram.

Memarı və qurucusu ümummilli liderimiz Heydər Əliyev olan müstəqil Azərbaycanda bu günlər quruculuq işləri davam edir və Azərbaycan öz müstəqilliyini daha da möhkəmləndirərək dünya arenasında özünəlayiq, özünəməxsus bir yer tutmuşdur. Xüsusilə qeyd etmək istərdim ki, Azərbaycanda son 10 ildə həyata keçirilmiş uğurlu daxili və xarici siyasət Azərbaycan iqtisadiyyatını daha da sürətləndirmiş və öz bəhrələrini verməkdə davam edir.

Bu günlər Prezident İlham Əliyevin uğurlu xarici siyasəti Azərbaycanın beynəlxalq aləmdə özünə layiqli yer tutmasına və dünyada ən etibarlı tərəfdaş olmasına, nəhayət, keyfiyyətcə yeni mərhələyə qədəm qoymasına imkan yaratmışdır.

Təhsilin modernləşdirilməsi üçün hər il dövlət büdcəsindən kifayət qədər vəsait ayrılır. Ayrı-ayrı layihələr həyata keçirilir və Heydər Əliyev Fondunun prezidenti, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın "Yeniləşən Azərbaycana yeni məktəb" layihəsinin və digər layihələrin həyata keçirilməsi nəticəsində həm məktəbəqədər təhsil müəssisələri, həm də orta məktəblərin siması günü-gündən dəyişir və mükəmməl maddi-texniki bazaya malik olaraq Azərbaycan xalqının xoşbəxt gələcəyinə xidmət edir. Bütün bunlar təhsildən olan gözləntilərin geniş miqyasından xəbər verir. Cənab Prezidentin bu gün qurultay iştirakçılarına ünvanladığı təbrik məktubunda da qeyd edildiyi kimi, Azərbaycan müəlliminin qarşısında çox böyük vəzifələr durur. Təsadüfi deyil ki, bu qurultay qəbul edilmiş Dövlət Strategiyasından sonrakı dövrə təsadüf edir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü ildə imzaladığı "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda təhsilin ən mühüm məsələləri, onun inkişaf istiqamətləri dəqiq və aydın müəyyənləşdirilmişdir. Bütün bunlar bir daha göstərir ki, biz təhsil işçilərindən gözləntilər olduqca böyükdür.

Qeyd etmək lazımdır ki, hələ də Azərbaycanda təhsilin beynəlxalq rəqabətə davamlılıq göstəriciləri və ali təhsil müəssisələrinin reytinq səviyyəsi heç də arzu etdiyimiz səviyyədə deyildir. Statistik məlumatlar göstərir ki, ali təhsil müəssisələri məzunlarının tərkibi bu gün sürətlə inkişaf edən iqtisadiyyatımızın tələbatlarına və tələblərinə tam cavab vermir. Əlbəttə, biz bu barədə düşünməliyik. Bəs bunun səbəbi nədir? Bəlkə ali məktəblərimizin sayı azdır? Amma təhlillər göstərir ki, müasir dövrün tələbləri baxımından bəlkə də Azərbaycanda ali məktəblərin sayı kifayət qədər çoxdur. Belə olan halda problemlərin kökü nədədir? Bir neçə fakta diqqəti cəlb etmək istəyirəm. Burada da Azərbaycanın ali məktəblərində tələbələrin sayı səsləndirildi. Nisbətlə götürəndə hər bir ali məktəb müəllliminə 10 nəfər tələbə düşür. Görəsən, bu çoxdur, ya azdır? Beynəlxalq standartlarla müqayisə edəndə bu rəqəm olduqca azdır. Bəs bunun səbəbi nədir? Təhlil göstərir ki, dövlət ali məktəblərində ümumi tələbələrin, təxminən, 130 mini təhsil alır. Yerdə qalan, təxminən, 20 min tələbə özəl, yəni qeyri-dövlət təhsil müəs-

sisələrinin payına düşür. Orta hesabla hər bir qeyri-dövlət təhsil müəssisəsinə 1300 tələbə düşür. Bu çoxdur, yoxsa az? Amma biz buna təhsilin idarə edilməsi, maliyyələşdirilməsi nöqteyi-nəzərindən yanaşsaq, hər halda narahatedici və düşündürücü bir məsələdir.

Bazar iqtisadiyyatının tələblərinə və dövlətin iqtisadi inkişaf konsepsiyasına uyğun olaraq mülkiyyət formasından asılı olmayaraq ali məktəblərin bərabərliyi və onlara qarşı tələbkarlıq təmin edilməlidir. Bu problemin həlli və dövlətin təhsil xərcləri yükündən tədricən azad olmasını təmin etmək məqsədi ilə ali məktəblərə planlı qəbul qaydalarına yenidən baxılmalıdır. Hesab edirik ki, bəzi ixtisaslar və istiqamətlər üzrə dövlət sifarişi saxlanılmalı, yerdə qalan planlar, ümumiyyətlə, ləğv edilməli və bu məsələdə ali məktəblərə tam sərbəstlik verilməlidir. Onsuz da hər 100 min nəfərə düşən ali məktəb tələbəsinin sayına görə Azərbaycanın göstəriciləri beynəlxalq göstəricilərdən xeyli geridədir. Əgər biz bu layihəni həyata keçirsək, bölgələrdə gənclərimizin təhsilə yollarını açmaq və təhsili əlçatan etmək imkanı yaranar və eyni zamanda, burada vurğulandığı kimi, bölgələrdə, ucqar kəndlərimizdə kadr çatışmazlığı problemi də öz həllini tapa bilər.

Ali təhsildə özəl sektorun rolu gücləndirilməli və dövlət maliyyələşdirilməsi tədricən özəl sektorun öhdəsinə buraxılmalıdır. Burada söhbət qeyri-dövlət təhsil müəssisələrindən yox, məhz Azərbaycanda fəaliyyət göstərən özəl sektordan gedir. Hansı ki, bu Azərbaycan iqtisadiyyatının 85 faizini təşkil edir, onlar sifarişçi rolunda çıxış etməli və ali məktəblər bilavasitə bu sifarişlə işləməli, onlarla qarşılıqlı əməkdaşlıq qurmalıdırlar.

Strategiyanın məqsədi ölkədə səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura, keyfiyyət göstəricilərinə malik yeni təhsil sisteminin yaradılmasıdır. Hesab edirik ki, artıq universal biliklər universitetindən yeni nəsil universitetlərə, tədqiqatçı universitetlərə keçidin əsası qoyulmalıdır.

Burada elmlə təhsilin vəhdəti məsələsi səsləndi. Hesab edirik ki, universitet tədqiqatlarında elmə geniş yer verilməli və hər bir səy dəstəklənməlidir. Bu gün tələbə bilavasitə tədris prosesində özü bu elmi nailiyyətləri əldə etməli və gələcək mütəxəssis kimi artıq bunun tətbiqinə də özü hazır olmalıdır.

Təhsilin idarə edilməsində mərkəzləşdirmə və mərkəzsizləşdirmə prinsipi bir-birini harmonik şəkildə tamamlamalıdır. Təhsil Nazirliyinin müstəqilliyindən tutmuş məktəbəqədər və ali təhsil müəssisələrinə qədər bütün təhsil qurumlarının müstəqilliyi tam təmin edilməlidir. Çox təəssüflər olsun ki, bu gün təhsil qurumlarının müstəqilliyi kifayət qədər buna imkan vermir ki, o öz işini günün tələbləri səviyyəsində geniş qura bilsin. Bəzi hallarda isə, ümumiyyətlə, bu hüquqlar olduqca məhduddur.

Təhsil müəssisələrinin ictimai özünüidarəetmə orqanlarının yaradılması və real bir idarəetmə orqanı kimi işləməsi günün tələbidir. Bunsuz irəli getmək artıq mümkün deyil. İstər orta məktəblərdə, istərsə də ali məktəblərdə bu mexanizmlər işlək hala gətirilməlidir. 1999-cu ildə qəbul edilmiş islahat proqramında bu işin islahatın I pilləsi kimi 1999-cu ildə başa çatdırılması nəzərdə tutulduğu halda, bu günə qədər bu məsələ mülahizə və təkliflər səviyyəsində qalmaqdadır. Məlumdur ki, təhsil müəssisəsində kadr hazırlığının keyfiyyət səviyyəsi məzunların milli və beynəlxalq əmək bazarında rəqabət qabiliyyəti, ölkənin sosial və iqtisadi inkişafındakı rolu ilə müəyyən olunur. Amma biz bu gün nə ilə rastlaşırıq? Orta məktəb şagirdlərimiz ali məktəblərə qəbul üçün repetitor yanında hazırlaşır və çox təəssüf ki, cəmiyyət bunu normal qəbul edir. Ali məktəbi yenicə bitirmiş məzunlar dövlət qullu-

ğuna, iri şirkətlərdə işə düzəlmək üçün yenidən hazırlığa gedirlər. Amma bu biz müəllimlərin göstəricisidir. Bu göstərici nə qədər ürəkaçandır? Biz bu barədə düşünməliyik. Yəni dövlətin bizə göstərdiyi etimad və qayğıya biz yəqin ki, öz əməli işimizlə tamamilə başqa şəkildə cavab verə bilərik.

Ali məktəblərə qəbul üçün şagirdlərimizin hazırlıq səviyyəsi, əlbəttə, günü-gündən yaxşılaşır. Bir faktı qeyd etmək lazımdır ki, dünya fənn olimpiadalarında azərbaycanlı məktəblilər birinci yerləri tutaraq dünyanın ali məktəblərinə birbaşa qəbul olunurlar. Əlbəttə, bu faktlara görə biz yenə də təhsil sistemimizə daim diqqət və qayğı göstərən cənab Prezidentimizə öz minnətdarlığımızı bildiririk.

Fikrimizcə, bir tərəfdən təhsilin idarə olunmasının yeni modeli, digər tərəfdən isə bilik universitetindən yeni nəsil universitetlərinin yaradılması və eyni zamanda bu işi həyata keçirəcək müəllim hazırlığına diqqət artırılmalıdır.

Müəllim kadrlarının hazırlanması bizim ən ağrılı yerimizdir. Burada bu fikir səsləndi. Bu gün Azərbaycanda müəllim hazırlığının bitkin modeli yoxdur. Hesab edirəm ki, bu layihə üzərində düşünməliyik. Müəllim necə hazırlanmalı, müəllimə hansı tələblər verilməli? Bunlar barədə biz ətraflı düşünməli və bu işi köklü şəkildə yerinə qoymalıyıq. Yeni müəllim hazırlığı modeli hazırlanmalıdır. Peşəkarlığa əsaslanan stimullaşdırıcı əməkhaqqı sisteminin olmaması, təhsil müəssisəsi səviyyəsində idarəetmənin qeyri-effektivliyi, müəllim hazırlığı üzrə infrastrukturun zəif olması müəllimin fəaliyyətinə təsir göstərən amillər sırasındadır. Bu baxımdan müəllimin peşəkarlığının inkişafı üçün yeni stimul mənbələrinin axtarılıb tapılması və bu stimulların yaradılması günün əsas tələblərindəndir. Bunların son nəticəsi müəllim nüfuzunun, nəhayət ki, müəllimə qaytarılmasıdır. Bu gün bu bir sosial sifarişdir, cəmiyyətin tələbidir və əgər biz irəliləyişə nail olmaq istəyiriksə, müəllimə öz müəllim nüfuzunu qaytarmalıyıq.

Fikrimizcə, islahatların uğurla həyata keçirilməsi həm də psixoloji xidmətin təşkilindən asılıdır. Çox təəssüflər olsun ki, bu gün məktəblərimizdəki mövcud psixoloji xidmət bir çox hallarda formal xarakter daşıyır. Düşünürük ki, Təhsil Nazirliyi yanında yeni bir metodik mərkəz yaradılmalı və şagirdlərin, tələbələrin yeni mühitə alışması, onların yaradıcılıq potensialının aşkar edilməsi, gerçəkləşdirilməsi, pedaqoji kollektivdə sağlam psixoloji iqlimin yaradılması üçün psixoloji xidmətin əhəmiyyəti önə çəkilməlidir.

Burada xüsusi olaraq vurğulamaq istərdik ki, təhsil mühitinin yaradıcı təlim mühitinə çevrilməsi yaradıcı təfəkkürə malik tələbələrin və şagirdlərin hazırlanmasını tələb edir və bunun üçün də, ilk növbədə, biz yaradıcı, prioritet təlim mühitinin yaradılmasında səylərimizi artırmalıyıq.

Sonda deyilənləri ümumiləşdirərək bir neçə konkret təklifləri bir daha səsləndirmək istərdik. Birincisi, yeni nəsil universitetlər yaradılmalı, elm və təhsilin vəhdəti təmin edilməli və onların tədqiqatçı-innovasiya mərkəzlərinə çevrilməsinə dəstək verən, rəqabətqabiliyyətli mütəxəssis hazırlığını təmin edən mexanizmlər hazırlanmalıdır.

İkincisi, ali təhsil müəssisələrinə təhsilin məzmununun tətbiqi, idarəetmə, akademik, maliyyə və təşkilati müstəqillik verilməlidir. Mülkiyyət formasından asılı olmayaraq bütün təhsil müəssisələrində ödənişli təhsil üzrə qəbul planı ləğv edilməli və dövlət sifarişi istisna olmaqla, tələbələrin qəbulu və yerləşdirilməsi mexanizminə yenidən baxılmalıdır.

Nəhayət, müəllimin nüfuzunu artırmaq, sosial müdafiəsini təmin etmək üçün ona dövlət qulluqçusuna bərabər status verilməsi haqqında fikrə bir də qayıdılmalıdır.

# AZƏRBAYCAN DİPLOMATİK AKADEMİYASININ PROREKTORU FARİZ İSMAYILZADƏNİN ÇIXIŞI

Hörmətli sədarət!

Əziz müəllimlər!

Xanımlar və cənablar!

Mən bu gün sizin qarşınızda çıxış etməkdən böyük şərəf duyuram. Cənab nazir, təşəkkür edirəm ki, mənə belə möhtəşəm auditoriya qarşısında çıxış etmək, təhsil sahəsində nailiyyətlər və çağırışlar barədə fikirlərimi bölüşməyə imkan verdiniz.

İlk öncə qeyd edim ki, mən burada bir qürurlu azərbaycanlı kimi çıxış edirəm. Orta məktəb vaxtlarından bəri mən müxtəlif ölkələrin təqaüdlərinin hesabına xaricdə təhsilimi davam etdirmişəm. Əvvəl ABŞ-da, sonra İngiltərə və Norveçdə. 1990-cı illərdə ölkəmiz gənc və iqtisadi imkanlarımız məhdud olduğundan biz gənclər digər dövlətlərin yardımına üz tuturduq. Amma son illər mənzərə tam dəyişdi. Ölkə başçısı möhtərəm cənab Prezident İlham Əliyevin təşəbbüsü və bilavasitə qayğısı nəticəsində xaricdə təhsil proqramı yaradıldı və yüzlərlə azərbaycanlı gənc xaricdə təhsil almaq imkanı əldə etdi. Böyük fəxrlə qeyd etmək istərdim ki, mən də bu il bu gözəl imkana sahib oldum və İspaniyada təhsilimi davam etdirmək üçün Azərbaycan dövlətinin təhsil təqaüdünü qazandım.

Xaricdə təhsil proqramı əfsanəvi bir imkandır. Burada Harvard Universitetindən tutmuş dünyanın 500 ən güclü və mötəbər universitetində təhsil almaq imkanı olur. Proqram həm təhsil, həm yaşayış, həm nəqliyyat və digər xərcləri ödəyir. Belə təminat, sözün əsl mənasında, heç bir ölkədə yoxdur. Gənclərimiz xaricdə ən innovativ və qabaqcıl bilik və bacarıqlara yiyələnirlər, ölkəmizə dönüb onun inkişafına töhfə verirlər və dövlətimizi daha da gücləndirirlər. Təhsil aldıqları zaman onlar xarici ölkələrdə diasporamıza yardımçı olur, minlərlə siyasi və mədəni aksiyalar keçirir, Azərbaycanımızı beynəlxalq arenada yaxından tanıtmağa kömək edirlər. Bu günə kimi 2612 gənc azərbaycanlı bu proqrama qəbul olunub, dünyanın onlarca ölkəsində təhsilini davam etdirir. Çox sevindirici haldır ki, bu proqrama ölkəmizə təcili lazım olan peşələr, o cümlədən tibb, mühəndislik, informasiya texnologiyaları və digərləri daxildir.

Xaricdə təhsil proqramı nə qədər gözəl olsa da, onun yaranması, eyni zamanda ölkəmizdə təhsil səviyyəsinin və keyfiyyətinin dünya standartlarına və ölkəmizin ehtiyacına kifayət qədər uyğun olmamasına bir işarədir. Sirr deyil ki, ölkəmizdə bazar iqtisadiyyatı sürətlə inkişaf edir, yeni peşəkar kadrlara ehtiyac günü-gündən artır, lakin şirkət və hətta dövlət qurumları istənilən kadr potensiallarını doldura bilmirlər. Beləliklə, gənc kadrlarımızı xarici universitetlər hesabına yetişdirməyə məcburuq. Bu da, öz növbəsində, xarici universitetlərin maliyyələşdirilməsinə gətirib çıxarır. Uzunmüddətli perspektivdə biz mütləq gərək təhsil standartlarımızı təkmilləşdirək və yerli universitetlərin potensiallarını qaldıraq. Xaricdə təhsil proqramı kadr probleminin həlli üçün qısamüddətli bir tədbirdir, lakin uzunmüddətli həll yolunu bizim öz yerli ali təhsil ocaqlarımızın potensialının gücləndirilməsində görürəm.

Bu məqsədlə cari ilin oktyabrında dövlət başçısı yeni təhsil strategiyasını imzalamışdır. Bu təhsil strategiyası ölkəmizin təhsil sisteminin üzümüzə gələn illərdə islahatını əhatə edir. Strategiyada başlıca məqsəd ölkədə səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sistemini yaratmaqdır. Azərbaycanın təhsil sistemi iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin

standartlarına uyğun olmalıdır. Belə təhsil sistemi ölkənin modernləşməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirməklə Azərbaycan Respublikasının beynəlxalq rəqabət qabiliyyətini yüksəltməyə nail ola bilər.

Yeni təhsil strategiyasında mühüm məqsədlər müasir tələblərə cavab verən təhsil məzmununun yaradılması, yüksək nüfuzlu müəllimlərin formalaşdırılması, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik yeni idarəetmə sisteminin formalaşdırılması, ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun və nəhayət, təhsilin dayanıqlı və müxtəlif mənbələrdən istifadə olunmaqla yeni maliyyələşdirmə mexanizminin yaradılmasıdır.

Məmnunluq hissi ilə qeyd etmək istərdim ki, yeni təhsil strategiyasının yazılmasında çalışdığım Diplomatik Akademiyanın bir sıra təklifləri, o cümlədən çevik kurikulumlar, tələbələr üçün sərfəli faizlər ilə təhsil krediti, universitetlərdə İnkişaf Fondlarının yaradılması və digərləri öz əksini tapmışdır. Yeri gəlmişkən qeyd etmək istərdim ki, universitetlərin İnkişaf Fondları təhsilə dövlət-ictimai və dövlət-biznes partnyorluğunu gətirməyə kömək edəcək.

Yəqin razılaşarsınız ki, belə əhatəli strategiyanı həyata keçirmək üçün məhz xaricdə təhsil proqramının məzunları önəmli ola bilər. Onları ölkəyə geri qayıdandan sonra təhsil ocaqlarımıza cəlb etmək elə də asan iş deyil. Məvaciblərin az olması, təhsil sektorunda tədqiqatlar üçün fondların məhdudluğu, ümumi pedaqoji fəaliyyət üçün stimulların az olması xaricdə təhsil almış kadrlarımızı təhsil sektorundan uzaqlaşdırır. Xaricdə təhsil almış məzunların çoxu Bakıda özəl sektorda və beynəlxalq təşkilatlarda çalışmağa üstünlük verir.

Bu yerdə qeyd etmək istərdim ki, ölkədə təhsilin adambaşına maliyyələşdirilməsinə keçdikdən və Nazirlər Kabinetinin keçənilki sərəncamından sonra universitetlərdə müəllimlərə maaşların verilməsi üçün dövlət tarifləri ləğv olunub, müəyyən azadlıqlar yaradılıb. Universitet rəhbərləri xaricdə təhsil almış gəncləri tədrisə cəlb etmək üçün yeni innovativ yollar tapmalı, büdcədənkənar fondlar hesabına onların əmək fəaliyyətini stimullaşdırmalıdır. Bu təcrübə Azərbaycan Diplomatik Akademiyasında uğurla tətbiq olunur və bu günə kimi ABŞ və Avropada doktorantura səviyyəsini bitirmiş 20-dən çox gənc azərbaycanlı bizim akademiyada hazırda pedaqoji fəaliyyətə cəlb olunub.

Bəzən özəl sektorda çalışan və xaricdə təhsil almış məzunlarımıza maliyyə stimulu da heç lazım olmur. Onların maaşları kifayət qədər yüksək olur. Sadəcə onlar pedaqoji fəaliyyətə cəlb olunmalı və dərs demək imkanları verilməlidir, onların bilik və təcrübələrindən təhsil prosesində yararlanmağa can atılmalıdır. Bəzi hallarda onlar üçün xüsusi ingilisdilli qrupların yaradılması, xarici ədəbiyyatla təmin olunması zəruridir. Yalnız belə yolla universitetlərimizə gənc pedaqoji qüvvə cəlb edə bilərik.

Xanımlar və cənablar.

Azərbaycan dünya iqtisadiyyatının bir parçasına çevrilib. Biz dünyada hər bir sahədə rəqabət apardığımız kimi, təhsil sahəsində də rəqabətlə üzləşirik. Sərhədlər açılıb, məzunlarımız artıq təkcə digər azərbaycanlılar ilə yox, çinli, yapon, sinqapurlu, kanadalı, finlandiyalı, cənubi koreyalı gənclərlə rəqabət aparır. Mən bu ölkələrin adlarını təsadüfən çəkmədim. Bunlar son sorğular nəticəsində dünyanın ümumtəhsil səviyyəsinə görə ən aparıcı ölkələridir. Orada təhsil innovativ texnologiyaların ən son nailiyyətlərinə arxalanan, bu texnologiyaları gündəlik tətbiq edən və yaradıcı azadlığa malik olan bir mühitdə keçirilir. Hədəfimiz belə təhsil sisteminə keçidi təmin etmək olmalıdır. Bunun üçün ölkədə kifayət qədər siyasi iradə var və cəmiyyətimizin bütün təbəqələri təhsildə dönüş etməyin vaxtının çatdığını vurğulayır. Bu keçidi reallaşdıra bilsək, ölkəmiz bilik iqtisadiyyatı qurmağa nail olacaq. Sizlərə bu önəmli missiyada və qurultayın işinə uğurlar arzulayıram.

# BAKI ŞƏHƏRİ AKADEMİK ZƏRİFƏ ƏLİYEVA ADINA LİSEYİN DİREKTORU MƏHƏBBƏT VƏLİYEVANIN ÇIXIŞI

Hörmətli sədarət!

Hörmətli qurultay iştirakçıları!

Hər birinizi Azərbaycan müəllimlərinin XIV qurultayı münasibəti ilə təbrik edirəm və sizə uğurlar arzulayıram.

Bu gün Azərbaycan təhsili özünün uğurlu inkişaf dövrünü yaşayır. Bu inkişaf təhsilin bütün mərhələlərində özünü göstərir. Milli təhsilimizə dövlət qayğısının ildən-ilə artması onun dünyada geniş yayılmış təhsil standartlarına yaxınlaşmasını təmin edir.

Diqqətinizi uzaq keçmişə yönəltmək istərdim. 1978-ci ildə Azərbaycan müəllimlərinin VI qurultayı keçirilirdi. Ümummilli lider Heydər Əliyev həmin qurultayda belə bir fikir söyləmişdi: "Çox uzun bir müddət ərzində məktəbin işinə yalnız bir göstəriciyə görə qiymət verilirdi: məktəbin nə qədər məzunu tələbə olmuşdur. Bu nöqteyi-nəzəri dəyişdirmək vaxtı gəlib çatmışdır. Bilikli, bacarıqlı, əməksevər adamlar yetişdirmək məktəbin ən birinci vəzifəsidir. Bununla yanaşı, təhsilimizin ən böyük məqsədi Azərbaycan vətəndaşı, cəmiyyətin ləyaqətli üzvünü hazırlamaqdır". O zamanlar müstəqil olacağımızı təsəvvür belə edə bilməzdik. Müstəqil dövlətin vətəndaş tərbiyəsinin birbaşa təhsillə bağlı olması isə danılmaz faktdır.

Hələ 35 il bundan əvvəl uzaqgörən, dahi şəxsiyyət Heydər Əliyevin bu sərrast deyimi bu günümüz üçün daha aktualdır.

Ümumi orta təhsilin məqsədi bir tərəfdən təhsilalanların sistemli bilik, bacarıq və vərdişlərə yiyələnməsini təmin etməkdirsə, digər tərəfdən onları ictimai həyata, səmərəli əmək fəaliyyətinə hazırlamaq, milli mənəvi və ümumbəşəri dəyərlərə sahib olan vətəndaş və şəxsiyyət yetişdirməkdir. Bu mənada ümumtəhsil məktəbləri dövlətin inkişafını təmin etmək üçün nəzəri və praktik biliklərə malik, rəqabətqabiliyyətli kadrların yetişməsi üçün baza rolunu oynayır. Son illər ölkəmizdə aparılan sosial- iqtisadi siyasət nəticəsində Azərbaycan sürətlə inkişaf etmişdir. Gerçəkləşdirilən islahatlar və genişmiqyaslı infrastruktur layihələri həyatımızın yenidən qurulması üçün böyük zəmin yaratmışdır. Bu, ümumtəhsil məktəblərinin sferasında da əsaslı islahatların aparılmasını zəruri etmişdir. Odur ki, 2003-cü ildən təhsil sahəsində xeyli inkişafyönümlü proqram və layihələr həyata keçirilməyə başlanmışdır.

Aparılan islahatlarla yanaşı, təhsilimizdə bu gün də həllini gözləyən bir çox problemlər mövcuddur. Möhtərəm cənab Prezident İlham Əliyev demişdir: "Biz neft kapitalını intellektual kapitala çevirməliyik". Sürətlə inkişaf edən ölkəmizdə təhsil sisteminin insan kapitalının inkişafına cavab verməsi üçün yeni və daha mütərəqqi islahatların həyata keçirilməsi zərurəti yaranmışdır. Təbii ki, təhsil hələ həyatın özü deyil, yalnız həyata hazırlıq mərhələsidir. Bu baxımdan insanın bütün sonrakı inkişafının bünövrəsi ümumi təhsilə əsaslanır. Məqsədə çatmaq üçün ən böyük məsuliyyət də məhz ümumi təhsilin üzərinə düşür. Yəqin ki, əksər hallarda məktəbdə uşaqların üzündə təbəssümün, məmnuniyyət hissinin olmamasının, xüsusilə buraxılış siniflərində oxuyan şagirdlərin dərslərdən tez-tez yayınmaları-

nın, həm fiziki, həm də əqli yorğunluğunun səbəbi təhsil sistemindəki mövcud çatışmazlıqlarla bağlıdır. Bu durum hamımızı düşündürməli, vəziyyətdən birgə çıxış yolları tapmağa yönəltməlidir. Bu günün məktəbi şagirdlərin məcburi gəldiyi, bəzən uğursuz başa vurduğu təhsil mühitindən hər mənada sevdiyi və güvəndiyi məktəbə çevrilməlidir. Bu gün məktəb şagird üçün bir tədqiqat və təcrübə laboratoriyası olmalıdır. Tədris prosesi və ümumilikdə, təhsil mühiti şagirdi yaradıcılığa, proseslərin aktiv iştirakçısı olmağa sövq etməlidir.

Hörmətli qurultay iştirakçıları!

Təcrübə göstərir ki, tamamilə nəzəri xarakter daşıyan, praktik bilik verməyən təhsil öz əhəmiyyətini itirməkdədir. Təhsilin məzmunu əldə olunmuş bilik və bacarıqların effektiv tətbiq edilməsi imkanları ilə ölçülməlidir. Uzun illər ölkəmizdə təhsilin məzmununun formalaşmasında akademik biliklərə geniş yer verilmişdir. Təhsilin məzmunu ilə bağlı əsas meyillərdən biri təhsil proqramlarının ölkənin sosial-iqtisadi inkişaf tələblərinə cavab verməsindədir. Bu mənada bütün fənlər üzrə təhsil kurikulumlarının qəbul edilməsi son illərin ən böyük nailiyyətlərindən sayıla bilər. Yeni qəbul edilmiş fənn kurikulumları həyati bacarıqların inkişafına xidmət edən məzmuna malikdir, təhsilalanları həyatın müxtəlif sahələrində fəaliyyətə yönəldir. Bu mənada qəbul edilmiş fənn kurikulumları yalnız işin bir tərəfidir. Həmin kurikulumlar əsasında yazılan dərsliklərdəki problemlərin mövcudluğu nəticədə hələ də şagirdlərin onlardan müstəqil istifadəsini çətinləşdirir. Belə olan təqdirdə görəsən, bu dərsliklərlə son illər ölkəmizdə geniş yayılmış repetitorluq institutunun qarşısını almaq mümkün olacaqmı? Hesab edirəm ki, dərsliklərin daha da təkmilləşdirilməsi bu problemləri aradan qaldırmağa xidmət edən mühüm amillərdən biridir.

Müəllim amili təlim prosesində başlıca rol oynayır. Təhsildəki nailiyyətlər müəllimin peşəkarlıq səviyyəsindən, akademik bacarıqlarından, tədris təcrübəsindən çox asılıdır. Sirr deyil ki, təhsilimizdə bu tələblərə cavab verməyən xeyli müəllim vardır. Vəziyyətin uzun illər bu şəkildə qalmasının bir səbəbi də ondan ibarətdir ki, peşəkarlığa əsaslanan stimullaşdırıcı əməkhaqqı sistemi tətbiq olunmur. Odur ki, daha çox hallarda müəllimlər öz bilik və bacarıqlarını davamlı olaraq artırmağa səy göstərmirlər. Təcrübə göstərir ki, gündəlik fəaliyyətində müasir təlim metodlarından və texnologiyalardan ustalıqla istifadə edən, şagirdlərdə təfəkkürün formalaşmasını inkişaf etdirən səriştəli müəllimlər daha yaxşı nəticələr əldə edir və onlar şagirdlərin xüsusi rəğbətini qazanırlar. Axı, şagirdin nailiyyətləri müəllimin bilikli, bacarıqlı və səriştəli olmasından çox asılıdır. Bu səbəbdən müəllim peşəkarlığının artırılması üçün maddi stimulların yaradılmasına böyük ehtiyac vardır. Bununla həm təhsilin səviyyəsi yüksələr, həm gənc nəsil müəllimlik peşəsini seçər, həm də cəmiyyətdə müəllim adının hörmət və nüfuzu artar. Artıq bu adın o yüksək nüfuzunu qaytarmağın zamanı çatmışdır.

Heç şübhəsiz ki, təlimin keyfiyyətinə təsir edən mühüm amillərdən biri də məktəbin idarə edilməsidir. İdarəetmə prosesində şəffaflığın və maraqlı tərəflərin iştirakının təmin edilməsi zəruridir. Hazırda təhsil müəssisələrinin bu sahədəki rolu məhduddur. Özəl təhsil müəssisələri istisna olmaqla dövlət təhsil müəssisələri maliyyə cəhətdən müstəqil deyillər. Onların maliyyələşməsi həmin müəssisədəki təhsilin keyfiyyət göstəricilərindən asılı deyildir. Təhsil müəssisələrinin rəhbərliyi tədrisin nəticələrinə görə də ciddi məsuliyyət daşımır. Aydındır ki, təhsil müəssisələrinin idarə edilməsi mexanizminin təkmilləşdirilməsi zərurətdir. Bu

məqsədlə ali məktəblərdə təhsilin təşkili və idarə olunması ixtisası üzrə mütəxəssis hazırlığına ehtiyac var. Məktəbin idarə olunmasında maraqlı tərəflərin iştirakının təmin edilməsi və maliyyə müstəqilliyi üçün mənbələrin tapılması da vacib məsələlərdəndir. Bu gün müasir idarəetmə bilik və bacarığına yiyələnmiş, informasiya texnologiyalarına bələd, zəruri pedaqoji və psixoloji bilikləri olan, strateji düşüncə tərzi sərgiləyən, ölkəmizin təhsil və sosial inkişafına töhfə verə biləcək məktəb direktorlarına ciddi ehtiyac var. Sevindirici haldır ki, Təhsil Nazirliyi idarəetmə sahəsində sadalanan peşəkar səriştəyə malik direktorların hazırlığı məqsədilə təlimlər keçirməyi planlaşdırır. Əminəm ki, bu təlimlərin yekununda "Keyfiyyət sertifikatı" əldə edəcək iştirakçıların nailiyyətləri idarəetmə sahəsində müsbət nəticələrə səbəb olacaq.

Hörmətli qurultay iştirakçıları!

Sadaladığım bu məsələlər vaxtaşırı müzakirə mövzusu olmuşdur. Ayrı-ayrı təhsil işçilərinin bu məsələlərlə bağlı özünəməxsus fikirləri də vardır.

Çox təqdirəlayiq haldır ki, 24 oktyabr 2013-cü il tarixdə cənab Prezidentin sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda sadaladığım problemlərin həll edilməsi üçün genişmiqyaslı tədbirlər nəzərdə tutulur. Yeri gəlmişkən, strateji hədəflərdən biri kimi 12 illik ümumi təhsilə keçidin təmin olunmasını, tam orta təhsil pilləsində təlimin müxtəlif istiqamətlər üzrə bölünməsini qeyd etmək istərdim. 10 illik icbari ümumi orta təhsil və 2 illik tam orta təhsil modelinə keçid şagirdlərə öz arzu və istəklərinə uyğun əlverişli seçim imkanları verəcək.

Nəzərinizə çatdırım ki, rəhbərlik etdiyim akademik Zərifə Əliyeva adına lisey hazırda həmin təhsil modelinə uyğun fəaliyyət göstərir. Liseydə təhsil müxtəlif istiqamətlər üzrə təşkil edilmişdir. Bu, o deməkdir ki, şagirdlər tam orta təhsil pilləsində, əsasən, seçdikləri istiqamətlər üzrə tələb olunan bilik və bacarıqlara yiyələnirlər. Fəaliyyətimiz dövründə liseyin 500 nəfər məzunu olmuşdur ki, onların hamısı bu gün müxtəlif ali məktəblərdə təhsillərini uğurla davam etdirir. Təkcə bu fakt yüksək nəticəyə qısa zamanda nail ola biləcəyimizə inanmaq üçün əsas verir. Odur ki, strategiyanın çox vaxtında təsdiq edilməsinə sevinirik və həlli ilə bağlı bütün imkanların səfərbər olacağına əminik. Təhsilin inkişafını özündə ehtiva edən bu sənəddə nəzərdə tutulmuş strategiyanın həyata keçirilməsi mexanizmini düzgün qura bilsək, təhsil sektoru Azərbaycanın sosial-iqtisadi inkişaf tələblərinə cavab verən səviyyəyə yüksələcəkdir. Yalnız o zaman təhsilimiz ümummilli lider Heydər Əliyevin arzularını reallaşdıracaq və bununla da bütün həyatını və varlığını həsr etdiyi doğma Azərbaycanımız daha da qüdrətlənəcək, inkişaf edəcəkdir.

Milli təhsilimizin inkişafı naminə birgə fəaliyyətimizdə hamımıza uğurlar arzulayıram.

# İSMAYILLI PEŞƏ TƏDRİS MƏRKƏZİNİN DİREKTORU ZAUR MURADOVUN ÇIXIŞI

Hörmətli sədarət!

Hörmətli qurultay iştirakçıları!

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda göstərildiyi kimi, son illər ərzində həyata keçirilən məqsədyönlü islahatlar ölkədə siyasi və iqtisadi sabitliyin bərqərar olmasına, sosial-iqtisadi inkişaf meyillərinin möhkəmlənməsinə şərait yaratmışdır. Ölkəmiz inkişaf etdikcə hədəfləri yenilənir və bir zaman xəyal etdiyimiz məqsədlər hazırda məqsədyönlü sosial-iqtisadi siyasət nəticəsində uğurla həyata keçirilir. Respublikamız özünün sosial-iqtisadi inkişafında keyfiyyətcə yeni mərhələyə qədəm qoymuşdur. Ölkədə bütün resurslardan, o cümlədən əmək ehtiyatlarından səmərəli istifadəni təmin etməklə iqtisadi cəhətdən güclü və yüksək sosial standartlara malik cəmiyyətin qurulması bu mərhələnin əsas prioritetinə çevrilmişdir.

İlk peşə-ixtisas təhsili ümumi təhsilin tərkib hissəsi olmaqla yanaşı, ölkənin sosial-iqtisadi inkişafında da mühüm rol oynayır. Belə ki, əmək bazarını ixtisaslı işçi qüvvəsi ilə təmin edən bu sahə sağlam vətəndaş cəmiyyətinin formalaşmasına da təsir edir. Cəmiyyətimizdə heç də həmişə peşə təhsilinə birmənalı münasibət bəslənilməyib. Bu da peşə təhsili sahəsinin inkişaf etməsinə öz mənfi təsirini göstərib və göstərməkdə davam edir. Belə ki, inkişaf etmiş ölkələrdə yuxarı sinif şagirdlərinin 40-60%-i öz təhsillərini peşə təhsili müəssisələrində davam etdirməyə üstünlük vermələrinə və bununla da gələcək karyeralarını erkən vaxtlardan qurmağa başlamalarına baxmayaraq, ölkəmizdə hələ də bəzi vətəndaşlarımız öz övladlarını peşə təhsili müəssisələrinə göndərməkdə tərəddüd edirlər. Fikrimcə, peşə təhsili işçilərinin qarşısında duran əsas məqsədlərdən biri də məhz yaxın illərdə ictimaiyyətdə peşə təhsili haqqında formalaşmış mənfi münasibətin aradan qaldırılması ilə əlaqədar olaraq ciddi səy göstərmələridir.

Bu gün hamımızı düşündürən məsələlərdən biri də peşə təhsilinin gələcək inkişafının necə olmasıdır. Bir peşə təhsili müəssisəsinin rəhbəri kimi məni də düşündürən məsələlərdən biri məhz müəssisəmizin ölkə, region və dünya kontekstində inkişafını necə təmin etməkdir. "Azərbaycan 2020: Gələcəyə baxış" İnkişaf Konsepsiyasında göstərildiyi kimi, enerji resursları və digər xammal ixracatçısı kimi tanınan ölkədən yüksək səviyyəli və rəqabətqabiliyyətli məhsullar istehsal edən ölkəyə çevrilməyi əsas hədəf kimi götürən respublikamız bütün sahələrdə olduğu kimi, təhsil sistemini də bu hədəfə nail olmaq üçün istiqamətləndirir. Belə ki, ilk növbədə insan resurslarının inkişaf etdirilməsi zəruridir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin təbirincə desək, "qara qızıl"ın insan kapitalına çevrilməsi üçün təhsil sistemi, o cümlədən bu sistemin tərkib hissəsi olan ilk peşə-ixtisas təhsili də yenidən müasir dövrün tələblərinə uyğun formalaşmalıdır.

Hörmətli qurultay iştirakçıları!

Peşə təhsili sisteminin müasir dövrün tələblərinə uyğun olaraq formalaşdırılması zamanı biz ölkə və dünya iqtisadiyyatında baş verən inkişaf tendensiyalarını nəzərə almalı, bu tendensiyaları qarşılaya biləcək sis-

temin qurulmasına çalışmalıyıq. Bu gün dünya əmək bazarında iş və işçiyə olan münasibət dəyişməkdədir. Artıq texnologiyaların sürətlə inkişaf etdiyi bir dövrdə işəgötürənlər tərəfindən işçiyə qoyulan tələblərin dəyişilməsini müşahidə edirik. Belə ki, Avropa Peşə Təhsili İnkişaf Mərkəzinin məlumatına əsasən, 2010-cu illə müqayisədə 2020-ci ilə qədər daha yüksək bacarıqlar tələb edən iş yerlərinin sayı 29%-dən 34%-ə qədər artacaq, eyni zamanda funksional baxımdan çox mürəkkəb olmayan iş yerlərinin sayı isə 23%-dən 18%-ə qədər azalacaqdır. Bu gün işəgötürənlər sadə funksiyaları icra edə biləcək işçilərdən çox universal bacarıqlara malik olan işçilərə üstünlük verirlər. Beləliklə, müasir peşə təhsili sistemi dinləyicilərə yalnız standart peşə bilikləri və bacarıqları deyil, həmçinin onlarda kreativlik, tənqidi təfəkkür, çevik idarəetmə və qərarvermə qabiliyyətlərinin, kollektivdə işləmək və təşəbbüskarlıq vərdişlərinin formalaşmasına yardım etməlidir.

Hazırda ölkəmizdə iqtisadiyyatın müxtəlif sahələri üzrə innovativ və yüksək texnologiyalar üzrə sənaye müəssisələri, texnoparkların yaradılması, alternativ enerji mənbələrindən geniş istifadə edilməsi, yaşıl texnologiya sahələri üzrə layihələr həyata keçirilməkdədir. Bu, həm ölkənin iqtisadiyyatının şaxələnməsinə yardım edir, həmçinin təhsil sistemi üçün də yeni hədəflərin müəyyənləşdirilməsinə təsir edir. Belə ki, artıq peşə təhsili sistemi də illərlə formalaşmış ənənəvi sahələr üzrə ixtisaslı kadrların hazırlanması ilə yanaşı, müasir və bəzi hallarda mürəkkəb sayılan sahələr üzrə kadrların hazırlanmasına istiqamətlənməlidir. Yenə də Avropa Peşə Təhsili İnkişaf Mərkəzinin verdiyi məlumata əsasən, 2020-ci ilə qədər yaşıl iqtisadiyyat sahəsi üzrə yaradılacaq iş yerlərinin sayı 20 milyona çatacaqdır və biz əgər bu sahədə inkişaf etmiş ölkələrlə rəqabət aparmaq istəyiriksə, mütləq surətdə peşə təhsili sistemini də bu tələblər əsasında formalaşdırmağa çalışmalıyıq.

Bununla yanaşı, zənnimcə, peşə təhsilinin fəlsəfəsində də müəyyən dəyişikliklərin edilməsi vaxtı çatıbdır. Belə ki, uzun müddət peşə təhsili yalnız işəgötürənlər üçün ucuz, ixtisaslı işçi qüvvəsi hazırlayan bir sahə kimi formalaşıb. Lakin müasir dövrdə biz ixtisaslı işçi qüvvəsi hazırlamaqla yanaşı, həmçinin gələcəyin işəgötürənini də hazırlamalıyıq. Yəni çalışmalıyıq ki, dinləyicilərimizə elə bilik, bacarıq və kompetensiya aşılaya bilək ki, onlar qısa müddət ərzində öz işlərini qura və işəgötürən kimi fəaliyyətlərini davam etdirə bilsinlər.

Hörmətli qurultay iştirakçıları!

Peşə təhsilinin inkişafına işəgötürənlərin iştirakı olmadan nail olmaq çox çətindir. Belə ki, peşə təhsilinin inkişaf etdiyi ölkələrin təcrübəsi göstərir ki, təhsil müəssisələri ilə işəgötürənlər arasında sosial partnyorluq əlaqələrinin inkişaf etdirilməsi kadr hazırlığının keyfiyyətinə və nüfuzuna müsbət təsir göstərir. Fikrimcə, bu gün peşə təhsilinin əsas problemlərindən biri məhz işəgötürənlərlə səmərəli əlaqələrin olmamasıdır. İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, peşə təhsili sisteminin səmərəliliyinin və nəticəyönümlülüyün təmin edilməsi üçün işəgötürən təşkilatların bu prosesdə fəal iştirak etməsi zəruridir.

Fikrimcə, peşə təhsili müəssisələri işəgötürənlərlə əməkdaşlıq əlaqələrinin gücləndirilməsində təşəbbüskarlığı öz üzərlərinə götürməklə kadr hazırlığı prosesinin keyfiyyətinin yüksəlməsinə nail olmalıdırlar. Bu gün peşə təhsili müəssisələri nəinki işəgötürənlər tərəfindən kadr hazırlığına dair təkliflər gözləməli, eyni zamanda özləri aktiv olaraq əmək bazarına müxtəlif proqramları təklif edərək işəgötürənlər, işsiz və iş axtaran vətəndaşlar üçün alternativ imkanlar

yaratmalıdır. Bununla yanaşı, müasir tipli peşə təhsili müəssisələrinin yaradılması və dövrün tələblərinə müvafiq proqramların inkişaf etdirilməsi vasitəsilə biz yaxın zamanda işəgötürənlərin diqqətini öz üzərimizə cəlb edə və peşə təhsilinin inkişafına nail ola bilərik.

Təsadüfi deyil ki, Azərbaycan Respublikasının Təhsil Nazirliyi peşə təhsili sisteminin əhatə dairəsinin genişləndirilməsi və kadr hazırlığı prosesinin keyfiyyətinin yüksəldilməsi məqsədilə son zamanlar həyata keçirdiyi "Müasir Azərbaycan peşəkarları" layihəsinin icrasına başlamışdır. Əslində layihənin adı bu gün peşə təhsilinin əsas məqsədini xarakterizə edir. Belə ki, bu gün bizim əsas məqsədimiz əmək bazarının tələbinə müvafiq olaraq peşəkarların hazırlanmasıdır. Layihələrin icmalı göstərir ki, peşəkar kadrların hazırlanmasına sistemli yanaşdıqda kadr hazırlığı prosesinin səmərəli və keyfiyyətli olmasına nail olmaq olar. Həyata keçirilən layihələr çərçivəsində Təhsil Nazirliyinin maddi və metodiki dəstək verməsi ilə yanaşı, işəgötürənlərin bu prosesdə fəal iştirak etməsi əmək bazarında, doğrudan da yüksək ixtisaslı kadrlara olan tələbatı artırır.

Bundan başqa, bu günlərdə Azərbaycan Respublikası Təhsil Nazirliyi ilə Dövlət Neft Şirkəti və "Azərsu" Açıq Səhmdar Cəmiyyəti arasında ilk peşə-ixtisas təhsili müəssisələrinin fəaliyyətinin dəstəklənməsi barədə ikitərəfli əməkdaşlıq memorandumlarının imzalanması, ayrı-ayrı biznes qurumları və işəgötürənlərlə qurulmuş işgüzar münasibətlər sübut edir ki, yaxın vaxtlarda peşə təhsili üzrə təhsilverənlərin və təhsilalanların bilik və bacarıqlarının artırılması, onların elmi-texniki yeniliklərə yiyələnməsi istiqamətində birgə tədbirlərin həyata keçirilməsi və peşə təhsili sisteminin ictimai statusunun yüksəldilməsi məsələləri öz həllini tapacaqdır.

Respublikamızın iqtisadiyyatının sürətlə inkişafı kontekstində ayrı-ayrı sahələr üzrə ixtisaslı və peşəkar kadrlara tələbat yaranır ki, bu da təbii olaraq ömürboyu təhsilalma zərurətinin yaranmasına səbəb olur. Bununla yanaşı, əmək bazarının təhlili göstərir ki, informasiya və texnologiyanın sürətlə inkişaf etdiyi bir dövrdə müəyyən müddət əvvəl əldə edilmiş bilik və bacarıqlar istifadəyə yararsız və yaxud qismən yararlı olur və ya bu kompetensiyalar fərdin inkişafına səbəb ola bilmir. Eyni zamanda əmək bazarında aparılan araşdırma göstərir ki, məşğul əhalinin 1/3 hissəsi işlədikləri sahə üzrə heç bir peşə təhsili sənədinə və yaxud həmin sahədə işləyə biləcək müvafiq sənədə sahib deyillər. Lakin təhsil sənədlərinin olmaması bilik və bacarıqlarının, kompetensiyalarının olmaması demək deyil, sadəcə, onların karyeralarının inkişafına maneə törədir. Belə ki, vətəndaşların təhsil sənədinin olması onların gələcək karyeralarının inkişafına yardım edəcəkdir. Belə olduğu təqdirdə vətəndaşların fasiləsiz peşə təhsili ilə əhatə olunmasına ehtiyac vardır. Yaşlıların və praktiki bacarıqları olan peşəkarların qısamüddətli təhsil kurslarına cəlb edilməsi günün tələbinə çevrilmişdir.

Hörmətli qurultay iştirakçıları, əziz müəllimlər, mən də ilk öncə öz adımdan sizi və sizin timsalınızda bütün Azərbaycan müəllimlərini təbrik edirəm. Sizə fəaliyyətinizdə yeni-yeni uğurlar arzu edirəm.

# BAKI ŞƏHƏRİ 43 NÖMRƏLİ MƏKTƏB-LİSEY KOMPLEKSİNİN DİREKTOR MÜAVİNİ KƏMALƏ BƏDƏLOVANIN ÇIXIŞI

Hörmətli qurultay iştirakçıları!

Azərbaycan müəllimlərinin XIV qurultayı ölkəmizin ictimai-siyasi həyatında əlamətdar bir hadisədir. Hazırda bütün təhsil işçilərinin diqqəti bu qurultaya yönəlmişdir, çünki bu qurultayda möhtərəm Prezidentimiz cənab İlham Əliyevin tarixi sərəncamı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"ndan irəli gələn vəzifələrin həyata keçirilməsi, Azərbaycan təhsilinin gələcək inkişaf yollarının müəyyən edilməsi istiqamətində mühüm qərarlar qəbul olunacaqdır.

"Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununda müxtəlif səbəblərlə yanaşı, sağlamlıq imkanlarından asılı olmayaraq, hər bir vətəndaşa təhsil almaq imkanının yaradılması müddəasının təsbit edilməsi və bunun təhsil sahəsində dövlət siyasətinin əsas prinsiplərindən biri kimi qeyd olunması, heç şübhəsiz, dövlətimizin humanist mahiyyətinin parlaq təzahürüdür.

Məlum həqiqətdir ki, insanın hansı sağlamlıq vəziyyətində dünyaya gəlməsi bilavasitə onun özündən asılı deyildir. Bununla belə, istər əqli, istərsə də fiziki cəhətdən qüsurlu şəxslərin cəmiyyətdə "artıq adam"a çevrilməməsi hamımızdan, xüsusilə də biz təhsil işçilərindən çox asılıdır. Çünki insanın şüurlu həyatla ilk təmasları, məsuliyyətli dövrü, inkişafı, bir qayda olaraq, təhsildən başlanır.

Ölkəmizdə sağlamlıq imkanları məhdud uşaqların təhsilinin təşkili üzrə hərtərəfli imkanlar mövcuddur və hazırda onlar üçün təhsil müəssisələrinin geniş şəbəkəsi yaradılmışdır. Lakin sağlamlığında ciddi qüsurları olan elə uşaqlar da var ki, onlar daha artıq qayğı və diqqətə möhtacdırlar, onların təhsilinin təşkili xüsusi forma, yanaşma tələb edir. Bunun ən optimal nümunəsi inklüziv təhsildir.

Uşaqların inklüziv təhsilə cəlbi tarixi Azərbaycanda o qədər də uzaq keçmiş deyildir. Artıq inklüziv təhsil layihəsinin həyata keçirilməsindən 8 il keçir. Çalışdığımız məktəb-lisey kompleksində inklüziv təhsilə 12 uşaqla başlamağımıza baxmayaraq, hazırda 60 şagirdlə davam edirik. Bu şagirdlərlə işi səmərəli təşkil etmək üçün müəllim köməkçiləri ştatı ayrılmışdır. Müəllim və müəllim köməkçiləri ibtidai siniflərdə nitq pozuntusu olan, uşaq serebral iflicindən əziyyət çəkən, autizm diaqnozu ilə qəbul edilən, bir sözlə, xüsusi qayğıya ehtiyacı olan uşaqlarla işləyirlər. Beşinci sinifdən isə şagirdlərimiz təhsillərini müəllim köməkçilərinin iştirakı olmadan müstəqil şəkildə davam etdirirlər. Xüsusi qayğıya ehtiyacı olan uşaqları cəmiyyətin layiqli üzvü etmək hamının diqqətindədir. Onlara sağlam uşaqlarla bir yerdə təhsil almaq şansının verilməsi isə yaşamaq həvəsini, gələcəyə ümid hissini, özlərinə inamı, müstəqil qərar vermək imkanını yaradır və artırır. Artıq sağlamlığı məhdud olan uşaqlar da öz hüquqlarını bilir, tələb edir, cəmiyyətin bərabərhüquqlu bir üzvü olduqlarını sübut etməyi bacarırlar. Bu təcrübəni illərdir tətbiq edən bir təhsil müəssisəsi kimi əminliklə deyə bilərik ki, xüsusi qayğıya ehtiyacı olan uşaqların elə gözümüzün qarşısındaca pillə-pillə, nəzərəçarpacaq dərəcədə inkişaf edib sinif əlaçılarına çevrilmələrinin, hətta sağ-

lam uşaqlara belə qayğı göstərmələrinin şahidi olmuşuq. Onu da qeyd edək ki, xüsusi qayğıya ehtiyacı olan şagirdlərlə birlikdə təhsil alan sağlam uşaqlar digərlərindən çox fərqlənirlər. Belə ki, onlar daha qayğıkeş, diqqətli, yardımsevər, inanclı, cəmiyyətdə, sosial həyatda olan hər cür qeyri-adiliyi normal qarşılayan şəxsiyyət kimi yetişirlər.

Valideynlərimiz övladlarının təlim-tərbiyəsində yaxından iştirak edir, inklüziv təhsilin icrasında və onun inkişafında onlar müəllim və müəllim köməkçiləri ilə birlikdə əsas aparıcı qüvvəni təşkil edirlər. Bütün uşaqların eyni hüquqlara malik olmaları valideynlər tərəfindən hörmətlə qarşılanır.

Bir də onu qeyd etmək istəyirik ki, inklüziv təhsil məktəbin icma ilə daha sıx dostluq, partnyorluq şəraitində münasibət qurmasına gətirib çıxarar. Bunu biz öz kollektivimizin bu sahədə təcrübəsindən görə bilərik. Dəfələrlə milli və beynəlxalq ekspertlər inklüziv təhsilin gedişi ilə tanış olarkən məhz bu işin qurulmasının, icmanın məktəbə marağının artmasının şahidi olduqlarını vurğulayıblar.

Layihə çərçivəsində pedaqoji kollektivin üzvləri bir neçə beynəlxalq səviyyəli konfrans və seminarların iştirakçısı olaraq Şotlandiya, Rusiya, Litva, Ukrayna kimi dövlətlərdə bu istiqamətdə olan təcrübəni öyrəniblər.

Pedaqoji kollektivin məqsədyönlü işinin nəticəsi kimi qeyd etməliyik ki, inklüziv təhsil təkcə yaşıdlarından hansısa səbəbdən geri qalan uşaqları deyil, məktəbin bütün şagirdlərini əhatə edir. 8 il öncə bu münasibətlə valideynlərin yalnız bir hissəsi razılaşırdısa, hazırda əksəriyyət bu fikirdədir. Deməli, bu gün deyə bilərik ki, inklüziv təhsilin əsas məqsədinə - müasir dövrdə psixofiziki inkişafında fərqlənən uşaqların hüquqlarının tanınması, onlara dövlət və cəmiyyət tərəfindən yeni baxışın formalaşmasına az da olsa nail oluruq.

İnklüziv təhsilə başladığımız dövrdə əsasən iki problemlə üzləşirdik: məktəb pedaqoji kollektivinin psixoloji problemi (Bunun öhdəsindən biz gələ bilərikmi?), adi uşaqlar və onların valideynlərinin problemi (Biz kimlə oxuyuruq? Bizim övladımız necə uşaqlarla oxuyur?). Bu gün ürəklə qeyd edə bilərik ki, bu iki problem öz həllini tapıb. Bu gün soruşsalar ki, inklüziv təhsil bizim kollektivə nə verdi, cavabımız bu olar ki, biz icmanın, valideynlərin hörmətini qazandıq, belə bir böyük 2 problemin öhdəsindən gəldik.

Müasir dövrdə xüsusi təhsilin sistemi tamamilə dəyişir, cəmiyyətin, dövlətin bu sahəyə diqqəti zaman-zaman artır. Bu mənada müəllim əməyinin, müəllim hazırlığının əhəmiyyəti, şübhəsiz ki, böyükdür.

Möhtərəm Prezidentimiz cənab İlham Əliyevin dediyi kimi, təhsil sisteminin səmərəliliyində, onun nailiyyətlərinin formalaşmasında müəllim amilinin həlledici əhəmiyyətini nəzərə almaqla müəllim hazırlığının gücləndirilməsinə xüsusi önəm veriləcəkdir. Bütün ümumi təhsil müəllimləri üçün fəal (interaktiv) təlim texnologiyaları və inklüziv təhsil üzrə məqsədli ixtisasartırma təmin ediləcək.

Bu sistemin mükəmməlliyi biz müəllimlərdən çox asılıdır. Hesab edirik ki, pedaqoji kollektiv inklüziv təhsillə bağlı ideyalarını digər təhsil müəssisələri ilə paylaşmalıdır. Bu ideyaların bəyənilməsi istiqamətində iş qurulmalıdır. Bundan əlavə, pedaqoji kollektiv məktəbin yerləşdiyi ərazidə fiziki və sosial maneələrə rast gələn uşaqlar haqqında məlumatlı olmalıdır, beləliklə, icma ilə bərabər gələcəkdə bu cür uşaqların cəmiyyətə inteqrasiya məsələsi heç bir hüquq pozuntusu olmadan həyata keçirilməlidir. Bu isə, öz növbəsində, Uşaq Hüquqları Konvensiyasından irəli gələn

öhdəliklərin bütün şagirdlərə eyni dərəcədə şamil edilməsi məsələsini hər bir pedaqoji kollektiv qarşısında qoyacaqdır.

Lakin zaman keçdikcə başa düşürük ki, yeni problemlərlə üzləşməli oluruq. Onların bəzilərini sizin diqqətinizə çatdırmaq istərdik.

Əvvəla, belə uşaqların adaptasiya dövrü çətin yaşanır. Bu zaman defektoloqlara, psixoloqlara böyük ehtiyac yaranır. Eyni zamanda ixtisaslaşmış müəllim köməkçiləri də azlıq təşkil edir. Bundan əlavə, bu uşaqlar üçün məktəbdə xüsusi şəraitin olmasının vacibliyini və sosial işçilərə olan tələbatı da qeyd etmək istərdik. Xüsusilə texniki təminatın olmaması da qarşımıza çıxan problemlərdəndir. Yeni tikilən tədris binalarında bu kateqoriyadan olan uşaqların xüsusiyyətləri nəzərə alınmalıdır. Vurğulayaq ki, cəmiyyətdə inklüziv təhsil az təbliğ olunur. Belə ki, valideynlər arasında maarifləndirmə baxımından böyük işlər görülməsinə ehtiyac duyulur. Onlara düzgün məlumatın verilməsi, eyni zamanda bu mövzunun kütləvi informasiya vasitələri tərəfindən işıqlandırılması, valideynlərdə, ümumiyyətlə, cəmiyyətimizdə yanlış təsəvvürlərin yaranmasının qarşısının alınması və bu yöndə aparılan işlərə xüsusi diqqətin ayrılması vacib məsələlərdəndir.

Fənn standartları, kurikulumlar və dərsliklərin hazırlanması zamanı inklüzivliyin nəzərə alınmaması da müəyyən çətinliklər yaradır.

İlkin müəllim hazırlığı və ixtisasartırma kursları zamanı inklüziv təlimin öyrədilməsi də məqsədəuyğun olardı.

Çıxışımı Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev cənablarının 29 dekabr 2012-ci il tarixli Fərmanı ilə təsdiq edilmiş "Azərbaycan 2020: Gələcəyə baxış" İnkişaf Konsepsiyasından müasir təhsil sistemi ilə bağlı fikirlərlə bitirmək istəyirəm.

"12 illik ümumi təhsil sisteminə keçid təmin ediləcək, bununla əlaqədar şagirdlərin idrak fəallığını, ümumi inkişafını ləngidən mövcud "yaddaş məktəbi"ndən "təfəkkür və düşüncə məktəbi"nə keçidin təmin olunması məqsədi ilə sistemli tədbirlər görüləcəkdir. Tam orta təhsil səviyyəsində təhsil təmayüllər üzrə təşkil olunacaq, istedadlı uşaqlar üçün inkişafetdirici fərdi proqramlar yaradılacaqdır. Eyni zamanda, xüsusi qayğıya ehtiyacı olan, sağlamlıq imkanları məhdud uşaqlar üçün də müxtəlif inkişafetdirici, korreksiyaedici inklüziv təhsil proqramları tətbiq ediləcəkdir".

Diqqətinizə görə təşəkkür edirəm.

# BAKI ŞƏHƏRİ “ZƏNGİ” LİSEYİNİN TARİX MÜƏLLİMİ TALEH ŞAHBAZOVUN ÇIXIŞI

Hörmətli qurultay iştirakçıları!

Bu mötəbər tədbirdə iştirakımdan böyük fəxr duyaraq gənc müəllimlər adından sizi salamlayır, çətin və şərəfli işinizdə uğurlar arzu edirəm.

Sirr deyil ki, insanın şəxsiyyət və vətəndaş kimi formalaşmasında, onun təhsil və inkişafında müəllimin rolu danılmazdır. Görkəmli alim Nəsirəddin Tusi “Əxlaqi - Nasiri” əsərində müəllim peşəsinə yüksək qiymət verərək yazmışdır: “Varlıqları ən aşağı dərəcədən kainatın ən şərəfli mərtəbəsinə qaldıran sənətdən daha şərəflisi nə ola bilər?”. Zəmanəsinin dahi şəxsiyyəti Mustafa Kamal Atatürk müəllim amilinə son dərəcə böyük önəm verərək demişdir: “Milləti yalnız və yalnız müəllimləri xilas edə bilər”. Ulu öndər Heydər Əliyev də “Müəllim adı ən yüksək addır. Mən yer üzündə müəllimdən yüksək ad tanımıram” demişdir.

Müəllim haqqında zaman-zaman deyilmiş bu fikirlər göstərir ki, dövründən asılı olmayaraq, həmişə əsl müəllim milli sərvət kimi qəbul edilmişdir. Müəllimlik yeganə peşədir ki, həyatda onun heç bir alternativi yoxdur. Zaman keçəcək, cəmiyyət və həyat daha yüksək inkişaf mərhələsinə çatacaq, lakin müəllim peşəsi yenə də bütün peşələrin zirvəsində dayanacaqdır.

İnsanlar nə üçün çox çətin olan müəllim peşəsini seçirlər? Fikrimcə, bu sualın əsl müəllimlərin sayı qədər cavabı vardır. Lakin aydın olan odur ki, həmin insanlar müəllim kimi doğulurlar, sonradan onu arzu edirlər və talelərini bu peşəyə bağlayırlar. Təsadüfi deyildir ki, əsl müəllimlər üçün başqa peşə olmur, onlar heç bir zaman öz peşələrini dəyişə bilmirlər.

Xalq arasında belə bir fikir də mövcuddur ki, müəllim cəmiyyətin güzgüsüdür. Bu onunla bağlıdır ki, insanların fikir və düşüncələrinin, həyata baxışlarının formalaşmasında, dəyişməsində müəllim müstəsna rol oynamaqla bütün cəmiyyətin şüurunda dəyişiklik etmək gücünə malikdir. Bu səbəbdən peşəkar kompetensiyalara malik müəllimlərin seçilməsi Təhsil Nazirliyinin əsas strateji hədəflərindən biridir.

Son dövrlərdə təhsil sahəsində atılan ən uğurlu addımlardan biri müəllimlərin işə qəbulunun mərkəzləşdirilmiş müsabiqə yolu ilə həyata keçirilməsidir. Heç şübhəsiz ki, insanların peşə seçərkən rəhbər tutduqları əsas prinsiplərdən biri gələcəkdə işlə təmin edilmə şansının hansı dərəcədə olmasıdır. Artıq müəllimlik peşəsinə yiyələnmək istəyən hər bir şəxs işlə təmin olunub-olunmamasının özündən asılı olduğunu anlayır. Bu isə həmin şəxsin məsuliyyətini daha dərindən dərk etməsinə şərait yaradır və onun özünə inamını artırır. İşə qəbulun belə bir formada həyata keçirilməsi ixtisasını dərindən bilməyən, pedaqoji biliklərə kifayət qədər yiyələnməyən müəllimlərin məktəbə daxil olmasının qarşısını alır. Yeni işə qəbul olunmaq istəyən müəllimlərin bu sistemə olan marağının artmasının əsas səbəblərindən biri də müsabiqənin tam şəffaf, ədalətli və elektron vasitələrin geniş tətbiqi ilə həyata keçirilməsidir. Müsabiqədə iştirak üçün elektron ərizə verənlərin sayının hiss olunacaq dərəcədə artması şəffaflığın doğurduğu inamın nəticəsidir.

Mən də bu müsabiqədən keçərək Lerik rayonunun ucqar dağ kəndində 4 il müəllim işləmişəm. Hökumətin qərarına əsasən hə-

vəsləndirmə tədbirlərindən yararlanmışam. Xüsusi vurğulamaq istəyirəm ki, o illər mənə çox şey qazandırmış, özümə inam yaratmışdır. Üzümü gənc müəllimlərə tutub deyirəm ki, ilk təcrübə üçün rayon və kənd məktəblərini seçsinlər, bu zəiflik əlaməti deyil, gələcək uğurların başlanğıcı və vətənpərvərlik hissinin bariz nümunəsidir.

Məlum olduğu kimi, hələ də respublikamızın ucqar kənd məktəblərində müəllim çatışmazlığı müşahidə olunur. Bu gün həmin məktəblərdə təhsil alan şagirdlərin gözü yoldadır. Onların bizim kimi gənc müəllimlərə ehtiyacı vardır. İnsan o vaxt xoşbəxt olur ki, o, kiməsə gərəkli olsun. Ən böyük xoşbəxtlik isə xalqa, vətənə layiqincə xidmət etməkdir. Ona görə də bu gün bu yüksək tribunadan bütün gənc müəllimləri ucqar kənd məktəblərində işləyərək vətənpərvərlik borcunu yerinə yetirməyə çağırıram.

Fürsətdən istifadə edərək bir məqamı da diqqətə çatdırmaq istərdim. Ucqar məktəblərin kadr təminatı probleminin həlli yollarından biri də gənc müəllimlər üçün nəzərdə tutulan həvəsləndirmə tədbirlərinin əhəmiyyətli dərəcədə gücləndirilməsidir.

Onu da vurğulamaq istərdim ki, Təhsil Nazirliyinin biz müəllimlər üçün yaratdığı əlverişli imkandan istifadə edərək cari ildə müsabiqədə yenidən iştirak etdim və ən yüksək göstərici ilə Bakı şəhərindəki "Zəngi" liseyinə işə qəbul olundum.

Hörmətli qurultay iştirakçıları!

Ölkə Prezidentinin Sərəncamı ilə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın təsdiq edilməsi təhsil tariximizdə ən əhəmiyyətli hadisədir. Strategiyadakı hədəflərdən biri və ən vacibi təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuzlu təhsilverənlərin formalaşdırılmasıdır.

Bizim üçün əhəmiyyətlidir ki, həyata keçiriləcək tədbirlər nəticəsində müəllimlərin peşəkarlıq səviyyəsinin daim yüksəlməsini təmin edən yeni sistem yaradılacaq, təhsil müəssisəsi səviyyəsində, tədrisdən ayrılmadan peşəkarlıq səviyyəsinin artırılması üzrə innovativ modellər tətbiq ediləcək, artıq tətbiqinə başlanılmış modul-kredit və rəqabətəsaslı təlimlər sisteminin inkişaf etdirilməsi və müəllimlərin peşəkarlıq səviyyəsinin davamlı şəkildə yüksəldilməsi təmin ediləcəkdir.

Rəqabət mühiti yaradan, peşəkar təlimçilər komandasının formalaşdırılmasını nəzərdə tutan, ehtiyaca uyğun proqram seçiminə imkan verən yeni ixtisasartırma modeli müəllimlərə XXI əsr bacarıqları adlandırılan təlim və innovasiya, həyat və peşəkarlıq bacarıqları kimi universal bacarıqların aşılanmasına xidmət edəcəkdir.

Ən əhəmiyyətli cəhətlərdən biri də odur ki, müəllim peşəsinin itirilmiş nüfuzu bərpa ediləcək, bu sahədə dövlət siyasəti inkişaf etdirilməklə səriştə və nəticə əsaslı diferensiallaşdırılmış, əmək bazarında rəqabətqabiliyyətli əməkhaqqı sistemi yaradılacaq, müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması üzrə kompleks tədbirlər həyata keçiriləcək.

Müəllim hazırlığı sistemində internatura modelinin tətbiqi nəticəsində peşəkar kompetensiyalara, praktik bacarıqlara malik müəllimlər hazırlanacaq, ümumilikdə pedaqoji kadr hazırlığı beynəlxalq təcrübə nəzərə alınmaqla həyata keçiriləcək.

Etiraf edim ki, ali məktəbdə təhsil aldığım dövrdə bu məsələlərə o qədər də diqqət yetirilmirdi. Pedaqoji təcrübə bir çox hallarda formal keçirilirdi. İnternatura modelinin tətbiqi, müəllimliklə bağlı praktik vərdişlərin aşılanması üçün qismən əmək-

haqqı ödənilən bir illik təcrübənin bilavasitə məktəblərdə, xüsusilə ciddi ehtiyac olan ucqar kənd məktəblərində keçirilməsi daha məqsədəmüvafiq olardı.

Hörmətli qurultay iştirakçıları!

Ölkə Prezidentinin qayğısı nəticəsində son illərdə təhsil infrastrukturu əsaslı şəkildə yeniləşdirilib, məzmun, dərsliklər, qiymətləndirmə sistemi sahəsində nailiyyətlər əldə olunub. Bütün bunlar keyfiyyətə təsir edən amillərdir. Lakin etiraf etmək lazımdır ki, müəllim peşəkarlıq baxımından dəyişmədən təhsil sahəsində uğurlu islahatlar aparmaq, yüksək nəticələr əldə etmək mümkün deyildir. Məhz bu səbəbdən bu gün qarşıda duran əsas vəzifə təhsil müəssisələrində işləyən bütün müəllimlərin peşəkarlığının artırılması, onlara müvafiq bacarıqların verilməsidir. Onu da qeyd etmək lazımdır ki, həmin müəllimlər arasında müasir kompetensiyalara malik olmayan, köhnə qaydalarla, səmərəsiz metodlarla işləyənlər də az deyildir.

Bütün bunlar müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsi sahəsində beynəlxalq təcrübəyə uyğun yeni mexanizmlərin tətbiqini zəruri etmiş, Dövlət Strategiyasında müəllimlərin fəaliyyətinin sertifikatlaşdırılması (lisenziyalaşdırılması) nəzərdə tutulmuşdur.

Hörmətli qurultay iştirakçıları!

İnanıram ki, Dövlət Strategiyasına əsasən müəllim hazırlığı və onların peşəkarlığının inkişafı sahəsində həyata keçirilən tədbirlər ölkəmizdə müəllim nüfuzu və statusunun yüksəlməsinə, son nəticədə isə təhsilin keyfiyyətinin əhəmiyyətli dərəcədə artmasına birbaşa təsir edəcəkdir.

Diqqətinizə görə təşəkkür edirəm.

# ŞUŞA RTŞ METODKABİNETİNİN MÜDİRİ RƏSMİYYƏ MƏMMƏDOVANIN ÇIXIŞI

Hörmətli qurultay nümayəndələri!

Hörmətli qonaqlar!

Müstəqil Azərbaycan dövlətinin qurucusu, dünya azərbaycanlılarının ümummilli lideri, dahi şəxsiyyət Heydər Əliyevin adını daşıyan bu möhtəşəm Mərkəzdə keçirilən Azərbaycan müəllimlərinin XIV qurultayında çıxış etmək üçün mənə söz verildiyinə görə hədsiz qürur və sevinc hisləri keçirirəm.

Qurultayımız Azərbaycan təhsilinin taleyüklü problemlərinin həll olunduğu mühüm bir dövrə təsadüf edir. Möhtərəm Prezidentimiz İlham Əliyevin Sərəncamı ilə təsdiq edilmiş tarixi əhəmiyyətə malik "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" sənədində getdikcə qloballaşan müasir dünyamızda təhsilin prioritetliyi və müstəsna rolu bir daha təsdiqlənməklə XXI əsr Azərbaycan təhsilinin inkişaf istiqamətləri uzaqgörənliklə müəyyənləşdirilmişdir.

Biz hamımız hörmətli nazirimiz Mikayıl Cabbarovun qurultay iştirakçılarına ünvanlanan analitik təhlil üzərində qurulmuş dərin məzmunlu məruzəsini diqqətlə dinlədik. Heç şübhəsiz, bu məruzə ümumi ruhu və mahiyyəti ilə yerli təhsil orqanları və təhsil müəssisələrinin rəhbərləri, bütövlükdə hər bir təhsil işçisi üçün perspektiv proqram xarakteri daşıyır.

Hörmətli qurultay iştirakçıları!

Dövr və zamanın tələblərinə görə ümumi təhsilin qarşısında duran məqsəd və vəzifələr bu və ya digər dərəcədə dəyişsə də bütün dövrlər üçün bir məqam dəyişilməz qalmaqdadır. O da ülvi məqsədlərin ən alisi sayılan uşaq və gənclərin vətənpərvərlik və vətəndaşlıq tərbiyəsidir.

Ulu öndər Heydər Əliyev təhsilə, təhsilin aktual problemlərinə həsr olunmuş konseptual səciyyə daşıyan çıxış və nitqlərində böyüməkdə olan gənc nəslin vətənpərvər ruhda tərbiyə edilməsini daim ön plana çəkir, bu nəcib amalı təhsilin başlıca vəzifəsi kimi dəyərləndirirdi. Hesab edirəm ki, bu məqamda ulu rəhbərimizin bütün təhsil işçilərinə örnək olan çoxsaylı müdrik fikirlərindən bir neçəsini xatırlatmaq yerinə düşərdi. Ulu öndər deyirdi: "Təhsilimizin ən böyük məqsədi Azərbaycan vətəndaşı hazırlamaqdır, müstəqil Azərbaycan cəmiyyətinin ləyaqətli üzvünü hazırlamaqdır. Məktəbdə vətənpərvərlik tərbiyəsi işini təkmilləşdirmək, onun forma və metodlarının rəngarəngliyinə çalışmaq, yüksək səmərəliliyinə nail olmaq lazımdır. Hər bir gənc vətəndaş öz ölkəsinin alovlu vətənpərvəri olmalıdır".

Dahi Heydər Əliyev siyasi-ideoloji kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ölkəmizin ictimaiyyətinə müraciətlə söylədiyi "Biz istəyirik ki, gənc nəsil bilikli, savadlı olsun, eyni zamanda vətənpərvərlik ruhunda tərbiyə alsın...Vətənə bağlılıq, Vətən sevgisi mütləq yüksək səviyyədə olmalıdır. Ümid edirəm ki, bizim bütün məktəblərimizdə vətənpərvərlik mövzusu daim gündəlikdədir. Vətənə bağlılıq, sevgi, peşəkar və yüksək biliyə malik olmaq - bunlar ölkəmizi qabağa aparacaqdır" müddəası, heç şübhəsiz, müasir dövrdə təhsilimizin məqsədinin və fəlsəfi mahiyyətinin parlaq ifadəsidir.

Ulu öndərin adını daşıyan Heydər Əliyev Fondunun prezidenti, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın vətənimizin tarixinə həssas münasibəti xüsusi qeyd olunmalıdır. Mehriban xanım Əliyeva ölkəmizdə və dünyada mədəniyyətə, idmana

qayğı ilə yanaşan, elm, təhsil, səhiyyə sahələrində respublikada və beynəlxalq miqyasda böyük işlər görən bir insan kimi tanınır.

Heydər Əliyev Fondunun təşkil etdiyi və 2009-cu ildən keçirilən respublika muğam müsabiqəsi və Beynəlxalq Muğam Festivalı həm Azərbaycanda muğam sənətinə üz tutan gənclərin sayını artırıb, həm də milli muğam musiqimizi dünyaya tanıdıb. Mehriban xanım Əliyevanın maddi və qeyri-maddi mədəni dəyərlərimizin bərpası, qorunması və təbliği sahəsində zəngin və hərtərəfli fəaliyyəti vətənə, xalqa məhəbbətin bariz nümunəsidir.

Hörmətli qurultay iştirakçıları!

2013-2014-cü dərs ili hamımız üçün əlamətdar, yaddaqalan bir hadisə ilə başladı. Bu dərs ilindən etibarən məktəblərimizdə ilk dərsin “Mənim Vətənim-doğma yurdum” mövzusuna həsr edilməsinə dair hörmətli nazirimizin əmri uşaq və gənclərdə vətənpərvərlik əzminin və Vətən təəssübünün gücləndirilməsi amilinin heç bir vaxt aktuallığını itirməyən taleyüklü vəzifə olduğunu təhsil ictimaiyyətinə bir daha xatırlatdı.

Hörmətli qurultay iştirakçıları!

Mən bu əlamətdar tədbirdə Şuşa rayonunu təmsil edənlər sırasındayam. Məcburi köçkünlük həyatı yaşamaq bəlkə də maddi tərəfdən deyil, daha çox mənəvi cəhətdən ağırdır. Bizlərə ruh verən, ölkəmizdə hökm sürən coşqun fəaliyyət tempindən kənarda qalmamağa sövq edən əsas amil dövlət başçımız cənab İlham Əliyev tərəfindən işğal altında olan torpaqlarımızın düşmən ünsürlərdən azad edilməsi uğrunda məqsədyönlü və ardıcıl tədbirlərin həyata keçirilməsi, bu yolda göstərdiyi qətiyyət və siyasi uzaqgörənlikdir. Möhtərəm Prezidentimizin yürütdüyü dinamik siyasət nəticəsində ölkəmizin iqtisadi qüdrətinin ilbəil artması, milli ordumuzun durmadan güclənməsi, Azərbaycanın beynəlxalq aləmdə siyasi nüfuz dairəsinin getdikcə genişlənməsi düşmən üzərində qələbəmizi, doğma Qarabağımızın azad ediləcəyi anı günbəgün yaxınlaşdırır. Belə bir şəraitdə, ölkəmizin yağı düşmənlə üz-üzə durduğu bir vəziyyətdə gənclərimizin vətənpərvərlik ruhunda tərbiyəsinin prioritet mahiyyət daşıması inkaredilməz həqiqət kimi meydana çıxır.

Bu gün ümumi təhsilin məzmun istiqamətlərini şərtləndirən didaktik prinsiplərdən danışılarkən onun nəticəyönlü və tələbatyönlü olması ilə yanaşı, həm də şəxsiyyətyönlü keyfiyyəti ön plana çəkilir. Əlbəttə, şəxsiyyətin bütövlüyünü təyin edən çox amillər mövcuddur, lakin onların arasında ən vacibi Vətənə, doğma torpağa bağlılıq xüsusiyyətidir. Güman edirəm ki, görkəmli şairimiz Abbas Səhhətin ürəkləri riqqətə gətirən “Vətəni sevməyən insan olmaz, olsa ol şəxsdə vicdan olmaz” misraları, əslində, bütün dövrlər üçün danılmaz həqiqət, əbədi çağırışdır.

Hazırda təhsilin inkişafı üzrə Dövlət Strategiyasında irəli sürülən tələblərə uyğun olaraq, digər həlli vacib məsələlərlə bərabər, məktəbəqədər və ümumi təhsilin dövlət standartlarının və fənn kurikulumlarının təkmilləşdirilməsi və yeniləşdirilməsi istiqamətində işlərə başlanmışdır. Elə bilirəm ki, bu sənədlər hazırlanarkən istər məktəbəqədər, istərsə də ümumi təhsilin məzmununda vətənpərvərlik komponentinin daha da gücləndirilməsi diqqət mərkəzinə çəkilməlidir. Eyni zamanda bütün fənlərin, xüsusilə Azərbaycan tarixi, coğrafiya, ədəbiyyat fənlərinin məzmununda vətənpərvərlik tərbiyəsinin mühüm tərkib hissəsi olan milli iftixar hissinin şagirdlərə təlqin edilməsi ciddi nəzərə alınmalıdır.

Həm də sirr deyil ki, şagirdlərin bir çoxu əksər hallarda yaşadıqları ərazidən kənara çıxmaq imkanına malik olmadıqlarından ölkəmizin ayrı-ayrı bölgələri, bu bölgələrdəki flora və fauna, mədəni abidələr, ta-

* 4

rixi məkanlar haqqında təsəvvürləri məhdud olur. Halbuki Vətənin özəlliklərini öz gözləri ilə görmək, onun gözəllikləri ilə mənəvi təmasda olmaq şagirdlərdə böyük ruh yüksəkliyi, iftixar hislərinin yaranmasında mühüm amildir. Ona görə də ümumtəhsil məktəblərinin tədris planlarına məqsədli ekskursiyaların daxil edilməsi və bu tədbirlərin təşkili üçün maliyyə imkanlarının axtarılması məqsədəuyğun olardı.

Bu yerdə bir məqamı xatırlatmaq istərdim. Bir neçə il bundan əvvəl Təhsil Nazirliyinin təşəbbüsü ilə ümumtəhsil məktəblərinin şagirdləri arasında "Mən Vətənim, yaşadığım şəhər (kənd, qəsəbə) haqqında nələri bilirəm" mövzusunda inşa müsabiqəsi keçirilmişdi. Bu əhəmiyyətli bir tədbir idi, həm də ona görə ki, şagirdləri tədqiqatlar aparmağa sövq edirdi. O vaxt bu inşaların nəticələrinə görə məlum olmuşdu ki, şagirdlərin bir çoxu hətta öz yaşadıqları yerin tarixi, coğrafiyası və digər özəllikləri barədə dolğun təsəvvürə malik deyillər. Bu, əlbəttə, düşündürücü bir haldır və güman edirəm ki, maarifləndirmə xarakteri daşıyan bu tipli tədbirlərin və layihələrin gələcəkdə davam etdirilməsi çox vacibdir. Həm də təklif edərdim ki, xüsusi bir layihə çərçivəsində ölkəmizin hər bir bölgəsinin tarixini, coğrafiyasını, flora və faunasını, mədəni abidələrini, görkəmli şəxsiyyətlərini əhatə edən təlim materiallarının hazırlanması işi təşkil olunsun və fakültativlər formasında məktəblərdə tədris edilsin. Bu, bütün şagirdlər, xüsusilə də məcburi köçkün rayonlarının şagirdləri üçün müstəsna əhəmiyyət kəsb edərdi.

Gənclərimizin vətənpərvərlik tərbiyəsi, şübhəsiz, bir çox amillərlə əlaqədardır. Yəqin hamı razılaşar ki, tərbiyə işi sahəsində şəxsi nümunə müstəsna əhəmiyyət kəsb edir. Vətənpərvərlik hissi öz-özünə yaranmır, bunu nəsihət hesabına etmək çox çətindir. Təlimdə əyanilik necə mühüm rola malikdirsə, tərbiyəolunma sisteminin düzgün qurulmasında da fərdi nümunə bir o qədər əhəmiyyətlidir. Bu mənada biz gənclərimizi görkəmli şəxsiyyətlərimizin, Vətən uğrunda qəhrəmanlıq göstərənlərin timsalında tərbiyə etməliyik. Milli Qəhrəmanımız Mübariz İbrahimovun qısa, lakin şərəfli həyat yolu vətənini, millətini, xalqını sevən hər bir Azərbaycan gənci üçün örnək olmalıdır. Mübariz İbrahimov bütün Azərbaycan gəncliyinə nümunədir.

Bəlkə də bu hələlik bir arzudur, ancaq bir anlıq təsəvvür edəndə ki, şagirdlər hər gün məktəblərin qarşısında Vətən uğrunda döyüşlərdə canlarını qurban vermiş insanların şərəfinə qurulan rəmzi əbədi məşəl abidəsinin önündən keçib onların xatirəsini yad etməklə məktəbə daxil olurlar, hesab edirəm ki, onlar üçün bundan ibrətamiz və duyğulu mənzərə ola bilməz.

Hörmətli qurultay nümayəndələri!

Fürsətdən istifadə edərək bir məsələyə toxunmaq istəyirəm. Məlumdur ki, vətənpərvərlik tərbiyəsində kütləvi informasiya vasitələrinin rolu müstəsna əhəmiyyət kəsb edir. Çox arzu edərdik ki, xüsusilə televiziya kanallarında gənclərimizin mənəvi tərbiyəsinə, vətənpərvərlik tərbiyəsinə həsr olunmuş verilişlərin sayı üstünlük təşkil etsin. Elə bilirəm, çoxlarının fikrini ifadə etmiş olaram ki, dırnaqarası reytinq gətirən bəzi verilişlərin gənclərimiz üçün heç bir əhəmiyyəti yoxdur.

Çıxışımın sonunda tam əminliyimi bildirmək istəyirəm ki, Azərbaycan dövlətinin, dövlətimizin başçısı cənab İlham Əliyevin müntəzəm diqqət və qayğısı sayəsində Azərbaycan təhsili durmadan inkişaf edəcək, dünya təhsil sistemində öz layiqli yerini tutacaqdır.

Diqqətinizə görə təşəkkür edirəm.

# "ERNST & YANG HOLDİNQS (SİAYES) Bİ.Vİ." ŞİRKƏTİNİN AZƏRBAYCAN ÜZRƏ İDARƏEDİCİ TƏRƏFDAŞI İLQAR VƏLİYEVİN ÇIXIŞI

Hörmətli sədarət!

Hörmətli qurultay iştirakçıları!

İlk öncə sizin qarşınızda çıxış etməyə imkan verdiklərinə görə tədbirin təşkilatçılarına təşəkkürümü bildirmək istəyirəm. Mən biznes aləminin təmsilçisiyəm və ilk baxışdan təhsil sahəsi ilə birbaşa əlaqəm yoxdur. Çoxunuzda belə sual yarana bilər ki, niyə məhz mən bu tribunada çıxış etmək şərəfinə layiq görülmüşəm. Burada olmağımın bir neçə səbəbi var. Birincisi odur ki, mən özüm iki övladın valideyniyəm. Və onların təhsilinə və böyüməsinə laqeyd qala bilmərəm. Mən hesab edirəm ki, valideynlər məktəb həyatına daha fəal cəlb olunmalıdırlar. Keyfiyyətli təhsil almış layiqli vətəndaşın yetişdirilməsi yalnız məktəbin yox, daha çox valideynlərin məsuliyyətidir. Valideyn özü bir müəllim olmalıdır. Biz valideynlər övladlarımız qarşısında düzgün prioritetlər qoymalıyıq. Övladlarımızın məktəbə motivasiyası və yanaşması həmin prioritetlərdən çox asılıdır. Eyni zamanda hesab edirəm ki, effektiv və şəffaf fəaliyyət göstərən valideyn-müəllim-şagird icmaları yaradılmalıdır. Bu, valideynlər və məktəb arasında sıx əməkdaşlığa bir addım olacaqdır. Son vaxtlar bu istiqamətdə mühüm işlər görülür və mən ümid edirəm ki, yaxın gələcəkdə biz sizinlə bunun nəticələrini görəcəyik.

Hörmətli müəllimlər!

Mən eyni zamanda bir valideyn kimi yox, bir biznes təmsilçisi kimi də sizə müraciət etmək istəyirəm. Mən beynəlxalq audit və konsaltinq şirkətinin Azərbaycan üzrə rəhbəriyəm. Biz hər il onlarla gənc mütəxəssisi işə qəbul edirik. İnanın ki, işə qəbul edilən işçilərin dərin biliklərə sahib olması hər bir şirkət üçün çox vacib bir amildir. Və burada söhbət yalnız nəzəri biliklərdən yox, daha çox praktik, peşəkar biliklərdən gedir. Qeyd etmək istərdim ki, gələcək peşəkarların hazırlanması üçün bütün məsuliyyət yalnız təhsil sisteminin üzərinə düşməməlidir. Bu sahədə biznesin də öz vəzifəsi və məsuliyyəti var. Bütün dünyada, o cümlədən Azərbaycanda biznesin cəmiyyət qarşısında sosial məsuliyyəti konsepsiyası getdikcə geniş yayılır. Mən bu konsepsiyanın böyük tərəfdarıyam və hesab edirəm ki, biz təhsil müəssisələri ilə daha sıx əməkdaşlıq etməliyik. İşəgötürənlə işçi arasında münasibət əmək kitabçasında yazılışdan başlamamalıdır. O əslində təhsil ocağının divarlarında bir müddət bundan öncə başlamalıdır. Hazırkı dövrdə respublikamızda həyata keçirilən uğurlu siyasət nəticəsində iqtisadiyyatımız çox sürətlə inkişaf edir. Bu səbəbdən işçilərə olan tələbat da çoxalır. Təhsil müəssisələri bazarın tələblərinə cavab verən peşəkarlar hazırlamalıdırlar. Biznes qurumlarının qarşısında isə təhsil ocaqlarına konkret tələbatı çatdırmaq vəzifəsi durur. Bununla bağlı ideyalarımız çoxdur. Amma vaxt məhdud olduğuna görə bunlardan yalnız bir qismini sadalamaq istərdim. Mən təhsil nazirinin çıxışında səslənən bir fikri çox dəstəkləyirəm. Qabaqcıl şirkətlərin aparıcı mütəxəssislərini tədris prosesinə cəlb etmək lazımdır. Bu, çox vacib bir faktordur. Tələbələr üçün keyfiyyətli və aktual təcrübə proqramları yaratmaq lazımdır və s.

Hörmətli müəllimlər!

Çıxışımın sonunda mən sizə dərin təşəkkürümü bildirmək istəyirəm. İşinizdə olan çətinliklərə baxmayaraq siz öz peşənizə, daim sadiq qalmısınız. Çünki müəllimlik, mənim fikrimcə, adi bir peşə deyil. Müəllimlik insanın üzərinə düşən ən şərəfli missiyalardan biridir. Sizə çətin və şərəfli işinizdə uğurlar arzu edirəm.

Diqqətinizə görə çox sağ olun.

# AZƏRBAYCAN MÜƏLLİMLƏRİNİN XIV QURULTAYININ QƏTNAMƏSİ

Azərbaycan müəllimlərinin XIV qurultayı müasir təhsil salnaməsinə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda göstərilən istiqamətlər üzrə qarşıya qoyulan hədəflərə çatmaq yollarının müəyyən olunduğu, təhsil quruculuğunda yeni mərhələyə start verildiyi əlamətdar bir tədbir, yaddaqalan hadisə kimi daxil olur.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin qurultaya təbrik məktubu dövlət başçısının təhsil sisteminə və təhsil işçilərinə göstərdiyi diqqət və qayğının parlaq təzahürü olmaqla yanaşı, müasir təhsil quruculuğunun aydın sabahına və uğurlu gələcəyinə nikbinlik duyğuları yaradır.

Azərbaycan Respublikası təhsil nazirinin məruzəsində Dövlət Strategiyasının məzmunu, məqsədi, islahatın əsas strateji istiqamətləri, qarşıya qoyulan strateji hədəflər və tədbirlərin reallaşdırılması yolları aydınlaşdırılmış, təhsil islahatının perspektiv üçün əsas fəaliyyət istiqamətləri dəqiq müəyyənləşdirilmişdir.

Qurultay Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin təbrik məktubunda irəli sürülən konseptual müddəaları və ideyaları müasir təhsil quruculuğunda əsas proqram sənədi kimi qəbul edərək məruzədə qarşıya qoyulan vəzifələri, eləcə də məruzə ətrafındakı çıxışlarda səslənən təklifləri nəzərə alaraq qeyd edir ki, son illərdə təhsil sahəsində nəzərəçarpan uğurların əldə olunması bilavasitə ölkənin modernləşməsinə yönəlmiş sosial-iqtisadi siyasətlə bağlı olmuşdur. Ötən dövrdə təhsilin infrastrukturunun müasirləşdirilməsi və təhsilin məzmunca yeniləşdirilməsi istiqamətində önəmli addımlar atılmış, təhsilin informasiyalaşdırılması sahəsində irəliləyişə nail olunmuş, Azərbaycan təhsilinin Avropa təhsil məkanına inteqrasiyası yönündə tədbirlər həyata keçirilmişdir. Lakin buna baxmayaraq, hazırda dünyada gedən proseslərə uyğun təhsildə yeni yanaşmalara tələbat yaranmışdır. Belə ki, hazırda sürətlə inkişaf edən və yayılan informasiya-kommunikasiya texnologiyaları, bununla bağlı geniş vüsət almış qloballaşma prosesləri ölkənin sosial-iqtisadi və mədəni həyatına ciddi şəkildə təsir etməkdədir. Ölkənin İnkişaf Konsepsiyasında deyildiyi kimi, belə bir şəraitdə Azərbaycanın qarşısında duran əsas vəzifələrdən biri dünya ölkələrinin inkişaf sürəti ilə müqayisədə geriliyə yol verməməkdən, iqtisadiyyatın səmərəliliyini və rəqabət qabiliyyətini artırmaqdan, onun innovasiya əsaslı irəliləyişini təmin etməkdən, biliklərə əsaslanan iqtisadiyyatın həlledici amili olan insan kapitalının adekvat inkişafını ön plana çəkməkdən ibarətdir. Bu çağırış ölkəmizdə müasir təhsil sisteminin formalaşdırılmasını tələb edir. Bu baxımdan sürətlə modernləşən Azərbaycanda təhsilin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi üçün yeni, daha təsirli addımların atılmasına ehtiyac vardır.

Qurultay hesab edir ki, təhsilin Dövlət Strategiyası perspektivdə təhsil sahəsində aparılacaq islahatlarda təhsil işçilərinə yol göstərən konseptual sənəd kimi yüksək dəyərləndirilməli, irəli sürülən hər bir ideya təhsil işçiləri tərəfindən dərindən öyrənilməli, onların gerçəkləşdirilməsi yolunda bilik və bacarıqlarını əsirgəməməli, təhsili idarəetmə qurumları isə ölkənin intellektual potensialını bu mühüm dövlət sənədində müəyyənləşdirilmiş strateji hədəflərə çatmağa səfərbər etməlidir.

Qurultay təhsil prosesində məzmunun həlledici amil, təməl prinsip olduğunu vurğulayaraq hesab edir ki, Dövlət Strategiyasında təhsilin məzmunca yeniləşdirilməsinə

müasir yanaşmalar milli mütərəqqi ənənələrə, beynəlxalq təcrübəyə, ölkənin sosial-iqtisadi inkişaf tələblərinə, modernləşmə meyillərinə tamamilə uyğun olaraq səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılmasına yönəlmişdir.

Qurultay tədris prosesində təhsilverənin fenomenal rolunu, insan kapitalının ahəngdar inkişafının müstəqil dövlətçilik fəlsəfəsinin əsas hədəfi olduğunu xüsusi vurğulayaraq qeyd edir ki, aparılacaq islahatlar təhsil prosesində innovativ təlim metodları və texnologiyalarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin formalaşdırılmasına, müəllim peşəsinin nüfuzunun yüksəldilməsinə imkan verəcəkdir.

Qurultay hazırda təhsili idarəetmə sahəsində ciddi problemlərin olduğunu, təhsilin nəticələrinə görə cavabdehliyin artırılması, təhsilin keyfiyyətini ölçən göstəricilər sisteminin təkmilləşdirilməsi, təhsilin maliyyələşdirilməsinin onun keyfiyyətinə yönəldilməsi sahəsində islahatlara ciddi ehtiyac olduğunu xüsusi qeyd edərək bəyan edir ki, Dövlət Strategiyasında yer alan nəticələrə görə cavabdeh, şəffaf və tənzimlənən mexanizmlərə malik, dövlət-ictimai xarakterli və dövlət-biznes əməkdaşlığına əsaslanan təhsildə yeni idarəetmə sisteminin formalaşdırılması istiqamətində atılacaq addımlar Azərbaycan təhsilində idarəetmənin Avropa təhsil standartlarına uyğunlaşdırılmasına güclü təkan verəcək, təhsildə keyfiyyətin yüksəldilməsinə kömək edəcəkdir.

Qurultay təhsil quruculuğunda müasir tələblərə cavab verən infrastrukturun yaradılması və təhsilin maliyyələşdirilməsinin yeni mexanizminin qurulması ilə bağlı Strategiyada yer alan strateji istiqamətlər və hədəflərin ölkənin iqtisadi potensialına söykəndiyini və reallıqları əks etdirdiyini qeyd edərək bildirir ki, göstərilən istiqamətlərdə nəzərdə tutulan islahatların gerçəkləşdirilməsi Azərbaycan təhsilinin inkişaf etmiş ölkələrin təhsil sistemlərinə uyğunlaşdırılmasına, ömürboyu təhsili təmin edən infrastrukturun və təhsilin iqtisadi cəhətdən dayanıqlı yeni maliyyələşdirmə mexanizminin yaradılmasına imkan verəcəkdir.

Qurultay əmin olduğunu bildirir ki, “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın reallaşdırılması təhsilin məzmunu, kadr hazırlığı, təhsili idarəetmə sistemi, təhsilin infrastrukturu və təhsilin maliyyələşdirilməsinin beynəlxalq təcrübəyə və ölkənin İnkişaf Konsepsiyasına uyğun olaraq yenidən qurulmasına imkan verəcək, ölkədə biliklərə əsaslanan iqtisadiyyatın bərqərar olmasını, informasiya cəmiyyətinin təşəkkülünü, ölkənin davamlı və rəqabətqabiliyyətli inkişafını təmin edəcək, müstəqil Azərbaycan Respublikasının dünyanın iqtisadi cəhətdən inkişaf etmiş dövlətləri arasında layiqli yer tutmasına xidmət edəcəkdir.

Qurultay dövlət başçısına qurultay iştirakçılarına ünvanladığı səmimi təbriklərə və xoş sözlərə görə minnətdarlığını, hörmət və ehtiramını bildirir, bu yaxınlarda keçirilən prezident seçkilərində qazandığı möhtəşəm qələbə münasibəti ilə Zati-alilərini səmimi-qəlbdən təbrik edir, müstəqil Azərbaycanın xoşbəxt gələcəyi, təhsilimizin işıqlı sabahı naminə daha böyük uğurlar arzulayır, təhsil işçilərinin hər zaman onun daxili və xarici siyasətini dəstəklədiyini bəyan edir.

Azərbaycan müəllimlərinin XIV qurultayı böyük inam və nikbinliklə bəyan edir ki, ölkəmizin təhsil işçiləri əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulan təhsil quruculuğu prosesini Prezident İlham Əliyevin rəhbərliyi ilə uğurla davam və inkişaf etdirəcək, Strategiyada qarşıya qoyulan bütün hədəflərə çatmağa nail olacaq, müasir təhsil sisteminin qurulması kimi tarixi zəfərə imza atacaqlar.

**Qurultayın qətnaməsini Təhsil Nazirliyi Dərslik və nəşriyyat şöbəsinin müdir müavini Əsgər Quliyev oxudu.**

***Tarixin unudulmaz səhifələrindən***

# ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN AZƏRBAYCAN MÜƏLLİMLƏRİNİN XI QURULTAYINDAKI NİTQİ: XALQIMIZIN TƏHSİLİNİN DAHA DA TƏKMİLLƏŞDİRİLMƏSİ VƏ YÜKSƏKLƏRƏ QALDIRILMASI MÜQƏDDƏS VƏZİFƏMİZDİR

- Əziz müəllimlər, qurultay nümayəndələri!

Hörmətli xanımlar və cənablar!

Mən sizi, müstəqil Azərbaycanın ilk müəllimlər qurultayını, bu qurultayın nümayəndələrini və bu möhtəşəm salona toplaşanların hamısını səmimi-qəlbdən salamlayıram, sizə cansağlığı, səadət arzulayıram.

Mən Azərbaycan müəllimləri qurultayına təbrik məktubu göndərmişəm. O, bu gün mətbuatda dərc olunubdur, siz bununla tanışsınız. O məktubumda mən müəllim haqqında, Azərbaycan müəlliminin tarixi barədə öz fikirlərimi ifadə etmişəm. Ancaq bu gün səhərdən sizinlə bərabər müəllimlər qurultayının iştirakçısı olduğuma və məruzələrinizi, çıxışlarınızı diqqətlə dinlədiyimə görə, buradakı ab-havanı hiss edərək mən bir neçə fikrimi, mülahizələrimi sizə çatdırmaq istəyirəm.

Hesab edirəm ki, müstəqil Azərbaycanın müəllimlər qurultayı uğurla başa çatır və qurultayın qarşısında duran vəzifələr yerinə yetirilir. Müəllimlər qurultayında sərbəst, tam demokratik şəraitdə geniş və gözəl müzakirə, fikir mübadiləsi keçirildi. Bu, məni çox sevindirir. Güman edirəm ki, siz də bu gün buradakı bütün müzakirələrdən razı olmalısınız. Çünki natiqlər istədikləri kimi danışdılar, sözlərini dedilər, fikirlərini bildirdilər və bir çox səmərəli təkliflər irəli sürdülər.

Qurultayın belə sərbəst, açıq, demokratik şəraitdə keçirilməsi müstəqil Azərbaycanda demokratiyanın mövcudluğunu, varlığını və onun inkişaf etdiyini bir daha sübut edir. Hesab edirəm ki, bu gün burada aparılan müzakirə, irəli sürülən fikirlər Azərbaycanda məktəbin, təhsil işinin təkmilləşməsi, mövcud olan nöqsanların aradan qaldırılması, Azərbaycan xalqının təhsilinin daha da yüksəklərə qaldırılması üçün çox əhəmiyyətlidir, faydalıdır.

Ümid edirəm ki, burada irəli sürülən təkliflər, bəyan edilən fikirlər Azərbaycanın hazırlanan Təhsil qanunu layihəsində öz əksini tapacaqdır. Təhsil islahatları ilə əlaqədar mart ayından indiyə qədər fəaliyyətdə olan islahat komissiyası bu təklifləri nəzərə alacaqdır. Beləliklə, bugünkü qurultayda irəli sürülən fikirlərin əksəriyyəti iki dövlət sənədində öz əksini tapa biləcəkdir. Bununla bərabər, əgər ehtiyac olsa, mən bəzi məsələlərin həll edilməsi üçün xüsusi bir fərman da imzalaya bilərəm. Həmin fərmanda Azərbaycanın müvafiq nazirliklərinə, hakimiyyət orqanlarına, hökumətinə lazımi tapşırıqlar verilə bilər.

Beləliklə, mən hesab edirəm ki, müstəqil Azərbaycanın birinci müəllimlər qurultayı ölkəmizin təhsilinin gələcəyi və ümumiyyətlə, Azərbaycanın gələcəyi üçün mühüm bir mərhələdir. Bizim və sizin - hamımızın vəzifəmiz ondan ibarətdir ki, bu qurul-

tayda irəli sürülmüş fikirlər, təkliflər həyata keçirilsin və Azərbaycanda bütün təhsil daha da yüksəlsin.

Azərbaycanda təhsilin qədim və zəngin tarixi vardır. Bu gün bu barədə məlumatlar verildi. Siz, təhsil adamları, müəllimlər bizim təhsilin tarixini yaxşı bilirsiniz. Biz tarixin bütün mərhələlərində Azərbaycanda müəllimin, təhsilin rolunu qiymətləndiririk. Ancaq bu gün burada bildirildi, bu fikirlə mən də tamamilə şərikəm ki, Azərbaycanda təhsil, xalqımızın maariflənməsi XX əsrin əvvəlindən böyük sürətlə inkişaf edibdir və XX əsrin sonunda müstəqil Azərbaycan Respublikası böyük müəllim ordusuna, geniş təhsil şəbəkəsinə və yüksək təhsilə malikdir.

XX əsrin əvvəlində Azərbaycan müəllimlərinin birinci, ikinci qurultayları keçirilibdir. Bu gün biz əsrin sonunda müstəqil Azərbaycan müəllimlərinin qurultayını keçirərkən əsrin əvvəlində, Azərbaycan çar Rusiyasının tərkibində olduğu, təhsilin bir hissəsinin ruhanilərin, digər qisminin isə çar hakimiyyətinin əlində olduğu bir zamanda xalqımızın mütəfəkkir insanlarının müəllimlər qurultayı keçirmələrini yüksək qiymətləndirməliyik və bunu böyük minnətdarlıqla qeyd etməliyik.

1918-1920-ci illərdə Azərbaycanda fəaliyyət göstərmiş Xalq Cümhuriyyəti qısa bir dövr ərzində bir çox başqa məsələlərlə yanaşı, xalqımızın maariflənməsinə, Azərbaycanda təhsilin yaranmasına diqqət yetirmişdir və müəllimlər qurultayını keçirmişdir. 1919-cu ildə Azərbaycanda ilk ali məktəb-Bakı Dövlət Universiteti yaradılmışdır. Biz bu gün bu tarixi hadisələri də qiymətləndirməliyik və minnətdarlıq hissi ilə qeyd etməliyik.

Sonrakı 70 il ərzində Azərbaycan sovet hakimiyyəti dövrünü yaşamışdır. Biz bu gün iftixar hissi ilə deyə bilərik ki, o dövrdə Azərbaycan xalqı kütləvi surətdə maariflənmiş, savadlanmış, respublikamızda hər bir adamın təhsilə cəlb olunması məsələsi həll edilmişdir. Azərbaycanda savadsızlıq qısa bir zamanda ləğv olunmuşdur, respublikamızda güclü, zəngin təhsil potensialı, təhsil ocaqları və bu qədər gözəl müəllimlər ordusu yaranmışdır.

Bilirsiniz, tarixi nöqteyi-nəzərdən 70-80 il göz qırpımı kimi bir şeydir. Bu, kiçik bir zamandır. Amma görün, bu illərdə nə qədər böyük işlər görülübdür. Azərbaycanın siması dəyişibdir. Ötən dövrdə Azərbaycanda iqtisadiyyat, mədəniyyət, həyatın bütün sahələrində, elm sahəsində əldə olunmuş nailiyyətlərin başında duran, onun əsasını təşkil edən, kökü olan məktəbdir, təhsildir, müəllimdir.

1918-1920-ci illərdə Azərbaycanda iki paralel proses gedirdi. Bir tərəfdən, o vaxt Azərbaycanda mövcud olan kiçik bir müəllim dəstəsi ilə məktəblər, təhsil ocaqları yaratmaq, insanların savadsızlığını ləğv etmək lazım idi. Ancaq bu böyük işi görmək üçün, eyni zamanda, kadr potensialı, müəllim ordusu yaratmaq lazım idi, böyük xoşbəxtlikdir ki, o dövrün bir çox mənfi cəhətləri ilə, Azərbaycan xalqına dəyən ziyanlarla yanaşı, bu sahədə daim inkişaf olubdur. Qısa bir zamanda, təsəvvür edin, 1920-ci illə 1930-cu il arasında Azərbaycanda bir neçə ali məktəb yaranıbdır. Bakı Dövlət Universiteti inkişaf edibdir. Amma qısa müddətdə Bakı Dövlət Universitetinin əsasında Tusi adına Pedaqoji İnstitut–indiki Pedaqoji Universitet, Tibb İnstitutu, İqtisad İnstitutu və başqa institutlar yaranıbdır.

Ondan sonrakı dövrü götürün, 1930-cu illərdə Sənaye İnstitutu yaranıbdır. 1930, 1940, 1950, 1960, 1970-ci illəri götürün, Azərbaycanda bir çox ali məktəblər olmasına baxmayaraq, 1970-ci illərdə bir neçə yeni ali məktəb yarandı. Beləliklə, Azərbaycan öz

gənclərinin hamısına ali təhsil vermək iqtidarına malik oldu. Ancaq bunların da əsasını təşkil edən yenə də məktəbdir, müəllimdir.

Azərbaycanda qısa bir zamanda məktəblərin sayı artdı və onlar inkişaf etdi, genişləndi. Hər bir ucqar kənddə məktəb yarandı. Doğrudur, bu proses davam edir. Məsələn, xatirimdədir. 1970-ci illərdə mən Azərbaycana rəhbərlik edəndə bəzi kəndlər var idi ki, orada məktəb yox idi. Biz orada yeni məktəb binaları tikirdik. Böyük yaşayış məntəqələrində də ilbəil məktəb binaları tikilirdi və onların sayı artırdı.

Məktəblərin maddi-texniki bazası haqqında indi burada ədalətli danışıqlar getdi. Bu, həqiqətdir. Mən bu barədə sonra öz fikirlərimi bildirəcəyəm. Ancaq, eyni zamanda, təsəvvür edin, məsələn, 1979, 1980, 1981-ci illərdə hər il Azərbaycanda 35 min şagirdin oxuması üçün şəraiti olan məktəb binaları tikilirdi. Bu, bir ildə təxminən 50-60 məktəb binasının tikilməsi deməkdir. Bu, o vaxt olmuşdu ki, o dövrdə məktəblərin sayı həddindən çox artmışdı.

Beləliklə, xalqımızın maariflənməsi, təhsillənməsi üçün o dövr çox əhəmiyyətli bir dövr olmuşdur. Biz bunu qiymətləndirməliyik, heç vaxt unutmamalıyıq. Biz tariximizə doğru, ədalətli qiymət verməliyik. Heç bir konyunkturaya, hansısa yalançı məlumatlara uyaraq öz tariximizi qaralamamalıyıq. Tariximizin qara səhifələri də, amma çox parlaq, gözəl səhifələri də vardır. Biz bu tarixi yaşamışıq.

Mən gördüm, qurultay nümayəndələrinin 400 nəfərindən çoxunun yaşı 60-dan yuxarı olanlardır. Əgər bu adamın 60-dan yuxarı yaşı varsa, demək, o, 40-45 ildir ki, müəllimlik edir, o dövrü yaşayıbdı. O, bu dövrdə təhsil alıb, müəllimlik təcrübəsini artırıbdır və Azərbaycan balalarına, uşaqlarına, gənclərinə bu gün də dərs, təhsil, tərbiyə verir. Burada əyləşənlərdən heç kəs, necə deyərlər, dünən doğulmayıbdır. Burada olan, olmayan müəllimlərin yüz faiz hamısı o illərdə doğulubdur. Azərbaycan müstəqillik əldə edəndən sonra anadan olanların hələ cəmisi 6 yaşı vardır.

Bizim keçmişimizi, tariximizi bu gün ləkələmək istəyən, Azərbaycanın həyatı haqqında ədalətsiz fikirlər söyləyən adamların da hamısı o dövrdə təhsil alıbdır. Bəli, Azərbaycanın o dövrdəki məktəblərində, universitetlərində təhsil alıblar. Müftə, pulsuz təhsil alıblar, Azərbaycan Respublikasının imkanlarından istifadə edib təhsil alıblar. Bir xalq məsəli var: “Adam su içdiyi quyuya tüpürməz”. Biz hamımız o quyulardan su içmişik və ora tüpürməyə heç kəsin haqqı yoxdur.

Mən hesab edirəm ki, Azərbaycan dövlət müstəqilliyini əldə edəndən sonra respublikamızda təhsilin, maarifin inkişafı üçün daha da gözəl imkanlar yaranıbdır. Doğrudur, bizim maliyyə, maddi vəziyyətimiz bu imkanlardan istənilən səviyyədə istifadə etməyə imkan vermir. Amma eyni zamanda, bu, müvəqqəti bir haldır. Biz müstəqil dövlət olaraq özümüzün təhsil sistemimizi istədiyimiz kimi qururuq. Bütün dünya ölkələrinin mütərəqqi təcrübələrindən istifadə edirik. Hesab edirəm ki, indiyə qədər yaranmış təməlin, əsasın üzərində Azərbaycanın təhsili, məktəbi bundan sonra daha da təkmilləşəcək, inkişaf edəcək və Azərbaycan uşaqları, gəncləri bu inkişaf dövrümüzdə ilbəil daha da geniş, yüksək təhsil alacaqlar.

Bizim bügünkü qurultayımızın məqsədi, mənası məhz bundan ibarətdir. Bu gün mən sizinlə birlikdə müstəqil Azərbaycan Respublikasının ilk müəllimlər qurultayında olmağımı özüm üçün böyük xoşbəxtlik hesab edirəm. Buradakı çıxışlarda bildirildi, hər kəs öz tərcümeyi-halı, öz həyat yolu ilə məktəbin, müəllimin, insanın həyatında nə

kimi rolu olduğunu bilir və onu qiymətləndirməlidir. Mən isə bütün varlığımla, keçdiyim həyat yolu ilə həmişə məktəbə, müəllimə borcluyam.

Doğrudur, siz məni də müəllim hesab edirsiniz. Burada müəyyən əsas var. Siz mənim təhsilimə əsaslanaraq bunu deyirsiniz. Mən indiyə qədər heç bir sinifdə müəllimlik etməmişəm. Ancaq xatırlayıram, tərcümeyi-halımdan bilirsiniz ki, mən 1939-cu ildə Naxçıvanda Pedaqoji Texnikumu bitirmişəm. Naxçıvan Pedaqoji Texnikumu məhz həmin dövrdə müəllim çatışmazlığına, ibtidai siniflərə, hətta orta məktəblərin, 7-8-ci siniflərinə qədər dərs demək üçün müəllim olmadığına görə müəllim kadrları hazırlayırdı. Mən isə orta məktəbin 8-ci sinfini bitirdikdən sonra pedaqoji texnikuma daxil oldum. Məqsədim də o idi ki, müəllim olmaq, müəllim işləmək və ailəmə kömək etmək istəyirdim.

Bilirsiniz ki, mən pedaqoji texnikumu bitirəndən sonra Bakıda ali məktəbə qəbul olundum. Pedaqoji texnikumun sonuncu kursunda bizə pedaqoji təcrübə dərsi verirdilər. Biz həftədə 2-3 dəfə gedib məktəblərin 2-ci, 3-cü, 4-cü siniflərində dərs deyirdik. Ona görə də mənim o vaxt bir az dərs vermək təcrübəm olubdur. O günlər mənim xatirimdədir. Xatirimdədir ki, nə qədər həyəcan keçirirdim. Əvvəlcə, bizi o siniflərə aparırdılar, oturub baxırdıq ki, müəllimlər necə dərs verirlər. Bir müddət belə idi. Ondan sonra isə deyirdilər ki, gedib filan gün, filan sinifdə filan dərsi verməlisən. Nə qədər hazırlaşmaq lazım idi. Nə qədər hazırlaşsaydın da 2-ci, 3-cü, 4-cü sinif uşaqları qarşısında böyük həyəcan keçirirdin. Mən həmin günləri indi də xatırlayıram.

Ancaq bununla bərabər, mən bütün həyatım boyu məktəblə, təhsil sistemi ilə bağlı olmuşam. 1969-cu ilə qədər bir çox dövlət işlərində işlədiyim zaman mən daim məktəbə, ali məktəblərə maraq göstərmişəm və onların fəaliyyətində müəyyən xidmətlərim olubdur. Ancaq mən 1969-cu ildə respublikanın rəhbəri seçiləndən sonrakı fəaliyyətimin, şübhəsiz ki, bütün sahələrini qiymətləndirərək, Azərbaycanda məktəbin, orta, ali təhsilin, texniki peşə təhsilinin inkişaf etməsini öz fəaliyyətimin əsas hissəsi hesab etmişəm, bununla ciddi məşğul olmuşam. Bu gün iftixar hissi keçirə bilərəm ki, o illər, mən Azərbaycana rəhbərlik etdiyim zaman saysız-hesabsız məktəblər yaranıbdır, ali məktəblərin sayı, onların fakültələri, kafedraları artıbdır, yüksəksəviyyəli müəllim kadrları, universitetlərdə dərs deyən alim kadrları hazırlanıbdır və bunların hamısında mənim xidmətlərim olubdur.

Bilirsiniz ki, nəhayət, 1982-ci ilin dekabr ayında məni Moskvaya işə dəvət etdilər. Siz bilirsiniz ki, mən o vaxt Sovetlər İttifaqının ən yüksək rəhbərliyində olan adamlardan biri idim. Mən Siyasi Büronun üzvü və Sovetlər İttifaqı Nazirlər Soveti sədrinin birinci müavini idim. Mənim bir çox vəzifələrim var idi, bir çox nazirliklərə bilavasitə rəhbərlik edirdim. Onların içərisində Sovet İttifaqının Ali Təhsil Nazirliyi, Maarif Nazirliyi və Texniki Peşə Təhsili Komitəsi də var idi. Mən Sovet İttifaqında bu üç təhsilə aid olan nazirliklərə 5 il rəhbərlik etmişəm, onların işində bilavasitə iştirak etmişəm. Mən onların məsələlərini həll etmişəm, məruzələrini dinləmişəm, kollegiyalarında, böyük iclaslarında iştirak etmişəm, nitq söyləmişəm, söz demişəm və bir çox qərarlar qəbul etmişəm.

Bu gün biz dünyanın hər yerində təhsil sisteminin necə olduğunu bilirik. Sovetlər İttifaqı dövründə yaranmış təhsil sisteminin böyük üstünlükləri vardı. Biz bunu başqa ölkələrin təhsil sistemi ilə müqayisə edəndə görürük. Ancaq o sistem də tam təkmil sistem deyildi. Ona görə də onu təkmilləşdirmək lazım idi. Burada natiqlərin bəziləri de-

dilər ki, mən 1983-1984-cü illərdə Sovet İttifaqında məktəb islahatının keçirilməsi üzrə partiya və hökumət tərəfindən yaradılmış böyük bir komissiyanın sədri olmuşam. Bildiyiniz kimi, o vaxt məktəb islahatı hazırlandı və 1984-cü ildə bu məsələ SSRİ Ali Sovetinin sessiyasında müzakirə olundu. Mən o sessiyada məktəb islahatı haqqında məruzə etdim. Bunun əsasında qanunlar, bir çox qərarlar qəbul olundu. Beləliklə, mən bu təhsil, məktəb sistemini həm gəncliyimdən, həm Azərbaycana rəhbərlik etdiyim dövrdən bilirəm, həm də SSRİ-nin rəhbərlərindən biri kimi, o zaman bu sahə ilə bilavasitə məşğul olduğuma görə bilirəm.

Bildirmək istəyirəm ki, 1983-1984-cü illərdə Sovetlər İttifaqının rəhbərliyində həqiqətən ölkənin demokratikləşdirilməsi üçün bir çox addımlar atılırdı. Andropov Sovetlər İttifaqına rəhbərlik etdiyi, mən də o vaxt SSRİ Nazirlər Soveti sədrinin birinci müavini, Siyasi Büronun üzvü olduğum zaman bu sahədə görülmüş işlərin hamısını bilirəm. İndi bunu geniş danışmağa vaxt yoxdur və lazım da deyildir. Ancaq atılmış həmin demokratik addımlardan biri 1983-cü ildə Sovetlər İttifaqında ilk dəfə "Əmək kollektivləri haqqında" qanunun qəbul edilməsi və 1984-cü ildə Ali Sovetin sessiyasında məktəb islahatı barədə qanunun, bir çox qərarların qəbul olunması idi. Bu, tarixdir və bu tarixi heç kəs poza bilməz.

1983-cü ildə Sovet İttifaqının tarixində ilk dəfə "Əmək kollektivləri haqqında" qanunun hazırlanması üzrə komissiyanın sədri mən olmuşam. Həmin qanunu mən hazırlamışam, 1983-cü ilin iyulunda SSRİ Ali Sovetinin sessiyasında bu qanun haqqında məruzə etmişəm və bu qanun qəbul olunmuşdur. 1984-cü ildə "Məktəb islahatı haqqında" qanun hazırlamışam, o da qəbul edilibdir.

Doğrudur, 1985-ci ildə Qorbaçov Sovetlər İttifaqının başçısı seçiləndən sonra o illərdə görülmüş işlərə görə onda böyük bir qısqanclıq əmələ gəldi. Qorbaçov həm birinci qanunun, həm də məktəb islahatının həyata keçirilməsinə imkan vermədi, şərait yaratmadı. O özü hansısa yeni-yeni islahatlar irəli sürdü. Ancaq buna baxmayaraq, o qanunlar öz işini gördü. Məktəbin təkmilləşməsi sahəsində o illərdə bir çox işlər görülübdür.

Beləliklə, bu gün məktəb, təhsil haqqında sizinlə söhbət aparmağa və bərabərhüquqlu dialoqa girməyə mənim haqqım vardır. Ancaq bütün bunlar tarixdir, keçmişdə qalıbdır. Amma keçmişdə qalan hər bir iş də bugünkü işlərin əsasını təşkil edir.

Bu gün biz müstəqil Azərbaycanda bütün təhsilin - orta, texniki peşə, orta ixtisas məktəblərinin və ali məktəblərin işinin yaxşılaşdırılması sahəsində ciddi tədbirlər görməliyik. Mən hesab edirəm ki, bunlar da həm qəbul olunacaq təhsil qanununda, həm də təhsil islahatı ilə əlaqədar qəbul ediləcək qanunda və qərarlarda öz əksini tapacaqdır. Əmin ola bilərsiniz ki, mən indiyə qədər topladığım təcrübəmdən istifadə edərək və Azərbaycanın Prezidenti kimi müstəqil ölkəmizin gələcəyi haqqında daim düşünərək bu məsələlərlə müntəzəm məşğul olacağam. Respublikamızda məktəb, təhsil bundan sonra da mənim daimi qayğılarım altında, diqqət mərkəzimdə olacaqdır.

Mənim haqqımda siz də çox sözlər demişsiniz, mən də öz fikirlərimi indiyə qədər bildirmişəm. Amma bu gün müstəqil Azərbaycanın müəllimlərinin ilk qurultayıdır. Biz XX əsri sona çatdırırıq, XXI əsrə doğru gedirik. Mən bəyan edirəm ki, bizim müstəqil respublikamızda, Azərbaycan cəmiyyətində müəllim bu gün də, gələcəkdə də ən hörmətli insan kimi qəbul edilməlidir və müəllimlik peşəsi ən yüksək qiymətə layiq olan peşədir.

Həyatını müəllimliyə həsr edən insanlar həqiqətən fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Müəllimlik peşəsi asan peşə deyil. Bəziləri hesab edirlər ki, hər adam müəllim ola bilər. Bəzən olur ki, müəllimliyə layiq olmayan adam da müəllimlik edir. Belə hallar bu gün də var, gələcəkdə də ola bilər. Ancaq Azərbaycan müəllimlərinin tam əksəriyyəti layiqli müəllimdir. Əgər bunlar belə olmasaydı, Azərbaycanın bugünkü elmi, iqtisadiyyatı, mədəniyyəti, yüksəlişi ola bilərdimi? Biz bunların hamısını məktəblərdən, universitetlərdən, müəllimlərdən, sizdən almışıq.

Mən müəllimlərimi həmişə böyük hörmət və ehtiramla xatırlamışam. Bunu bu gün bir daha bildirmək istəyirəm. Arzu edərdim ki, müəllim elə müəllim olsun ki, bax, mənim hafizəmdə orta məktəbdən indiyədək yaşayan duyğular hər bir gəncin hafizəsində qalsın. Xatirimdədir, biz müəllimi görəndə həmişə özümüzü yığışdırırdıq. Müəllimdən həm qorxurduq, həm də ona hörmət edirdik. Biz müəllimin hər sözünü qanun kimi qəbul edirdik. Şəxsən mənim həyatımda müəllim ən ali sima olmuşdur. Mən tək deyiləm, hesab edirəm, Azərbaycan vətəndaşlarının əksəriyyəti mənim kimi belə düşünür. Hər kəs öz həyatında müəllimlə özünün əlaqəsi haqqında fikirlər söyləyə bilər. Ancaq mənim çoxillik həyatımda, dünyanın çox mərhələlərini keçib gəldiyim həyatımda ən çox yadımda qalan, mənim üçün əziz olan müəllimlərdir. Mən onları bu gün də böyük minnətdarlıqla xatırlayıram. Hesab edirəm ki, mənim öz daxili istedadımla yanaşı, müəllimlərimin mənə verdikləri bilik, tərbiyə, müəllimlərimin mənə göstərdiyi yol bütün həyatımı həmişə uğurlu edibdir və bu gün də uğurlu edir.

Əziz dostlar, siz fəxr etməlisiniz ki, müəllimsiniz və müəllimlik peşəsinə sadiqsiniz. Doğrudur, müəllimin maddi vəziyyəti başqa təbəqələrə nisbətən zəif olur, elə keçmişdə də belə idi. Həqiqətən belədir. Məsələn, 70-ci illərdə mən Azərbaycana rəhbərlik etdiyim zaman, yaxud da Sovetlər İttifaqında bu məsələlərlə məşğul olduğum zaman biz daim düşünürdük ki, müəllimlərin maaşını nə təhər artıraq, onların maddi vəziyyətini necə yaxşılaşdıraq. Sizə deyə bilərəm ki, 1984-cü ildə məktəb islahatı keçirilərkən biz eyni zamanda, müəllimlərin maaşının artırılması haqqında qərar qəbul etdik.

Amma bunlara baxmayaraq, hesab edirəm ki, başqa təbəqələrə nisbətən müəllimlər elə o vaxt da aztəminatlı adamlar olublar və bu gün də aztəminatlıdırlar. Bu, müəllimliyin xüsusiyyətidir. Çünki əsl müəllim pul, sərvət üçün yox, həmişə mənəviyyat üçün xidmət edibdir. Xatirimdədir, orta məktəbdə, Pedaqoji texnikumda oxuyanda mənim maddi vəziyyətim, yəni ailəmin vəziyyəti çox zəif idi. Ancaq görürdüm ki, mənə dərs verən müəllimlərin maddi vəziyyəti bizim maddi vəziyyətimizdən o qədər də artıq deyildir. Amma nə qədər həvəslə, sədaqətlə və nə qədər ürəklə bizə tərbiyə, dərs verirdilər. Ona görə də müəllimlik peşəsi həmişə fədakarlıq tələb edir. Bu, belə olubdur.

Mən hesab edirəm ki, insan cəmiyyətində ən yüksək yerdə mənəviyyat durur. Maddi vəziyyət, sərvət, bu və ya başqa şeylər xeyli aşağıda durur. Bununla onu demək istəmirəm ki, müəllimlər həmişə maddi çətinlik içərisində yaşamalıdırlar. Yox, sadəcə, bu sözlərimlə mən özünü müəllimlik peşəsinə həsr edən insanın həmin peşəyə sadiqliyini sübut etmək istəyirəm. Ola bilər, o müəllimlər gedib başqa bir işlə məşğul olsaydılar, bir neçə qat artıq fayda götürə bilərdilər və maddi vəziyyətləri də yaxşı olardı. Ancaq onlar müəllimlik peşəsini seçiblər, siz müəllimlik peşəsini seçmisiniz. Buna görə də mən sizə “afərin!” deyirəm, sizin qarşınızda,

müəllimin qarşısında baş əyirəm.

Eyni zamanda sizi əmin edirəm ki, müəllimin maddi vəziyyətini yaxşılaşdırmaq üçün mümkün olan tədbirləri görəcəyik, müəllimlərin maddi vəziyyətinin yaxşılaşdırılmasına nail olacağıq. Müəllimlər qurultayına bir neçə gün-bir həftə, on gün qalmış Nazirlər Kabinetinə, maliyyə, iqtisadiyyat nazirliklərinə göstəriş verdim ki, qurultay keçiriləne qədər müəllimlərin maaşlarının artırılması üçün nə etmək olar? On gündür bu işlə məşğul olurlar. Bildirmək istəyirəm ki, müəllimlərin maaşının qaldırılması üçün yaxın aylarda ciddi tədbirlər görüləcəkdir.

Siz real vəziyyəti bilməlisiniz. Real vəziyyət ondan ibarətdir ki, son üç ildə biz Azərbaycanda iqtisadiyyatı müəyyən qədər sabitləşdirmişik. Bu gün burada siz Azərbaycanda yaranmış ictimai sabitlik haqqında çox gözəl sözlər dediniz. Onlara görə, sizə təşəkkür edirəm. Ancaq, eyni zamanda, bu ictimai-siyasi sabitliyə nail olmaq üçün, başqa tədbirlərlə yanaşı, iqtisadiyyatda da sabitliyə nail olmaq lazımdır. Biz iqtisadiyyatda, maliyyə sistemində sabitliyə, normal inkişaf yoluna nail ola bilmişik. Bu, asan məsələ deyildir.

Bilirsiniz ki, son üç ildə müəllimlərin maaşı bir neçə dəfə artırılıbdır. 1995-ci ilə nisbətən müəllimlərin maaşı 1996-cı ildə 2,6 dəfə, 1996-cı ilə nisbətən 1997-ci ildə 1,7 dəfə, 1998-ci ilin birinci yarısında 12 faiz artırılıbdır. Amma bu azdır. Siz də deyirsiniz, mən də bununla razıyam. Amma təsəvvür edin, əgər 1995-ci ilə nisbətən 1996-cı ildə 2,6 dəfə, 1996-cı ilə nisbətən 1997-ci ildə 1,7 dəfə və nəhayət, bu ilin birinci yarısında 12 faiz artırılıbsa, bunun üçün vəsait tapmaq lazımdır.

Büdcədən təhsilə ayrılan vəsait ilbəil artır. 1996-cı ildə büdcənin 17 faizi, 1997-ci ildə 20 faizi, 1998-ci ildə isə 22 faizi təhsilə ayrılıbdır. Bu dinamikanı, artımı görürsünüz. Bu da azdır. Ancaq imkanlarımız bundan ibarətdir. Respublika üzrə müəllimin orta əməkhaqqı 1995-ci ildə 30 min manat, 1996-cı ildə 78 min manat olubsa, bu ilin birinci yarısında 150 min manatdır. Bu, statistikadır. Ola bilər, birində çoxdur, birində azdır, amma bu, statistikadır.

Mən dünən Suraxanı rayonunda idim. Ora neftçilər rayonudur və orada böyük istehsal var. Suraxanı rayonunda əhalinin, işləyənlərin orta əməkhaqqı 400 min manatdır. Neftçilərin orta əməkhaqqı 500 min, bəzən 600 min manatdır. Amma büdcədən maliyyələşdirilən təşkilatlara lazımi vəsaiti büdcəyə gələn gəlirlərdən ayırırıq. Onu da bilməlisiniz ki, büdcədən maliyyələşdirilən təşkilatlar içərisində ən çox vəsait ayrılan təhsil sahəsidir. Bu, reallıqdır.

Onu da bilməlisiniz ki, göstərilən artımlarla yanaşı, Azərbaycanda, dediyim kimi, 1996-cı ildən iqtisadiyyatda sabitlik əmələ gəlibdir. Bu da nədən ibarətdir? Məsələn, 1994-cü ildə Azərbaycanda inflyasiya 1400 faiz, 1995-ci ildə 80 faiz, 1996-cı ildə təxminən 8-9 faiz, 1997-ci ildə 0,4 faiz olubdur. 1998-ci ildə inflyasiya yoxdur. Bu, nə deməkdir? O deməkdir ki, bu üç il müddətində Azərbaycanda qiymətlər artmır. Maaş artır, amma qiymətlər artmır.

Bu iqtisadi məsələləri, maliyyə məsələlərini bəlkə də hər kəs dərk edə bilmir. Ancaq dövləti, maliyyəni, iqtisadiyyatı idarə etmək şüarlarla ola bilməz. İndi radikal müxalifətdə olanlar hər şeyi pisləyir, tənqid edirlər. Amma onlar yalan danışırlar. Yaxud da bəzi başqaları ucuz şöhrət qazanmaq üçün “filan maaşları filan qədər artırmaq, filan malların qiymətini bu qədər azaltmaq lazımdır, filan işləri belə etmək lazımdır”, -deyirlər.

Bilirsiniz, kənarda durub iqtisadiyyatla məşğul olmayan və məsuliyyət daşımayan adamlar hər cür populist söz deyə bilərlər. Əziz bacılar, qardaşlar, ancaq bilin, bu iqti-

sadiyyatla biz məşğul oluruq, Azərbaycanın iqtisadi sabitliyini təmin etmişik. Biz şüarların, hislərin təsiri altında iş görə bilmərik. Nə mümkündürsə, biz onu edirik.

Rusiyada gedən proseslərə baxın. Rusiyada son dörd-beş ayda böyük bir böhran baş veribdir. Bu, nədən ibarətdir? Maaşlar verilə bilmir. Neçə aylarla müəllimlərin maaşları, pensiyalar verilə bilmir. Büdcədən maliyyələşdirilən başqalarının maaşları verilə bilmir. Dünən bizim sosial müdafiə fondunun sədri çıxış edirdi, o bildirdi, - bildirməsə də, məndə məlumatlar var, - bizdə avqust ayının pensiyaları hamısı verilibdir. Müəllimlərin yay məvaciblərinin hamısı verilibdir. Bunu təmin etmək asan məsələ deyil, bunu bilin. Əgər büdcənin 22 faizi təhsilə və onun da əksər hissəsi maaşlara gedirsə, bu vəsaiti əldə etmək asan məsələ deyildir.

Sizə bir məsələni də demək istəyirəm. Dünyada-Şərqi və Cənub Şərqi Asiyada baş vermiş böyük maliyyə böhranı nəticəsində neftin və neft məhsullarının qiyməti iki dəfə azalıbdır. Bizim büdcənin gəlirinin də çox hissəsini neft məhsullarından əldə olunan gəlir təşkil edir. Mən sizə açıq deyirəm, bu, iqtisadiyyatımızın indiki mərhələsində bizə çox böyük zərbə vurubdur. Buna baxmayaraq, bizdə manatın dəyəri sabitdir. Amma Rusiyaya baxın. İqtisadi böhran, maliyyə böhranı orada bir hökuməti istefaya göndərdi-Çernomırdini prezident istefaya göndərdi. Ondan sonra Kiriyenkonu təyin elədi, yeni bir hökumət yarandı. O, bu böhranın qarşısını ala bilmədi, böhran daha da dərinləşdi. Prezident onu da istefaya göndərdi. İndi on gündür ki, yeni hökumət yaranır.

Bilirsiniz, bəli, orada bir çox maaşları artırıblar, amma onu təmin edə bilmirlər. Bu, bir tərəfdən. İkinci tərəfdən, buraxılmış cürbəcür nöqsanlar nəticəsində Rusiyanın valyutasının-rublun devalvasiyası gedib, qiyməti düşübdür. Bilirsiniz ki, Rusiyada pul islahatı keçirildi. Pullar dəyişdirildi və sıfırlar götürüldü, bir milyon gəldi oldu, nə bilim, nə qədər. Son üç aya qədər 1 dollar 6 rubl idi. Sonra maliyyə böhranı ki, başladı, 1 dollar 24 rubla qalxdı. Təsəvvür edirsinizmi, Rusiyada dolların qiyməti 4 dəfə qalxdı. Bu, Rusiyanın bütün maliyyəsini, bankların vəziyyətini pozdu, maaşlar verilmir və sairə. Dünən mən dinləyirdim, indi görülən bütün tədbirlər, xaricdən alınan kreditlər nəticəsində 1 dollar 15 rubl olubdur, bir az aşağı salıblar. Ancaq bu, böyük bir fəlakətdir.

Amma bizdə isə dolların məzənnəsi sabitdir, son iki-üç ildə manat dollara nisbətdə daha da möhkəmlənibdir. Demək, üç il müddətində bizim manatın alıcılıq qabiliyyəti tamamilə sabitdir və qiymətlər də qalxmayıbdır. Bilirsiniz, maliyyənin xüsusiyyətləri, incəlikləri bəlkə də hər bir adam üçün məlum deyildir. Amma mən bunları sizə deməyə məcburam ki, siz biləsiniz: Azərbaycanı bu ağır vəziyyətdə idarə etmək, iqtisadiyyatı son üç ildə sabit saxlamaq və onun inkişafına nail olmaq asan məsələ deyildir. Yenə də deyirəm, bu, küçələrdə deyilən şüarlarla, yaxud ayrı-ayrı populist danışıqlarla, məsuliyyətsiz adamların danışıqları ilə bir araya gəlməz. Bunları etmək üçün o adamların biri gəlib məsuliyyəti üzərinə götürməlidir. Amma götürə bilməz. Çünki bu söhbətləri edən adamlar nə maliyyəni, nə də iqtisadiyyatı bilirlər. Heç bir şey bilmirlər, ancaq şüar deməyi bilirlər.

Təsəvvür edin, əgər mən 70-ci illərdə və 80-ci illərin əvvəllərində Azərbaycanda iqtisadiyyatı bu qədər yüksəklərə qaldıra bilmişdimsə, Sovetlər İttifaqının rəhbərliyində olduğum zaman, o cümlədən maliyyə işləri ilə məşğul olur və birinci müavin kimi Sovetlər İttifaqının büdcəsinin formalaşdırılmasına rəhbərlik edirdimsə, bu işlərlə məşğul olan adam idimsə, böyük bir superdövlətin maliyyəsini, böyük ölkələrin maliy-

yəsini bilən adam kimi mən sizə məsuliyyətlə deyirəm ki, vəziyyət bundan ibarətdir.

Konkret olaraq müəllimlərin maaşının artırılması barədə. Əgər neftin qiymətinin düşməsi ilə əlaqədar son aylarda neftdən gələn gəlirlərimiz azalmasaydı, bəlkə də elə bu qurultay zamanı maaşların artırılması haqqında müəyyən bir fərman verə bilərdim. Ancaq sizə açıq deyirəm, yaranmış belə vəziyyətdə mən bunu edə bilmirəm. Eyni zamanda sizə bəyan edirəm ki, indi 1999-cu ilin büdcəsi hazırlanır, biz onu təxminən noyabr ayında müzakirə edəcəyik və 1999-cu ilin əvvəlindən müəllimlərin maaşının artırılacağına söz verirəm.

Mən sizə hər şeyi olduğu kimi deyirəm. Yalan söz demək, xalqı aldatmaq heç bir rəhbərə, vəzifəli şəxsə heç vaxt uzunmüddətli uğur gətirməyibdir. Mən isə istəyirəm ki, Azərbaycanda yaranmış ictimai-siyasi sabitlik, iqtisadi-maliyyə sabitliyi davam etsin və biz Azərbaycanın iqtisadiyyatını bu ilin sonuna qədər və 1999-cu ildə də inkişaf etdirək. Biz bunu inkişaf etdirəcəyik. Həm Azərbaycanın istehsal sahələrini hərəkətə gətirərək, həm də özəlləşdirməni apararaq, iqtisadi islahatları həyata keçirərək, torpaq islahatını həyata keçirərək istehsalı artırırıq və bu artım da öz nəticələrini verir.

Maaşı artırmaq, maliyyə əldə etmək üçün, birinci növbədə ümumi daxili məhsulu artırmaq lazımdır. Mən dəfələrlə demişəm və bu gün bir də demək istəyirəm. Bilirsiniz ki, 1990-cı ildən, hətta 1989-cu ildə Azərbaycanda istehsal tənəzzülə başlayıbdır. Bu tənəzzül 1995-ci ilə qədər davam edib və istehsalın-sənaye, kənd təsərrüfatı istehsalının və ümumi daxili məhsul istehsalının həcmi hər il təxminən 20-25 faiz aşağı düşübdür. 1996-cı ildə biz bu azalmanı dayandırmışıq. Ümumi daxili məhsul 1996-cı ildə 5,8 faiz, 1997-ci ildə 8 faiz artmışdır. Bu ilin ötən aylarında isə 9 faiz artıbdır. Bu, böyük hadisədir ki, biz tənəzzülü dayandırmışıq və artıma nail olmuşuq. Bu artım çoxaldıqca bizim maliyyə gəlirimiz də gələcək və beləliklə, əhalinin iqtisadi vəziyyətini yaxşılaşdıracağıq, o cümlədən büdcədən maliyyələşdirilən müəllimlərin, təhsil işçilərinin maddi vəziyyətini yaxşılaşdıracağıq.

Burada bir çox təkliflər irəli sürüldü. Mən hesab edirəm ki, bu təkliflərin hamısı çox dəyərlidir və nəzərə alınmalıdır. Amma təkliflərdən bir-ikisinə öz münasibətimi bildirmək istəyirəm. Birincisi, məktəblərin, ümumiyyətlə, təhsil ocaqlarının maddi-texniki vəziyyəti haqqında. Doğrudur, indi biz əvvəllərdəki kimi məktəb binaları, ali təhsil ocaqlarına lazımi binalar tikə bilmirik. Çünki bu imkanlar yoxdur. Mən sizə dedim, 1979, 1980, 1981-ci illərdə biz orta hesabla ildə 50-60 məktəb tikib istifadəyə verirdik. Yaxud da Bakı Dövlət Universitetinin, başqa universitetlərin tədris kompleksləri nə qədər genişlənib, inkişaf edibdir. Bütün bu çətinliklərə baxmayaraq, Tibb Universitetinin də yeni tədris korpusu hazırlanıb, istifadəyə verilmək ərəfəsindədir. Mən yəqin ki, bu günlərdə gedib onunla tanış olacağam. Ancaq bunlar bizim keçmişdə olan imkanlarımız deyildir, ona görə də edə bilmirik.

Açıq demək lazımdır, əgər mən bu respublikaya rəhbərlik etdiyim zaman ildə 50-60 məktəb tikmək mümkün idisə, bu gün yenə də respublikaya rəhbərlik edirəm, niyə bunu tikə bilmirik? Ona görə yox ki, biz bunu bacarmırıq, istəmirik. Ona görə ki, bunun üçün bizim maddi və maliyyə imkanlarımız çatmır. Ancaq bildirirəm ki, maliyyə, maddi imkanlarımız ilbəil artacaq və bunun nəticəsində də biz Azərbaycanda yenidən təhsil ocaqlarının tikilməsi, istifadəyə verilməsi prosesini aparacağıq.

Eyni zamanda, burada tamamilə düzgün fikir söyləndi ki, bizim iş adamları, ayrı-ayrı şirkətlər ya məktəb binası tikə, yaxud da

mövcud məktəblərin təmirini öz üzərinə götürə bilərlər. Burada doğru deyildi, bəzi iş adamları məscid tikirlər, - o da lazımdır, mən bunu çox əhəmiyyətli hesab edirəm, - ancaq bir məscid tikəndə, bir dənə də məktəb binası tikmək lazımdır. Ona görə də mən burada deyilən fikirlərə şərik çıxaraq üzümü tuturam Azərbaycanda fəaliyyət göstərən iş adamlarına, şirkətlərə və müraciət edirəm ki, onlar bu sahədə təşəbbüs göstərsinlər. Bəyan edirəm ki, kim bu sahədə təşəbbüs göstərsə, hansısa bir məktəbi yaxşı təmir edib müasir vəziyyətə salmağı öz üzərinə götürsə, şübhəsiz ki, o, dövlət tərəfindən müəyyən qayğı altında olacaqdır. Ümidvaram ki, mənim bu çağırışıma qoşulanlar olacaqdır. Hesab edirəm ki, bizim Təhsil Nazirliyi mənim bu çağırışımla əlaqədar lazımi işlər görməlidir. Beləliklə, biz şirkətləri, iş adamlarını təhsilə vəsait sərf etməyə və təhsilin inkişafına qoşulmağa cəlb edə bilərik.

Burada məktəbə altı yaşından getmək məsələsi barədə də fikir söyləndi. Mən anlamıram, nə üçün bu, indiyə qədər müzakirə olunur? 1984-cü ildə “Məktəb islahatı haqqında” qəbul olunmuş qanunda uşaqların altı yaşından məktəbə getməsi tamamilə məqbul hesab edilmişdi. Burada deyildi, doğrudan da, bəzən heç altı yaşına çatmamış uşaqlar var ki, çox istedadlı, hazırlıqlıdırlar və onları məktəbə qəbul etmək lazımdır. Hesab edirəm, bu barədə də lazımi tədbirlər görülməlidir.

Mən sizə öz təcrübəmdən deyə bilərəm. Mən özüm altı yaşında məktəbə getmişəm, - o vaxt hələ nə islahat, nə də qanun var idi, - məni məktəbə qəbul ediblər və on altı yaşımda məktəbi bitirmişəm. Oğlum isə məktəbə gedəndə hələ altı yaşı da tamam deyildi. Bunlar hamısı təkcə mənim yox, çox insanların övladlarının təcrübəsindən keçibdir və buna mane olmaq lazım deyildir.

Bizim hamımızın ən əsas qayğısı işğal olunmuş torpaqlardan didərgin düşmüş soydaşlarımızın, vətəndaşlarımızın vəziyyəti və onların, xüsusən çadırlarda və qeyri-münasib binalarda yaşayan ailələrin uşaqlarının təhsili məsələsidir. Mən bəzən görürəm, televiziya ilə göstərirlər ki, çadır şəhərciklərində müəllimlər uşaqlara çadır altında dərs keçirlər. Bizim dövrümüzdə bunu görmək bir tərəfdən ağırdır, çünki indi, XX əsrin sonunda bir çox vətəndaşlarımız çadırda yaşayır və uşaqlar da çadırlarda təhsil alırlar. Amma ikinci tərəfdən də, bu, məndə böyük qürur hissi doğurur ki, Azərbaycan vətəndaşları, azərbaycanlılar təhsilə nə qədər bağlıdırlar, övladlarını nə qədər təhsilləndirmək, maarifləndirmək istəyirlər, hətta çadırda, ağır şəraitdə yaşayaraq uşaqlarını məktəbə oxumağa göndərirlər. Xüsusən çadır şəhərciklərindəki məktəblərdə dərs verən müəllimlərin fəaliyyətini qiymətləndirirəm. O müəllimlər ki, çətin vəziyyətdə, bəzən qarın altında, palçığın içində, ağır vəziyyətdə çadırda dərs verir, özünün şərəfli müəllimlik vəzifəsini yerinə yetirir, köçkün uşaqlarını tərbiyələndirir və onlara təhsil verirlər - bunlar xüsusi hörmət və ehtirama layiqdirlər.

Bilirsiniz ki, Azərbaycanın işğal olunmuş topaqları problemi ilə biz məşğuluq. Siz də burada dediniz ki, bu məsələnin sülh yolu ilə həll olunmasının tərəfdarısınız. Mən bu gün bir də bəyan edirəm ki, biz ötən dörd il müddətində, yəni atəşkəs əldə ediləndən sonra bu sahədə çox iş görmüşük və məsələnin sülh yolu ilə həll olunması üçün bir çox imkanlar yaranıbdır. Əminəm ki, biz buna nail olacağıq. Ancaq sizin qarşınızda bəyan edirəm: əgər biz bu yolla torpaqlarımızı işğalçı dəstələrdən azad edə bilməsək, işğal edilmiş torpaqların hamısının nəyin bahasına olur-olsun, hamımız birlikdə, indi yaranmış güclü ordumuzla və öz iradəmizlə azad edilməsinə nail olacağıq, Azərbaycanın ərazi bütövlüyünü bərpa edəcəyik.

Bu gün buradakı çıxışlarda son vaxtlar Azərbaycanda yaranmış mövcud vəziyyət haqqında da öz fikirlərinizi bildirdiniz. Bizim ən böyük nailiyyətlərimizdən biri ölkəmizdə ictimai-siyasi sabitliyin yaranmasıdır. Buna da çox çətinliklə nail olmuşuq. 1993-cü ili xatırlayın, Azərbaycanın o ildəki vəziyyətini, vətəndaş müharibəsini və müxtəlif cinayətkar dəstələrin tüğyan etməsini yadınıza salın. Biz böyük çətinliklərdən keçərək və böyük fəlakətlərin qarşısını alaraq, Azərbaycanda vətəndaş müharibəsinə yol vermədik. Ondan sonra, 1994-cü ilin oktyabr ayında dövlət çevrilişinin qarşışını sizin köməyinizlə, dəstəyinizlə aldıq. 1995-ci ilin mart ayında daxildə olan düşmən qüvvələrin xarici ölkələrin xüsusi xidmət orqanları ilə birlikdə Azərbaycanı dağıtmaq, parçalamaq məqsədi ilə başladıqları dövlət çevrilişinin qarşısını aldıq.

Ondan sonra Azərbaycanın dövlətçiliyinə qarşı təxribatlar, terrorlar baş verdi. Bəli, Sabunçuda olan körpünü partlatmaq istədilər onun qarşısını aldıq. Prezidentin təyyarəsini vurmaq istədilər onun qarşısı alındı.

Biz bir çox belə bəlalardan keçib gəlmişik. Ancaq bizim iradəmiz, apardığımız siyasət, gördüyümüz işlər sayəsində Azərbaycanda bütün bu cinayətkar dəstələr zərərsizləşdirilib, ölkədə rahatlıq yaranıbdır və siz də, bütün Azərbaycan vətəndaşları da ictimai-siyasi sabitlik şəraitində rahat, sakit yaşamaq imkanı əldə etmisiniz.

Biz bunu qoruyub saxlamalıyıq. Çünki Azərbaycanda hüquqi, demokratik dövlət quruculuğunu aparmaq, siyasi, iqtisadi və sosial islahatları həyata keçirmək, iqtisadiyyatı inkişaf etdirmək üçün, Azərbaycanın işğal olunmuş torpaqlarından işğalçı dəstələri çıxarmaq, respublikanın ərazi bütövlüyünü bərpa etmək üçün, Azərbaycanın müstəqilliyini daha möhkəmləndirmək üçün daxili vəziyyət daim sabit olmalı və hər bir təxribatçı qüvvənin qarşısı alınmalıdır.

Ancaq təəssüf olsun ki, bəzi qüvvələr yenə də Azərbaycanda qarışıqlıq salmaq, yaranmış sabitliyi pozmaq, xalqımıza cürbəcür çətinliklər yaratmaq istəyirlər. Siz bunu görürsünüz və çıxışlarınızdan, qəbul etdiyiniz qətnamədən belə qənaətə gəlirəm ki, bütün bu hərəkətləri pisləyir, bunlara etiraz edirsiniz, Azərbaycanın dövlətçiliyini qoruyursunuz və qoruyacaqsınız. Mən isə sizə söz verirəm ki, biz yaranmış ictimai-siyasi sabitliyi, Azərbaycanın dövlətçiliyini bundan sonra da qoruyacağıq, buna qadirik. Azərbaycanın dövlət müstəqilliyini qoruyub inkişaf etdirəcəyik.

Azərbaycanda demokratiya bərqərar olub, demokratiya inkişaf edir. Oktyabr ayının 11-də keçiriləcək Prezident seçkiləri Azərbaycanın demokratiya yolu ilə getməsini dünyaya bir daha nümayiş etdirəcəkdir və ölkəmizdə demokratiyanın təntənəsinə çevriləcəkdir. Mən çox məmnunam ki, siz oktyabr ayının 11-də keçiriləcək Prezident seçkilərinin siyasi əhəmiyyətini və mahiyyətini yaxşı bilirsiniz. Bu gün öz çıxışlarımızda, qəbul etdiyiniz qətnamədə və xalqa ünvanlanmış müraciətinizdə bəyan etdiniz ki, bu seçkilərin keçirilməsi üçün vətəndaş kimi öz mövqeyinizi bundan sonra da bildirəcək və öz xidmətlərinizi göstərəcəksiniz.

Prezidentliyə altı namizəd var. Hər bir namizədin sərbəst fəaliyyət göstərməsi üçün imkanlar yaranıbdır. Seçicilər, siz isə istədiyiniz adama səs verə bilərsiniz. Bunun üçün hər kəs sərbəstdir, azaddır. Azərbaycanın Prezidenti kimi mənim məqsədim ondan ibarətdir ki, respublikada Prezident seçkilərinin sərbəst, azad, ədalətli keçməsi təmin olunsun. Bu, sizdən, hər bir vətəndaşdan, hamınızdan asılıdır. Bu gün burada hökm sürən əhvali-ruhiyyə göstərir ki, biz sizinlə birlikdə buna nail olacağıq.

Siz burada mənim ünvanıma çox dəyərli sözlər dediniz. Bunlara görə sizə

təşəkkür edirəm. Sizə bildirirəm ki, mənim həyatımın mənası və məqsədi həmişə xalqa xidmət etməkdən ibarət olubdur. Bu gün də burada bütün günü sizinlə birlikdə Azərbaycanın təhsil məsələlərinin müzakirəsində iştirak edərək, ölkəmizin bu gününə və gələcəyinə öz xidmətimi göstərmək istəyirəm. Siz hətta mənə, belə başa düşürəm, bir fəxri ad da verdiniz. Bu, mənim üçün gözlənilməz hadisə, sürpriz oldu. Bunu sadəcə, sizin, ictimai təşkilatın mənə göstərdiyi hörmət kimi və mənim xidmətlərimə verdiyiniz qiymət kimi qəbul edir və sizə təşəkkür edirəm.

Görürsünüz ki, mən nümayəndə olmasam da, sizin qurultayınızda fəal iştirak edirəm. Hətta təhsil şurası haqqında siyahı oxunanda yalnız mən təşəbbüs göstərdim. Amma gördüm ki, buraxılmış həmin səhvi siz də görmüşdünüz, ancaq nədənsə, bunu demədiniz. Bəlkə də, mən deməsəm, siz deyəcəkdiniz.

Bu barədə öz fikrimi izah etmək istəyirəm. Mən belə anladım ki, qurultayda yaradılan təhsil şurası ictimai təşkilatdır, müəllimlərin, təhsil işçilərinin təşkilatıdır. Ona görə də belə bir təşkilatda yalnız müəllimlər, bilavasitə təhsil sahəsində işləyənlər, bilavasitə təhsillə məşğul olanlar olmalıdırlar. Belə bir şuraya hökumət üzvlərini və Prezident Aparatının bir çox məsul vəzifəli şəxslərini, başqa vəzifəli şəxsləri, hətta daxili işlər nazirini, müdafiə nazirini və baş prokuroru salmaqla bu şuranın tamamilə mənasını dəyişirsiniz.

Əksinə, mən hesab edirəm ki, bu şuranın müstəqil olması üçün orada dövlət nümayəndələri olmamalıdır. Gərək bu şura müstəqil olsun, ictimai təşkilat olsun, öz sözünü hökumətə, hakimiyyət orqanlarına desin və öz təkliflərini irəli sürsün. Şurada nazirlərin olması sizə lazım deyildir. Mən isə söz verirəm ki, hər bir nazirin, hökumət nümayəndəsinin sizin şuranın bütün təkliflərinə, qərarlarına baxmasını təmin edəcəyəm. Ona görə də şuranın tərkibində onların olmasına ehtiyac yoxdur. Güman edirəm ki, şuranın tərkibi sizin də, mənim də düşündüyümüz kimi olacaqdır. Əminəm ki, bu şura formal bir təşkilat yox, işlək təşkilat olacaq və təhsilin, müəllimin, məktəbin problemlərini həll etmək üçün həmişə fəal olacaqdır. Azərbaycanın Prezidenti kimi mənim tərəfimdən isə bu şura həmişə dəstək ala biləcəkdir.

Əziz dostlar, siz mənim yenidən Prezident seçilməyim üçün burada öz fikirlərinizi bildirdiniz. Buna görə, sizə təşəkkür edirəm. Sizə açıq demək istəyirəm ki, mən Azərbaycan xalqı qarşısında öz borcumu yerinə yetirmişəm. İndiyə qədərki həyatım və gördüyüm işlər bunu hər bir insan üçün sübut edir. Ancaq mən Azərbaycanı bu müstəqillik dövründə daha da inkişaf etdirmək üçün bundan sonra da öz xidmətlərimi göstərməyi lazım bilirəm. Ona görə ki, mən hiss edirəm – sizin də, Azərbaycan vətəndaşlarının əksəriyyətinin də buna ehtiyacı var. Bu ehtiyacı hiss edərək mən yenidən Prezident seçilməyimə razılıq vermişəm.

Mən bəyan edirəm ki, əgər siz, Azərbaycanın seçiciləri mənə səs verib 11 oktyabrda məni yenidən Prezident seçsəniz, gələcəkdə də bu vəzifəni namusla, şərəflə yerinə yetirəcəyəm.

Əziz və hörmətli müəllimlər! Mən sizin hamınıza cansağlığı, səadət, gələcək işlərinizdə uğurlar arzu edirəm. Sizi əmin edirəm ki, mən daim sizinlə olacağam. Siz mənim ən yaxın dostlarımsınız və heç bir qüvvə məni sizdən, sizi məndən ayıra bilməz!

Eşq olsun Azərbaycan müəlliminə!

Eşq olsun Azərbaycan məktəbinə!

Yaşasın müstəqil, demokratik Azərbaycan!

**25 sentyabr 1998-ci il**

* 5

# HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCAN MÜƏLLİMLƏRİ QURULTAYLARI

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev təhsilimizə və təhsil işçilərinə həmişə xüsusi qayğı göstərmişdir. XX əsrin yetirdiyi ən böyük dahilərdən biri olan ulu öndərimiz təhsili millətin gələcəyi hesab etmişdir.

XX əsr Azərbaycanımızın təhsil sahəsində ən böyük uğurları da, dünya təhsilinə inteqrasiyası da, ilk növbədə ulu öndərimiz Heydər Əliyevin adı ilə bağlıdır. Məhz, Heydər Əliyev vətənin ən təlatümlü günlərində, xalqımız siyasət aləmində təklənəndə öz müdrikliyi ilə dünya liderləri zirvəsinə qalxmış və özü ucaldıqca, millətini də ucaltmışdır. Onun rəhbərliyi ilə bir qərinə ərzində ölkəmizdə dövlət quruculuğunun əsası qoyulmuş, onun dayaqları möhkəmləndirilmiş və öz iqtisadiyyatı və mədəniyyəti ilə bütün dünyada Vətənimizi tarixi ənənələri olan qədim diyar kimi şöhrətləndirmişdir. Zaman anlamında ən uzağı görən, onu hamıdan yaxşı duyan, hər işdə hamıdan tez və doğru qərar çıxarmağı bacaran, özünə və ideyasına inam yaradan, ən çətin məqamlarda uğur qazanacağına ümidini itirməyən, bir lider kimi rəhbərlik etdiyi dövrdə həmişə öz xalqının önündə gedən, ən çətin zamanlarda belə ondan ayrılmayan, əleyhdarları çox olsa da, böyük iradə sahibi kimi xalqını bəlalardan xilas etmək yolunda fədakarlıq göstərən ulu öndərimiz Heydər Əliyev həmişə uzaqgörənliklə təhsilimizin gələcəyinə düzgün istiqamət vermişdir.

Təsadüfi deyildir ki, qədirbilən müəllimlərimizin möhtəşəm XIV qurultayı da məhz Heydər Əliyev Mərkəzində keçirilmişdir. Bu da ulu öndərə ən böyük hörmətin təcəssümü kimi dəyərləndirilməlidir.

Tarixi inkişafın qloballaşma dövründə Heydər Əliyev zirvəsi daha möhtəşəm, daha əzmli, daha qüdrətli və daha çoxşahəli görünməkdədir. Tarixdən də məlumdur ki, belə şəxsiyyətlər harada işləməsindən asılı olmayaraq, həmişə öz xalqının taleyi uğrunda ən ağır günlərdə belə vətənin haqq səsini ucaltmış, öz ölkəsini bütün varlığı ilə dünya arenasına çıxarmağa müvəffəq olmuşdur.

Müasir Azərbaycan tarixinin ən şərəfli səhifələrindən biri sayılan ötən əsrin 70-ci illərində Heydər Əliyev kimi bir şəxsiyyətin respublika rəhbərliyinə gəlməsi Azərbaycan üçün yeni dövrün başlanğıcı oldu.

O vaxtdan sonra Azərbaycanın bütün sferalarında, o cümlədən təhsilində də yeni dirçəliş erası başlandı. Müdrik rəhbərimiz təhsilə həmişə xalqın gələcəyinin təməl daşı, "millətin gələcəyi" kimi baxmışdır.

Təhsilimizdəki uğurlara yol açan, onun dirçəlişi üçün şərait yaradan Heydər Əliyev çox sonralar yazırdı: "...Məktəb, maarif, təhsil işi ilə həmişə sıx bağlı olmuşam... Hesab edirəm ki, cəmiyyət haradan olursa-olsun, nədən olursa-olsun kəsib təhsilə xərcləməli, gənc nəslin təhsilinə, müəllimə kömək etməlidir. Bu, mənim prinsipial mövqeyimdir. Azərbaycana rəhbər seçiləndə də bu mövqedə olmuşam, indi müstəqil Azərbaycanın dövlət başçısı kimi də bu mövqedəyəm. Mən həyatımın bütün mərhələlərində məhz belə mövqedə durmuşam".

O, Azərbaycana başçılıq edəndə düşünürdü ki, ölkəmiz yeni əsrin, yeni minilliyin, yeni keyfiyyət dəyişikliyinin başlanğıcındadır. Qədim tarixə və zəngin mədəniyyətə malik olan xalq strateji cəhətdən Şərq və Qərb sivilizasiyalarının qovuşduğu bir məkanda yerləşən yurdumuz artıq iqtisadi, siyasi və mədəni həyatın yeni inkişaf strategiyasının aydın istiqamətləri ilə tanınır, əsrin nəhəng müqavilələrinə imza atır. Xalqımızın qısamüddətli keçdiyi tarixi yollara nəzər salaraq o illəri belə xatırlayırdı: "Azərbay-

canda xalq inkişaf edibdir, savadsızlıq tamamilə ləğv olunubdur. Ali təhsil ocaqları, universitetlər yaranıbdır, elmi müəssisələr yaranıbdır, böyük sənaye potensialı yaranıbdır, böyük iqtisadi potensial yaranıbdır. Mədəniyyətimiz çox sürətlə inkişaf edibdir. Ədəbiyyat, incəsənət inkişaf edibdir... İndi bunlar bizim müstəqil dövlətimiz üçün böyük iqtisadi, sosial, elmi potensial yaradıbdır. Buna görə biz bu dövrü də layiqincə qiymətləndirməliyik. Tarixdə heç bir səhifə təhrif olunmamalıdır. Müsbət-müsbət, mənfi-mənfi...”

Bəli, həqiqətən XX əsrdə Azərbaycanın böyük nailiyyətləri içərisində təhsil, elm və mədəniyyət sahəsindəki əsaslı keyfiyyət dəyişiklikləri ön plana keçmişdir. O da tarixi həqiqətdir ki, bu gün dünya sivilizasiyasına tam cavab verən milli təhsilimizin, elmimizin, mədəniyyətimizin inkişafında cənab Heydər Əliyevin müstəsna xidmətləri olmuşdur. Azərbaycanın müasir tarixi də, keçən əsrin taleyüklü illəri də, ilk növbədə onun adı ilə bağlıdır.

Müasir Azərbaycanın taleyində dönüş nöqtələrindən biri sayılan 14 iyul 1969-cu il milli tariximizə Heydər Əliyevin rəhbərlik etdiyi böyük bir epoxanın möhtəşəm təməlini qoymuşdur. Onun fəaliyyətinin ancaq bir sahəsindən – elmin, mədəniyyətin və mənəviyyatın üstün inkişafının qüdrətli, əvəzedilməz vasitəsi olan təhsilə qayğısından, xalqın elmi, intellektual potensialının möhkəmləndirilməsi, təhsil sisteminin ahəngdar inkişafı yolundakı titanik xidmətlərini yada salmaq kifayətdir.

Şanlı tariximizin Heydər Əliyev mərhələsi eyni zamanda Azərbaycan təhsilinin, elminin, mədəniyyətinin intibahı dövrü kimi qavranılır və bu mərhələdə ən ağır yükü məhz onun daşıdığı hamı tərəfindən təsdiq olunur.

Heydər Əliyev Azərbaycan təhsilinin inkişafı tarixindən danışarkən onun keçdiyi yollara nəzər salmağı, hər şeyə obyektiv yanaşmağı vacib sayırdı. Azərbaycan müəllimlərinin XI qurultayında dediyi belə bir konseptual fikir də məhz bunu təsdiq edir. O xatırladırdı ki, “...xalqımızın maariflənməsi, təhsillənməsi üçün o dövr çox əhəmiyyətli bir dövr olmuşdur. Biz bunu qiymətləndirməliyik, heç vaxt unutmamalıyıq. Biz tariximizə doğru, ədalətli qiymət verməliyik”.

Ulu öndər Azərbaycan müəllimlərinin qurultayları haqqında çox aydın təsəvvürə malik idi. O, bu qurultayların əhəmiyyətini yüksək qiymətləndirirdi. Aydındır ki, müəllimlər qurultayları bütün xalqların tarixində əlamətdar hadisə kimi qalır. Ona görə də ulu öndərimiz Azərbaycan müəllimlərinin qurultaylarına tarixi dövrün ən böyük mədəni hadisəsi kimi yanaşmışdır. O, XX əsrdə qazandığımız müstəqilliyimizin bəhrəsi olan son müəllimlər qurultaylarının çağırılmasına da böyük əhəmiyyət verir və deyirdi: “Sizin bu qurultayınız müstəqil respublikamızın ilk müəllimlər qurultayı olsa da, Azərbaycanda müəllimlər qurultaylarının ictimai-siyasi hadisə kimi tarixi qədim, əhəmiyyəti danılmazdır. Müəllimlər vaxtaşırı yığışaraq təhsilin qarşısında duran problemlərin həlli üçün yollar aramalı olmuşlar. Hələ 1883-cü ildə Nuxa qəza müəllimlərinin qurultayı, Cavanşir, Şuşa, Cəbrayıl qəzalarında çağırılmış sahə qurultayları 1906-cı ildə Bakıda Azərbaycan müəllimlərinin birinci qurultayının çağırılmasına zəmin yaratmışdır. Həsən bəy Zərdabi, Nəriman Nərimanov, Süleyman Sani Axundov, Abdulla Şaiq, Üzeyir Hacıbəyli və başqa görkəmli maarifçilərin fəal iştirakı ilə keçirilən həmin qurultay Azərbaycanın ictimai-pedaqoji fikir tarixində mühüm hadisə olmuşdur. Sonralar Azərbaycan müəllimlər qurultayları müntəzəm olaraq keçirilməyə başlamışdır. Lakin sizin qurultayınız əvvəllərdən qarşısında qoyduğu məsələlərin daha vacib, daha aktual olması ilə səciyyələnir. Çünki dövr cəmiyyətimizin

qarşısında çox məsul, qlobal tələblər qoyur və onların həlli bu gün sizin tərbiyə etdiyiniz gənc nəsillərin öhdəsinə düşür.”

Qeyd etmək lazımdır ki, ulu öndər SSRİ dövründə Azərbaycana rəhbərlik edəndə müəllimlərin ancaq bir qurultayı–XI qurultayı keçirilmişdi. Ondan əvvəlki ən son qurultay 11 il əvvəl – 1967-ci ildə çağırılmışdı.

1978-ci ildə Azərbaycan müəllimlərinin XI qurultayının çağırılması da SSRİ müəllimlər qurultayının çağırılması ilə bağlı idi. Çünki 1978-ci ildə Moskvada müəllimlərin III Ümumittifaq qurultayının çağırılması haqqında qərar qəbul olundu. Həmin qurultaya nümayəndələr yerlərdən seçilməliydi. Ona görə də, bütün təşkilati işlərin aparılmasına start verildi. Bu məsul işə ciddi hazırlıq gedirdi. İşinin çox olmasına baxmayaraq ölkə başçısı Heydər Əliyev bu işlərlə müntəzəm maraqlanırdı. Bu böyük dövlət əhəmiyyətli məsələyə ideoloji cəhətdən ən məsul adamlar cəlb olunmuşdur. Az müddətdə qurultayın vaxtı, yeri müəyyənləşdirildi və sonra qurultayın ssenarisi hazırlandı. Müvafiq göstərişlər əsasında yerlərdə konfranslar keçirildi. Müəllimlər qurultayında məruzəçi kimi Azərbaycan SSR-nin maarif naziri M.Mehdizadə çıxış etməli idi. Çox zəngin faktlar əsasında hazırlanan bu məruzədə uğurlar da, nöqsanlar da məntiqi ardıcıllıqla əsaslandırılmışdı. Məruzənin mətninə MK-da da baxılmışdı. Qurultay Respublika Sarayında toplandı. Qurultayın öz işinə Azərbaycan KPMK-nin birinci katibi Heydər Əliyevin çox əhatəli təbriki ilə başlaması zalda böyük canlanma yaratdı. O, geniş nitq söylədi. Təhsilimizin qarşısında duran problemləri bütün iştirakçıların nəzərinə çatdırdı. Tənqidi fikirlərə də yer verildi. Dəfələrlə gurultulu alqışlarla qarşılanan bu tarixi çıxış qurultayın işinə yeni istiqamət verdi. Bu çıxışdan sonra qurultayın gedişində əsaslı dönüş yarandı. Zalda nikbin əhvali-ruhiyyə hökm sürürdü. Elə bil hər şey yeni məna almışdı. Çox möhtəşəm, çox unudulmaz və çox həyəcanlı dəqiqələr sürətlə gəlib keçirdi.

Söz yox ki, vəziyyət dəyişdiyi üçün maarif naziri M.Mehdizadə də məruzəsindəki standartlardan kənara çıxmalı oldu. Bir sıra mühüm düzəlişlər etmək zərurəti yarandı. Bütün bunlar isə, elə ustalıqla edildi ki, çoxları heç hiss edə bilmədilər. Çıxış edənlər də, öz çıxışlarına əl gəzdirməli oldular. Qurultaydakı ab-hava nümayəndələrə yeni ruh, yeni qüvvət verdi. 1967-ci il qurultayının iştirakçısı kimi deyə bilərəm ki, qurultaylarımızın tarixində belə dönüş ilk dəfə idi baş verirdi. İştirakçıların çöhrəsinə bir sevinc, bir fərəh çökmüşdü. Bütün müttəfiq respublikalardan gələn qonaqlar da bu hala heyran qalmış, bu yüksək təşkilatçılığı qibtə və heyranlıqla seyr edirdilər. Qurultay öz işini ən yüksək səviyyədə başa çatdırdı. Qurultayın sonunda Moskvaya göndəriləcək nümayəndələr də elan olundu. 124 nəfər nümayəndədən başqa, 4 nəfər də dəvət olunurdu. Xoşbətlikdən bu sətirlərin müəllifi də Moskvaya gedənlərin arasında idi. Hər şey dəqiqliklə hesablanmışdı. Bəli, bu böyük tarixi gün yadda qalan, tarixə düşən anlar idi.

Qurultay öz rəsmiyyəti ilə heç də partiya qurultaylarından fərqlənmirdi. Hər işin yerli-yerində olmasının nəticəsi idi ki, Moskvada aydın hiss olunurdu ki, Azərbaycandan seçilmiş nümayəndələr Heydər Əliyevin başçılıq etdiyi respublikadan gəlmişdilər. Hamı bizə qibtə ilə yanaşırdı. Necə də fəxr ediləsi anlar yaşanırdı. Qurultay öz işini uğurla başa vurdu, Azərbaycan nümayəndələri hamısı bir yerdə tarixi şəkil də çəkdirdilər.

1978-ci ildən 1998-ci illədək arada bir qurultay 1987-ci ildə keçirilsə də, o illər SSRİ-nin çökməsi ərəfəsinə düşdüyünə görə, əvvəlki solğunluğuna görə fərqlənirdi. Xüsusən Azərbaycanlılar üçün o qədər

maraqlı deyildi. Heydər Əliyevə haqsızlıq edilirdi. Axı, qurultay nümayəndələri həmişə rəyasət heyətində Heydər Əliyevi görmürdü. Bəli, indi Heydər Əliyev orada iştirak etmirdi. Lakin təbiət hər şeyi gözəl nizamlayır və ən böyük hakim də zamandır. Ulu öndər Sovet rejiminin sərt şəraitində bir sıra çətinliklərlə qarşılaşsa da, arzu olunmayan hadisələrlə üz-üzə gəlsə də, zamanın sınağından çıxdı, müstəqil respublikanın lideri oldu və müstəqil Azərbaycanın ilk müəllimlər qurultayında iştirak etmək xoşbəxtliyi yenə də ona – ulu öndərə, xalqımızın böyük oğluna nəsib oldu. Müstəqilliyini yenidən əldə etmiş ölkənin bütün sahələrdə çox ciddi fəaliyyətə başlaması ümummilli liderimiz Heydər Əliyevin adı ilə bağlıdır. Bəli, ümummilli lider müstəqil Azərbaycanda keçirilən ilk müəllimlər qurultayında iştirak etdi və bu qurultaya hazırlıq ərəfəsində öz fikir və müşahidələrini söylədi. O ərəfədə ulu öndər deyirdi: "Mən 1998-ci ilin avqustunda eşitmişəm ki, sentyabrda Azərbaycan müəllimlərinin qurultayı keçiriləcəkdir. Müəllimlər buna hazırlaşırlar. Güman edirəm ki, orada müəllimlər qarşısında söhbət aparılacaq, əgər imkan olsa, mən də iştirak edəcəyəm. Müəllim adı dünyada ən yüksək addır. Məsələn, şəxsən mən yer üzündə müəllimdən yüksək ad tanımıram. Çünki hər birimizə təhsil, bilik verən, bu səviyyəyə qaldıran məktəbdir və məktəblərdə təhsil verən də müəllimdir. Orta məktəb olsun, yaxud ali məktəb fərqi yoxdur, hamısında təhsil verən müəllimdir. Ona görə də həyatımda ən çox sevdiyim adamlar mənim müəllimlərim olublar. Mənə ilk təhsil verən, birinci sinifdən başlayaraq, təhsil verən müəllimlərin hamısını böyük minnətdarlıqla xatırlayıram və bu fürsətdən istifadə edib, müəllim peşəsinə bir daha yüksək hörmət və ehtiramımı bildirirəm. Sizə də tövsiyə edirəm ki, müəllim adını həmişə yüksək tutasınız".

Göründüyü kimi, hələ qurultaydan xeyli əvvəl ümummilli lider qurultayın məqsədi, ona hazırlığın vəziyyəti haqqında pedaqoji ictimaiyyətə məlumat verməklə onu düzgün istiqamətləndirməyi də lazım bilmişdir.

Bu da təbii idi. Hələ xeyli əvvəl xalq öz seçimini etmişdi. 1993-cü ildə xalqın tələbi ilə Heydər Əliyevin yenidən hakimiyyətə gəlişi, sözün həqiqi mənasında Qayıdış idi. Bu, xalqımızın müdrik oğlunun Sovet Azərbaycanı üçün arzuladığı, lakin sistemin sərt siyasətinin tələbləri ucbatından edə bilmədiyi son dərəcə əhəmiyyətli işlərin müstəqil Azərbaycan üçün həyata keçirməyə qayıdışı idi.

Tarix göstərdi ki, vəziyyət ağır olsa da, Azərbaycan həqiqətlərini dünyaya etiraf etdirən, dünyanı Azərbaycana yönəldə bilən, bütövlükdə Azərbaycanın dirçəlişi və inkişafına nail olmaq kimi çox böyük və nəhəng işlərin öhdəsindən gələ bilən də yalnız Heydər Əliyev müdrikliyi oldu. İnkişaf öz təməli üzərində qurulmağa yönəldi. Ən işıqlı ideyaların həyata keçirilməsinə başlandı. Təhsilimiz özünün uğurlu gələcəyinə qədəm qoydu. Yeni islahatlar dövrü başlandı.

1998-ci il martın 30-da "Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyası haqqında" ulu öndərin tarixi Sərəncamı verildi. Məhz bu Sərəncamdan sonrakı illərdə ümummilli liderimizin təhsilimizə və təhsil işçilərinə göstərdiyi xüsusi qayğısının, onun vəfatından sonra isə ideyalarının layiqli davamçısı olan möhtərəm İlham Əliyevin bu sahəyə diqqətinin ifadəsi olan bir sıra direktiv sənədlər imzalandı. Təhsilə aid yeni Dövlət Proqramları qəbul olundu.

Aydındır ki, Heydər Əliyevin təhsilə qayğısının dərin kökləri vardı. Bunun bir səbəbi o idi ki, ulu öndərin əmək fəaliyyətinə pedaqoji sahədən başlayan müəllimlərlə görüşü həmişə ona öz gəncliyini xatırladır və hər dəfə bunlar tarixə yeni səhifələr ya-

zırdı. Belə görüşlər ötən əsrin 70-80-ci illərində daha tez-tez baş verirdi. O özü müəllimlərlə görüşməyə böyük həvəslə gəlirdi. Belə görüşlərdən biri 1981-ci ildə beşilliyin yekunu ilə əlaqədar Azərbaycan müəllimlərindən 369 nəfərin orden və medallarla təltif olunması zamanı baş tutmuşdu. Bir qayda olaraq SSRİ üzrə təltiflər yerlərdə təqdim edilirdi. Təltif olunanlar Ali Sovetə çağırılırdılar. Lakin bu dəfə vəziyyət dəyişdi. Nazirliyə bildirildi ki, təltifləri Heydər Əliyev özü şəxsən təqdim edəcəkdir. Bu təntənəli anın vaxtı və yeri də müəyyən edildi. Ölkə başçısı müəllimlərlə Gənclər meydanı 3-də, Siyasi Maarif evində görüşəcəkdi. Bu, ölkə başçısının XI qurultaydan sonrakı müəllimlərlə ən genişmiqyaslı görüşü idi. Böyük hazırlıq işləri başlandı. O zaman bu sətirlərin müəllifi Maarif Nazirliyində kadrlar idarəsinin rəisi və aparat partiya komitəsinin katibi vəzifəsini daşıyırdı. Ona görə də, məsul şəxs kimi bu işə qatılması zəruri idi. Hər şey gözlənilən kimi oldu. İşin səmərəli təşkili məqsədilə zalda hər kəs öz yerində oturduldu. İlk növbədə Lenin ordeni, Oktyabr inqilabı ordeni ilə təltif olunanlar ön cərgədə yerləşdirildi. Ulu öndər zaldakılarla salamlaşdıqdan sonra müəllimləri bu şərəfli işə görə təbrik etdi və sonra mükafatları şəxsən təqdim edərək, onların əlini sıxdı və hər birini ayrıca təbrik etdi. Müəllimlər üçün ən şərəfli dəqiqələr başlanmışdı. Təltif olunanlara zalın reaksiyası da maraqlı idi. Yaddaqalan bir an da oldu. O zaman nazirliyin Baş Məktəblər idarəsinin rəisi, sonralar 24 il “Azərbaycan məktəbi” jurnalının baş redaktoru işləmiş təcrübəli təhsil işçisi, jurnalist, əməkdar müəllim Zəhra Əliyeva da təltif olunanlar arasında idi. Zəhra xanımın adı çəkiləndə zalda gurultulu alqışlar qopdu. Bu, dərhal ulu öndərin də diqqətini cəlb etdi. Ona görə də ulu öndər Zəhra xanımı diqqətdən kənar buraxmadı. Təltifini təqdim edərkən bir anlıq onunla söhbət də etdi. Bu, maarifimizin fədailərindən olan xanıma, müəllimə, onun simasında Maarif Nazirliyinə böyük hörmətin ifadəsi idi. Zalda əyləşənlər uzun müddət təhsil sahəsində vicdanla, fədakarlıqla çalışan bu maarif fədaisinə göstərilən münasibətə rəğbətlə yanaşır, böyük şəxsiyyətin alicənablığına qibtə edirdilər. Zaldakılar Zəhra xanım yerə enəndə onu yenə də alqışladılar.

Ölkəmizdə məqalələr müəllifi, dərslik müəllifi kimi tanınan Zəhra Əliyeva nazirlikdə işlədiyi müddətdə bütün müəllimlər qurultaylarının nümayəndəsi olmuşdu. Gözəl yaddaşa, yazı qabiliyyətinə, nitq manerasına malik olan bu alim-pedaqoq həm də Azərbaycan qadın hərəkatının ən nüfuzlu veteranlarından biri kimi də tanınırdı. Bu görüş uzun illər xatirələrdən silinmədi.

Müstəqillik dövründə müəllimlər qurultaylarının müntəzəm olaraq beş ildən bir çağırılması məqsədəuyğun sayıldı. Əlbəttə, SSRİ dövründə belə ola bilməzdi. O zaman Ümumittifaq müəllimlər qurultayının vaxtı müəyyənləşdirildikdən sonra müttəfiq respublikalarda buna uyğun vaxt seçilirdi və yerli qurultaylara icazə verilirdi. Təsadüfi deyildir ki, ötən əsrin 60-80-ci illərində 1960-cı il qurultayı ilə 1967-ci il qurultayı arasında 7 il, 1967-ci il qurultayı ilə 1978-ci il qurultayı arasında 11 il, 1978-ci il qurultayı ilə 1987-ci il qurultayı arasında 9 il fasilə verilmişdi. Yuxarıda deyildiyi kimi, ulu öndərin respublikamıza rəhbərlik etdiyi SSRİ dövründə yalnız bir qurultay – 1978-ci il qurultayı çağırılmışdı. Bu da yaddaşlarda ən təntənəli qurultaylardan biri kimi qaldı. Belə ki, 1987-ci ildə qurultay ərəfəsində bu on bir ili əhatə edən “Qurultaydan qurultaya” adlı kitabça çapdan çıxdı və 1967-1978-ci illərdə Azərbaycanda xalq maarifinin inkişafına dair faktlarla zəngin olan bu kitab Azərbaycan müəllimlərinin XI qurultayı iştirakçılarına hədiyyə edildi. 3 min tirajla buraxılan, 112 səhifəlik bu kitabça nümayəndələri və qonaqları xeyli məlumatlandırdı. Bu kitab

çox maraqla qarşılandı. Burada yeniliklərlə yanaşı müəllimlərin mənəvi həvəsləndirilməsi ilə bağlı çox dəyərli faktlar da diqqəti cəlb edirdi. Kitabçadakı rəqəmlər çox şeydən xəbər verirdi.

Bu faktlar bu gün də tarixi əhəmiyyətini itirməmişdir. Burada maarif sistemindəki yüksək mənəvi keyfiyyətlərə malik səriştəli müəllimlərlə möhkəmləndirilməsi sahəsində görülən işlərdən də danışılırdı. Burada göstərilirdi ki, 1981-1985-ci illərdə attestasiyadan keçən 96,9 min müəllimdən 720 nəfərinə “metodist müəllim”, 2181 nəfərinə “baş müəllim” adı verilmişdir, onların bütün kateqoriyalar üzrə sayı 5468-ə çatmışdı. Bu illərdə 22,4 min ali təhsilli gənc mütəxəssis pedaqoji fəaliyyətə başlamışdır. Hər il 20 minədək pedaqoji işçi müxtəlif kanallarla təkmilləşdirmə kurslarından keçirilmişdir.

Heydər Əliyevin başçılıq etdiyi çox da böyük olmayan respublikada Azərbaycanda müəllimlərdən 2 nəfər Sosialist Əməyi Qəhrəmanı, 3 nəfər SSRİ-nin xalq müəllimi, 468 nəfər Azərbaycan SSRİ-in Əməkdar müəllimi adını daşıyırdı. 12 nəfər N.K. Krupskaya adına medalla təltif olunmuş, 14 nəfərə Krupskaya adına mükafat verilmişdi. Bunlardan əlavə 852 nəfər SSRİ Maarif əlaçısı, 7541 nəfər Azərbaycan SSRİ Maarif əlaçısı vardı. 9244 nəfər SSRİ orden və medalları ilə təltif olunmuşdu. 17576 nəfər “Əmək veteranı” medalına layiq görülmüşdü.

Məktəb rəhbərləri də keyfiyyətcə yaxşılaşmışdı. 3849 orta və səkkizillik məktəbin direktorunun və 6365 direktor müavininin hamısı ali təhsilli idi. SSRİ üzrə bu rəqəm çox yüksək göstərici sayılırdı. Qadınlar orta məktəb direktorlarının 18,6, səkkizillik məktəb direktorlarının 13,4 faizini təşkil edirdi. Məktəb rəhbərlərindən 2590 nəfəri yerli sovetlərin deputatları seçilmişdi. Yevlax rayonundakı Xaldan kənd orta məktəbin direktoru Z.Şöyübov SSRİ xalq müəllimi, Bakı şəhərindəki 132 nömrəli orta məktəbin direktoru, respublikanın əməkdar müəllimi A.Təhmasib SSRİ və Azərbaycan SSR Ali Sovetinin deputatı idi. Direktorlardan 62 nəfəri respublikanın əməkdar müəllimi, 113 nəfəri SSRİ xalq maarifi əlaçısı idi. On birinci beşillikdə xalq maarifi sahəsindəki nailiyyətlərinə görə SSRİ orden və medallarına layiq görülənlərdən 58 nəfəri məktəb direktoru idi.

Bu rəqəmlər özlüyündə ulu öndərin hakimiyyəti dövründə mənəvi həvəsləndirmə məsələlərinə geniş meydan verildiyinin bariz ifadəsi kimi səslənirdi.

Bütün bunları yaxşı bilən ulu öndər müstəqil Azərbaycan müəllimlərinin ilk qurultayını təbrikində də yada salmışdı. O qeyd edirdi ki, “Azərbaycan müəllimlərinin cəmiyyətimizin həyatında oynadığı rol müstəsna əhəmiyyətə malikdir. Müəllimlik xalqımızın ən çox hörmət etdiyi, ən çox əziz tutduğu bir peşədir. Təsadüfi deyil ki, cəmiyyətimizin ən layiqli nümayəndələri sənətindən, işindən asılı olmayaraq müəllim adlandırılır. Tariximizin bütün dövrlərində bu ada məhəbbətlə yanaşılmış və onun daşıyıcılarına xüsusi ehtiram bəslənmiş, diqqət göstərilmişdir”.

Sonra ulu öndər bir qədər tarixə nəzər salır və deyirdi: Azərbaycanda tərbiyə və təhsil sisteminin qədim və zəngin tarixi vardır. Hələ atəşpərəstliyə sitayiş edən azərbaycanlılar “Avesta”dan uşaqların dini-mənəvi və fiziki tərbiyəsi üçün, onlara oxu və yazı vərdişləri aşılamaq məqsədi ilə istifadə edirdilər. III-V əsrlərdə Sasanilərin hökmranlığı altında olan Azərbaycanda “dəbiristanlar”-ibtidai təhsil verən məktəblər geniş yayılmışdı. Bəzi tarixi mənbələrdə V-VII əsrlərdə Azərbaycanda ana dilində təhsil verən məktəblərin fəaliyyət göstərdiyi bildirilir.

Xalqımızın dahi oğlu müxtəlif tarixi məqamlara nəzər saldıqdan sonra müstəqil respublikanın bu gününə qiymət verirdi:

Azərbaycanın öz müstəqilliyini bərpa etməsi digər sahələrdə olduğu kimi, təhsil sistemi qarşısında da böyük vəzifələr qoymuşdur. Müstəqillik dövrünün tələblərinə cavab verən yeni təhsil sisteminin yaradılması üçün köklü islahatların həyata keçirilməsi zəruri və təxirəsalınmazdır. Bu yolda çətinliklər də az deyildir. Sevindirici haldır ki, zəngin təcrübəyə və qədim ənənələrə malik Azərbaycan məktəbi bu gün də qarşıya çıxan bütün çətinliklərə və keçid dövrünün yaratdığı sıxıntılara baxmayaraq, məhz Azərbaycan müəlliminin təlim-tərbiyəyə olan sönməz həvəsi, xalqımızın və respublikamızın parlaq gələcəyinə olan qırılmaz ümidi sayəsində öz işini uğurla davam etdirir.

Ümummilli lider eyni zamanda müəllimlərin diqqətini ölkəmizin bir nömrəli probleminə də yönəldirdi. Müstəqillik dövründə üzləşdiyimiz ağır bəla – Ermənistanın Azərbaycana qarşı hərbi təcavüzü, ərazimizin 20 faizinin işğal edilməsi ilə yaranmış sosial-iqtisadi çətinliklər nəticəsində ən çox zərər dəymiş sahələrdən biri də təhsildir. İşğal olunmuş ərazilərdə yüzlərlə təlim-tərbiyə ocağı yerlə yeksan edilmiş, onun illərlə yaradılmış maddi bazası qarət edilmiş, öz yurd-yuvasından didərgin düşmüş soydaşlarımız min bir əzab-əziyyətə dözərək çadırlarda, təlim-tərbiyə üçün yararsız olan yerlərdə təhsil almaq məcburiyyətində qalmışlar. Bütün bu məşəqqətlərə sinə gərən Azərbaycan müəllimi bir daha şərəfli müəllim adını daşımağa layiq olduğunu sübut etmişdir.

Təbrikin sonunda deyilirdi: Bu gün ölkəmizin qarşısında duran problemlərin həllində müəllimlərin fəal iştirakı xüsusi əhəmiyyət kəsb edir. Azərbaycan müəlliminin bir məqsədi, bir amalı olmalıdır: Azərbaycanımızı çiçəklənən, inkişaf edən, firavan, qüdrətli bir dövlətə çevirməyə qadir, müstəqillik ideyalarına sadiq, özünü vətənin azadlığı naminə fəda etməyə hər an hazır olan, yeni təfəkkür tərzini qavrayaraq müasir tələblərə cavab verən sağlam əqidəli, milli ruhlu nəsil yetişdirmək.

Sonra ulu öndər öz fikirlərini ümumiləşdirərək inamla deyirdi: “Ümidvaram ki, müstəqil Azərbaycan müəllimlərinin ən mötəbər məclisi olan bu qurultay təhsilimizin qarşısında duran məsələlərin həlli yolunda mühüm addım olacaq və pedaqoji fikir tariximizdə əhəmiyyətli yer tutacaqdır.”

Hər bir məsələyə diqqət və həssaslıqla yanaşan Heydər Əliyev iş prosesində qurultayın həll etdiyi məsələyə də münasibət bildirmişdi:

Qurultayda baş verən bir məqamı olduğu kimi veririk:

“SƏDR: Sizin çoxsaylı müraciətlərinizdə məsləhət gördü ki, çıxışlar kəsilsin. Kim bu təklifin tərəfdarıdır, xahiş edirəm mandatlarınızı qaldırasınız. Kim əleyhinədir? Yoxdur. Kim səs vermədi? Yoxdur. Təklifiniz yekdilliklə qəbul olundu.

İndi də keçirik qurultayımızın qərarlarının qəbul olunması hissəsinə.

Bir məsələmiz də Azərbaycan Respublikası Təhsil Şurasının seçilməsidir. Təklif vardır ki, Təhsil Şurasının tərkibi 215 nəfərdən ibarət olsun. Təklifi səsə qoyuram. Kim Respublika Təhsil Şurasının tərkibinin 215 nəfərdən ibarət olmasının tərəfdarıdır, xahiş edirəm səs versin. Etiraz edən, bitərəf qalan yoxdur ki, Yoxdur.

Şuranın fərdi tərkibini oxumaq üçün söz Aliyə xanım Təhmasibə verilir.

A.TƏHMASİB: (Azərbaycan Respublikası Təhsil Şurasının fərdi tərkibini oxuyur).

SƏDR: Şuranın tərkibində bütün təbəqələr təmsil olunur. Məşvərət şurasının təklifinə görə şura özünün idarə heyətini seçməlidir. Təhsilin bir çox problemlərini həmin idarə heyəti həll etməyə qadir olacaqdır.

Bu zaman tamaşaçılar arasında oturan HEYDƏR ƏLİYEV qurultay nümayəndələrinin arzularını ifadə edərək dedi: Respublika Təhsil Şurasının tərkibi oxunan siyahıya öz münasibətimi bildirmək istəyirəm. Həmin siyahıya dövlət qurumlarının məsul işçiləri, nazirlər, hətta daxili işlər naziri, müdafiə naziri və baş prokuror da daxil edilib. Məncə, Siz təhsil şurasından çox, sanki Nazirlər Kabineti təşkil etmisiniz. Mən bu təklifə etiraz edirəm və bu şuranın ideyasını başa düşmürəm.

SƏDR: Bu siyahını təqdim edən Məşvərət Şurasının fikrincə, təhsilin çoxsaylı problemləri vardır və bilavasitə əlaqədar məsələlərlə məşğul olan nazirləri Təhsil Şurasına daxil etsək, faydalı olar, məsələnin həlli sürətlənə bilər. Buna görə də təklif edilir ki, Azərbaycanın bölgələrindən siyahıya daxil olunan təhsil işçiləri, görkəmli alimlər, müəllimlər və dövlət qurumlarını təmsil edənlərin bu təhsil şurasında birləşdirilməsi məqsədəuyğun olar.

Məşvərət Şurasının təqdim etdiyi tərkibə dair təklifi səsə qoyuram. Kim lehinədirsə, səs versin. (Heç kəs səs vermədi).

Qurultayımızın qonağı olan möhtərəm Prezidentimiz Heydər Əliyev cənablarının təklifini səsə qoyuram. Kim bu təkliflə razıdırsa, xahiş edirəm səs verin. Kim əleyhinədir? Yoxdur. Kim səs vermədi? Yoxdur. Heydər Əliyevin təklifi yekdilliklə qəbul olundu.

HEYDƏR ƏLİYEV (yerdən): Bu qədər böyük tərkib də, məncə, düzgün deyildir. Tərkibdən bütün dövlət qurumlarının nümayəndələrini çıxarıb yerinə ayrı-ayrı bögələrdən müəllimlər daxil edilməlidir. Dövlət qurumlarının nümayəndələri onsuz da təhsil problemlərinin həllinə yardım etməyə borcludur.

SƏDR: Hörmətli qurultay nümayəndələri! Biz tərkibə 215 nəfər təklif etmişdik. Onda icazə verin tərkibə yenidən baxılmaq üçün siyahını məşvərət şurasına qaytaraq. Qurultayımız növbəti tənəffüsünə qədər yeni tərkibi bizə təqdim etsinlər. Etiraz edən yoxdur ki?

YERDƏN: Yoxdur.

Qurultayda ulu öndər Heydər Əliyev geniş nitq söylədi. (həmin nitq olduğu kimi jurnalımızın bu nömrəsində çap olunur).

Heydər Əliyevin o möhtəşəm tədbirdə uzun illər boyu proqram olacaq çıxışı böyük tarixi əhəmiyyətə malik hadisə oldu. Bütün təhsil işçiləri üçün mənəvi, vicdani vəzifə mahiyyətində dərk olunan bu yüksək məqsədin həyata keçirilməsində əməksevər müəllimlər qarşısında çox ciddi vəzifələr qoyulurdu.

Qurultayda çıxış edənlərin hamısı Heydər Əliyevin burada olmasından, onun dərin məzmunlu nitqindən mənəvi zövq duyur, onun burada olması ilə fəxr edirdilər.

Qurultayda çıxış edənlər də rəhbərin bütün tövsiyələrini yerinə yetirəcəklərini inamla bildirirdilər. Gəncə şəhərindəki 10 nömrəli orta məktəbin ibtidai sinif müəllimi Mətanət Seyidovanın çıxışında bu səmimiyyət çox aydın hiss olunurdu. O deyirdi: “ Azərbaycan müəllimlərinin qurultayında bu ali tribunadan müstəqil Azərbaycan dövlətinin və müstəqilliyinin xilaskarı möhtərəm Prezidentimiz Heydər Əliyev cənablarının qarşısında çıxış etmək mənə nəsib olduğu üçün özümü xoşbəxt sayır və dərin qürur hisləri keçirirəm. İcazə verin, qədim Gəncə şəhərinin çoxminli təhsil işçilərinin səmimi salamlarını hörmətli Prezidentimizə və qurultay iştirakçılarına çatdırım.

Azərbaycanımızın müstəqilliyə qovuşması dövlətçiliyimizin gələcəyi olan Azərbaycan gənclərinin milli və ümumbəşəri dəyərlər ruhunda tərbiyə olunması istiqamətində yeni üfüqlər və geniş imkanlar açmışdır. Bu gün hamıya yaxşı bəllidir ki, gələcəyə olan ümid hissi Heydər Əliyev cənablarının ölkə rəhbərliyinə ikinci dəfə qayıdışı ilə daha da möhkəmlənmiş, başqa sahələrdə oldu-

ğu kimi, təhsildə də baş alıb gedən özbaşınalıqlara son qoyulmuşdur.

Müstəqil Azərbaycanın təhsil sistemində son 5 ildə olan əsaslı dəyişikliklər, irəliləyişlər danılmaz gerçəklikdir və hamıya məlumdur ki, bütün bunlar məhz Heydər Əliyev cənablarının yüksək qayğı və diqqəti sayəsində mümkün olmuşdur. Ölkədə əldə olunmuş ictimai-siyasi sabitlik bizə təhsilin problemləri ilə əsaslı məşğul olmaq imkanı vermişdir."

Zaman göstərdi ki, ulu öndər bu məsələyə uzaqgörənliklə baxmışdır. Bu ənənə indi də davam etməkdədir. XIV qurultayımız ərəfəsində təhsil naziri Mikayıl Cabbarovun da iştirak etdiyi Respublika Təhsil Şurasının yığıncağı çağırıldı, Şuranın 23 nəfərdən ibarət yeni tərkibi seçildi və buraya kənd rayonlarından da nümayəndələr daxil edildi. Təhsil Şurasının sədri vəzifəsinə yenə də yekdilliklə prof. Əjdər Ağayev seçildi. Bu barədə mətbuatda da geniş açıqlama verilmişdir.

Azərbaycan müəllimlərinin bundan əvvəlki 2003-cü il oktyabrın 3-də çağırılan XII qurultayına da ulu öndər Heydər Əliyev təbrik məktubunu göndərmişdi. Məktubu Prezident İcra Aparatının Humanitar siyasət şöbəsinin müdiri Fatma Abdullazadə oxumuşdu. Bu təbrikdə də Prezident Azərbaycan müəllimlərinin XII qurultayının iştirakçılarını ürəkdən salamlayır, hər bir Azərbaycan müəlliminə, ölkənin bütün təhsil işçilərinə ən xoş arzularını yetirirdi. O günlərdə Azərbaycan xalqının böyük oğlu səhhəti ilə əlaqədar Vətəndən uzaqlarda müalicədə olsa da müəllimlərimizi unutmamış, qurultayımıza təbrik məktubu göndərmişdir. Sədrin aşağıdakı sözləri sürəkli alqışlarla qarşılandı.

Alqışlardan sonra nümayəndələrdə böyük ruh yüksəkliyi yarandı. Sədr əlavə etdi: "Xalqımızın, müəllimlərimizin adından bu böyük diqqətə və qayğıya görə cənab Prezidentimizə öz minnətdarlığımızı bildirirəm. Qurultayın işinin daha səmərəli keçirilməsi üçün Azərbaycan müəllimlərinin XII qurultayı iştirakçılarına belə dərin məzmunlu məktub göndərdiyinə görə bir daha hamımız adından ona dərin təşəkkürümü, sonsuz hörmət və ehtiramımızı bildirirəm. Hamımız arzu edirik ki, o, tezliklə sağalıb Vətənə qayıtsın. Hamımız ona cansağlığı arzulayırıq"!

Qurultayın gedişi boyu ulu öndərin müdrik sözləri və tövsiyələri qurultaylarda səslənir, bütün natiqlərin və iştirakçıların fikir və duyğularını böyük gələcəyə yönəldirdi.

O bu təbrikində müəllim adını yenə iftixarla çəkir, onun əməyini yüksək qiymətləndirirdi:

"Müəllimlik şərəfli bir sənətdir. Azərbaycan müəllimləri ən yüksək adı ləyaqətlə daşıyırlar. Mən həmişə müəllimlərimizin əməyinə hörmətlə yanaşmışam. Bu gün də Azərbaycan müəllimlərinə cəmiyyətin inkişafı naminə göstərdikləri fədakarlığa görə öz adımdan, bütün xalqımız adından minnətdarlığımı bildirirəm. Biz hamımız Azərbaycan məktəbinə, Azərbaycan müəllimlərinə, Azərbaycan təhsil işçilərinə borcluyuq".

Təbrik məktubunda Prezident təhsilimizin dünəninə, bu gününə və sabahına diqqət və qayğı ilə yanaşırdı. Keçmiş yola nəzər salaraq, nailiyyətlərimizi qiymətləndirir və ölkədə təhsil islahatlarının zəruriliyinə bir daha diqqəti cəlb edirdi. Ulu öndər qurultayın işinə uğurlar diləyərək, öz səsini okeanın o tayından ucaldır və əbədilik qazanmış aşağıdakı sözlərini qurultayımızın tarixinə yazırdı:

Azərbaycanın dövlət müstəqilliyini bərpa etməsi, milli dövlətçilik prinsiplərinə və ümumbəşəri dəyərlərə cavab verən islahatların aparılmasını zəruri etmişdir. Ölkəmizdə dövlət proqramına uyğun olaraq, təhsil quruculuğu sahəsində əsaslı islahatlara

başlanılmış, bu proses dönməz xarakter alaraq təhsil sisteminin bütün pillələrini əhatə etmiş, Azərbaycan təhsilinin dünya təhsil sisteminə inteqrasiyasının dərinləşməsini təmin etmişdir.

Təhsil millətin gələcəyi, müstəqil dövlətin təməlidir. Azərbaycan Respublikasının Prezidenti kimi sizi əmin etmək istəyirəm ki, təhsil sahəsi, təhsil islahatları hər zaman mənim diqqət və qayğım altındadır. Hesab edirəm ki, dövlət ən çətin vaxtlarında belə təhsilə və təhsil işçilərinə, məktəbə və müəllimə kömək etməlidir. Bu, fəaliyyətimin bütün dövrlərində mənim prinsipial mövqeyim olmuşdur.

Birləşmiş Millətlər Təşkilatının “Təhsil əsri” elan etdiyi XXI əsrin inkişaf strategiyasının tələbləri Azərbaycan təhsilinin qarşısında da mühüm vəzifələr qoyur. Ümidvaram ki, yeni əsrdə keçirilən bu ilk qurultayınız ötən qurultaydan sonrakı müddət ərzində ölkəmizdə milli təhsilin inkişafı sahəsində qazanılmış nailiyyətləri layiqincə qiymətləndirəcək, bu sahədə mövcud olan problemləri aşkar edəcək və milli təhsilimizin tərəqqisi naminə qəbul edəcəyi qərarların yerinə yetirilməsinə ölkənin bütün intellektual potensialını səfərbər edəcəkdir.

Tarix böyük şəxsiyyətləri, dahiləri az-az yetişdirir. Azərbaycan xalqı xoşbəxt xalqlardandır ki, vətənimizin ağır günlərində Heydər Əliyev kimi müdrik rəhbəri bəxş etmişdir. Onun dühası bundan sonra da xalqımızın yoluna işıq saçacaqdır.

Ulu öndər Heydər Əliyev müstəqil Azərbaycanın rəhbərlik etdiyi dövrdə təhsilimizin inkişafı naminə misilsiz xidmətlər göstərmişdir. Ulu öndərin iştirak etdiyi müəllimlər qurultaylarından sonra Azərbaycan təhsilinin yeni mərhələsi başlanmış, təhsilə dövlətin qayğısı daha da gücləndirilmiş, müstəqil Azərbaycan müəllimlərinin sonrakı XIII-XIV qurultayları da uğurla keçirilmişdir.

Ulu öndərin təhsil quruculuğu siyasətini son 10 ildə inamla davam etdirən Prezident İlham Əliyev qazanılmış ənənələrin yaşadılması yolunda əhəmiyyətli işlər görmüşdür. Təhsilimiz, Heydər Əliyevin müəyyən etdiyi siyasi kurs əsasında həyata keçirilən ardıcıl islahatlar ölkənin sürətli inkişafı yolu ilə reallaşmaqdadır.

**Nəcəf Nəcəfov**
***“Azərbaycan məktəbi” jurnalının baş redaktoru, dosent, əməkdar müəllim, Azərbaycan Yazıçılar Birliyi və Jurnalistlər Birliyinin üzvü, Azərbaycan müəllimlərinin IX, X, XI, XII, XIII, XIV, SSRİ müəllimlərinin III qurultayının iştirakçısı***

***XIV qurultaydan sonra***
***nümayəndələri düşündürən məsələlər***

# KEYFİYYƏTLİ MÜƏLLİM KADRLARI HAZIRLIĞINDA YENİ MƏRHƏLƏ

**Qurultay nümayəndəsi, ADPU-nun Pedaqoji fakültəsinin dekanı, əməkdar elm xadimi, pedaqogika üzrə elmlər doktoru, professor, Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü Fərrux Rüstəmov müsahibə verərkən, əsas diqqətini keyfiyyətli müəllim kadrları hazırlığında yeni mərhələ üzərində dayandı və qurultayın qarşıya qoyduğu bu vəzifələrin yerinə yetirilməsi sahəsində görüləcək işlərdən bəhs etdi. O dedi:**

Azərbaycanda memarı ulu öndər Heydər Əliyev olan təhsil islahatları 1998-ci ildən yüksələn xətlə inkişaf etməkdədir. İqtisadi, siyasi, mədəni, elm və təhsil sahəsində gerçəkləşən layihələr cəmiyyətin yenidən qurulması və davamlı inkişafı üçün şərait yaratmış, BMT-nin İnsan İnkişafı hesabatına əsasən Azərbaycan 169 ölkə arasında 101-ci yerdən 67-ci yerə yüksəlmiş, “orta insan inkişafı” qrupundan “yüksək insan inkişafı” qrupuna daxil olmuşdur. Sosial – iqtisadi, elmi-mədəni inkişafın gələcək hədəfləri Azərbaycan təhsilinin beynəlxalq rəqabətə davamlılıq göstəricilərindən və ali təhsil müəssisələrinin reytinq səviyyələrindən birbaşa asılıdır. Ona görə də Azərbaycanda maddi kapitalın insan kapitalına çevrilməsi istiqamətində sistemli və məqsədyönlü iş aparılır. Çünki insanın ömürboyu təhsil almaq tələbatının ödənilməsi təhsilin iqtisadi həyatda rolunu əhəmiyyətli dərəcədə artırmışdır. Daha rəqabətli iqtisadi mühitə uyğunlaşmağı tələb edən dünya iqtisadiyyatındakı dəyişikliklər, Azərbaycan təhsilinin sürətlə Avropaya inteqrasiyası təhsilin keyfiyyəti problemini önə çıxartmışdır. Azərbaycanda da təhsildə əsaslı və çoxşaxəli islahatların keçirilməsi zərurəti yarandı. Dövlətin təhsil siyasətində əsaslı dəyişikliklər baş verdi. Halbuki, ənənəvi təhsil sistemində keyfiyyət göstəriciləri kəmiyyət göstəricilərinə qurban verilir, keyfiyyətə nəzarət inzibati idarəçilik metodu ilə həyata keçirilirdi. Mədəni təfəkkürün formalaşmasına xidmət edən bu nəzəriyyələr pedaqoji prosesin çox ciddi idarə olunmasını, təlim prosesində müəllimin daha yüksək mövqeyə, üstünlüyə malik olmasını nəzərdə tuturdu. Belə vəziyyət şagirdlərin müstəqilliyini azaldır, nəticədə intellektualizmə gətirib çıxarırdı.

Daha təsirli və genişmiqyaslı dəyişikliklər inteqrasiya və unifikasiya problemini önə çəkən Avropada baş verdi. Yeniləşməkdə olan Avropada təhsilin məqsəd və vəzifələrinin əhatə dairəsi genişləndi. Avropada gedən sosial, siyasi və iqtisadi dəyişikliklər təhsilin qarşısına ümumavropa əməkdaşlığı şəraitində, istehsal məhsulları və informasiya mübadiləsi sistemində yaşayacaq müxtəlif ittifaq, birlik, təşkilat vasitəsi ilə əməkdaşlıq edə biləcək insan hazırlamaq vəzifəsi qoydu. Təhsil Avropa mədəniyyətinin ən vacib dəyəri kimi qiymətləndirildi. Bu, insana azad və yaradıcı şəxsiyyət kimi münasibət göstərilməsində öz əksini tapdı. İnsan cəmiyyətin ictimai-mədəni və sosial-iqtisadi inkişafının ən əsas amili kimi dəyərləndirildi. Cəmiyyətin tərəqqisi naminə təhsildə de-

mokratik dəyərlər inkişaf etdirildi, bu isə öz əksini təlimin fərdiləşdirilməsində, müxtəlif təhsil formalarının (formal, qeyri – formal, informal) seçilməsində, eləcə də yaşlıların təhsilə cəlb edilməsində tapdı. Zamanın mədəniyyət ölçüləri dəyişdi, yeni pedaqoji təfəkkür formalaşdı. Diferensiasiyaya əsaslanan monoloji mədəniyyətdən fərqli olaraq inteqrasiyaya əsaslanan dialoji mədəniyyət formalaşmağa başladı.

Avropa ölkələrində olduğu kimi, Azərbaycanda da təhsildə əsaslı və çoxşaxəli islahatların keçirilməsi zərurəti yarandı. Dövlətin təhsil siyasətində əsaslı dəyişiklik baş verdi. Ulu öndər H.Əliyevin və onun siyasi məktəbinin layiqli davamçısı Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin apardığı məqsədyönlü və ardıcıl dövlət siyasəti nəticəsində təhsil sahəsində aparılacaq islahatların vahid konsepsiyası, aydın strategiyası və konkret dövlət proqramı hazırlandı, "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)", "Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu" qəbul edildi. Məktəbəqədər, ümumi, ilk peşə-ixtisas, orta ixtisas və ali təhil sahəsində mühüm addımlar atıldı. Təhsilin normativ-hüquqi bazası möhkəmləndirildi, infrastrukturun dövrün tələbləri səviyyəsində qurulması istiqamətində praktik işlər görüldü, 2500-ə yaxın məktəb binası tikildi, yararsız təhsil obyektləri əsaslı təmir olundu, ümumi təhsilin məzmunu yeniləşdirildi, yeni dərslik siyasəti reallaşdırıldı, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsinin yeni modeli tətbiq edildi, təhsil müəssisələrinin böyük əksəriyyəti informasiya-kommunikasiya texnologiyaları ilə təmin edildi, təhsil sisteminin informasiyalaşdırılması, xaricdə təhsil və beynəlxalq əlaqələrin genişləndirilməsi sahəsində uğurlu addımlar atıldı. Məktəblərin infrastrukturunun yeniləşdirilməsində Heydər Əliyev Fondunun və onun prezidenti Mehriban xanım Əliyevanın müstəsna xidmətləri oldu. Bununla yanaşı, sürətlə modernləşən respublikamızda təhsilin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi üçün yeni, daha səmərəli və təsirli addımların atılmasına ehtiyac yarandı. Həmin ehtiyacların ödənilməsi, ölkədə insan kapitalının davamlı inkişafı üçün şəraitin yaradılması, mövcud infrastrukturun təkmilləşdirilməsi, müasir düşüncəyə, yeni təhsil–tərbiyə texnologiyasına, əxlaqi–mənəvi saflığa, yüksək peşə və ixtisas hazırlığına malik pedaqoji, mühəndis–pedaqoji və elmi-pedaqoji kadr hazırlığının təkmilləşdirilməsi məqsədilə Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" təsdiq edildi.

Strategiya məktəbəqədər, ümumi, ilk peşə-ixtisas, orta ixtisas və ali təhsil pillələrində toplanmış potensialı qoruyub saxlamaq və inkişaf etdirmək, təhsil sistemini tənzimləyən müvafiq hüquqi-normativ bazanı gücləndirmək, Azərbaycan Respublikasında təhsilin müasir vəziyyətini, inkişaf dinamikası və spesifik xüsusiyyətlərini, təhsilin vəzifələrini, strateji istiqamətləri, hədəfləri və tələblərin həyata keçirilməsini, təhsil sahəsində beynəlxalq təcrübə və meyillərin öyrənilməsini, cəmiyyətin iqtisadi və sosial həyatının demokratikləşdirilməsinə əsaslanan təhsil siyasətinin uğurla həyata keçirilməsini özündə ehtiva edən konseptual bir sənəddir.

Strategiyanın əsas məqsədi ölkədə səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sistemi yaratmaqdır. Azərbaycanın təhsil sisteminin iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartlarına uyğun olması üçün strategiyada 5 istiqamət müəyyənləşdirilmişdir: 1) səriştə-

yə əsaslanan şəxsiyyətyönümlü təhsilin məzmununun yaradılması; 2) təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi; 3) təhsildə nəticələrə görə cavabdehlik, şəffaf və səmərəli idarəetmə mexanizminin yaradılması; 4) ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması; 5) təhsil sisteminin dünya standartlarına uyğun maliyyələşdirilməsi.

Müəyyənləşdirilən bu istiqamətlərin həyata keçirilməsi akademik bacarığı, tədris təcrübəsi və peşəkarlıq səviyyəsi ilə fərqlənən keyfiyyətli müəllim kadrlarının hazırlanmasını, müəllim peşəsinin nüfuzunun yüksəldilməsini tələb edir. K.S.Stanislavski deyirdi ki, teatr asılqandan başlayır. Keyfiyyətli və səriştəli müəllim kadrlarının hazırlığının ilkin şərti pedaqoji peşəyə seçimin düzgün, obyektiv və şəffaf aparılmasından asılıdır. Bunun üçün isə ilk növbədə pedaqoji peşəyə sənəd verən abituriyentlərin peşəyəyararlılıq səviyyəsi yoxlanılmalıdır. Təəssüf ki, ali məktəblərə mövcud tələbə qəbulu sistemi bu seçimi reallaşdırmağa imkan vermir. Abituriyentlərin pedaqoji peşəyə maraq, meyil və qabiliyyətləri, zahiri görünüşləri, xüsusi ilə də ibtidai sinif müəllimliyi ixtisasını seçənlərin yazı və nitq mədəniyyəti yoxlanılmır. Musiqiçi üçün musiqi duyumu, rəssam üçün rəng duyumu nə qədər zəruri və vacibdirsə, müəllim üçün pedaqoji sövqtəbiilik, pedaqoji qabiliyyətlər o qədər zəruri və vacibdir. Müəllimin xüsusi peşə və ictimai funksiyaları onun şəxsiyyətinə mühüm tələblər verir. Müəllim şagirdlər, valideynlər və ümumiyyətlə, cəmiyyət üçün nümunə, etalon olmalıdır. Keyfiyyətli müəllim yaxşı həkim, yaxşı mühəndis, yaxşı hüquqşünas, yaxşı iqtisadçı, peşəkar hərbiçi deməkdir. Bu səbəbdən də strategiyada müəllim təhsilalanların öyrənməsi və inkişafı, nailiyyətlərinin monitorinqi prosesində həlledici sima hesab olunur. Tədqiqatçılar müəllimlərin qarşısına qoyulan tələbləri pedaqoji fəaliyyətin səmərəliliyini təmin edən peşə keyfiyyətlərinin imperativ (qeyri-şərtsiz) sistemi kimi şərh edirlər. Avropa alimlərinin fikrincə, praktik pedaqoji fəaliyyətin yarısı pedaqoji texnologiyaların, o biri yarısı isə pedaqoji ustalığın payına düşür. Müəllimə verilən başlıca tələb onun peşə kompetensiyalarına malik olmasıdır. Müəllimin şəxsi keyfiyyətləri hesab olunan pedaqoji kompetensiyalar onun uşaqlara məhəbbətində, onlarla işləməkdən və ünsiyyətdə olmaqdan həzz almaqda özünü göstərir. İllərlə ağ xalatlı həkim olmaq, insanların fiziki sağlamlığının keşiyində dayanmaq arzusu ilə yaşayan, ali məktəbə qəbul zamanı bu istəyini reallaşdıra bilməyən, təsadüf nəticəsində biologiya müəllimliyi ixtisasına düşən və yaxud hüquqşünas, diplomat olmaq istəyən abituriyentin tarix, ədəbiyyat, sinif müəllimliyi ixtisaslarına daxil olması, həmin peşəni istəyərək seçənlərə nisbətən yüksək bal toplamalarına baxmayaraq onların gələcəkdə yaxşı müəllim olmasına dəlalət etmir. Müəllim fitrətən müəllim, ustad olmalıdır. Müəllimin praktik fəaliyyəti üçün zəruri olan təşkilatçılıq, tədqiqatçılıq, təlim (öyrətmə), perseptiv, kommunikativ, suqqestiv, elmi-idraki qabiliyyətləri pedaqoji peşəyə maraq və meyili olmayan, təsadüf nəticəsində bu ixtisasa düşən abituriyentlərdə yaratmaq olduqca çətindir. Bir müddətdən sonra həmin tələbələrin özləri də səhvlərini dərk edir, təhsillərini yarımçıq qoymalı olurlar. Nəticədə müəllimlik peşəsini sevməyən birisinin onun yerini tutması səbəbindən ali məktəbə qəbuldan kənarda qalan abituriyent də, düzgün olmayan seçimin qurbanı olan tələbə də, onun valideyni də əziyyət çəkir, tələbənin təhsilini maliyyələşdirən dövlət külli miqdarda vəsait itirir. Elə buna görə də ali məktəblərə tələbə qəbulunun qaydaları təkmilləşdirilməli, ixtisaslar, xüsusi ilə də “Təhsil ixtisasları” digər qruplardan ayrılmalıdır. Azərbaycan Respublikası

Nazirlər Kabinetinin 2009–cu il 12 yanvar tarixli qərarı ilə ali təhsilin bakalavriat səviyyəsi ixtisasları 8 qrupda təsnif olunduğu halda, ali məktəblərə qəbul zamanı bütün ixtisasların 4 qrupa bölünməsi ixtisas seçimində müəyyən problemlər yaradır. Keyfiyyətli müəllim kadrları yetişdirmək məqsədi ilə pedaqoji ixtisaslara sənəd verən abituriyentlərin peşəyəyararlılıq səviyyəsinin müəyyənləşdirilməsi, nitq və yazı mədəniyyətinin yoxlanılması üçün müsahibələrdən keçirilməsi, yüksək bal toplayanların pedaqoji peşəyə istiqamətləndirilməsi zəruri və vacibdir.

Cəmiyyətin tərəqqisi məktəbdən, məktəbin inkişafı isə müəllimdən asılıdır. Məktəblərimizdə öz peşəsinin vurğunu olan, peşəkarlığı, tədris uğurları, cəmiyyətdə yüksək nüfuzu ilə seçilən müəllimlərlə yanaşı, elmi – metodiki hazırlığı zəif, məktəbdən, şagirddən ruhən, qəlbən uzaq olan, hər cür yeniliyi "süngü" ilə qarşılayan, müqəddəs müəllim adına kölgə salan müəllimlər, vəzifə məsuliyyəti, təşkilatçılıq qabiliyyəti, kollektivi vahid məqsəd ətrafına səfərbər etmək baxımından müasir tələbləri ödəməyən, təhsilin müasir problemlərini, bu sahədəki islahatların mahiyyətini dərk etməyən, yaradıcılığı və təşəbbüskarlığı ilə fərqlənməyən məktəb direktorları da az deyil. Platon deyirdi ki, pinəçinin bir cüt ayaqqabını pis tikməsi bir nəfər afinalıya ziyan vurduğu halda, müəllimin pis işi, pis tərbiyəsi bütün Yunanıstana ziyan gətirir. Ona görə də Strategiyada "təhsil sisteminin bütün pillələrində müəllimlərin bilik, bacarıq və peşəkarlıq qabiliyyətlərinin müasir tələblərə uyğun yüksəldilməsi, müvafiq stimullaşdırıcı mexanizmlər və səmərəli monitorinq sistemi vasitəsi ilə müəllim fəaliyyətinin keyfiyyətinin artırılması" bir vəzifə kimi qarşıya qoyulmuşdur. Hesab edirik ki, cəmiyyət qarşısında öz borcunu və vəzifəsini dərk etməyən "diplomluların" məktəblərdən uzaqlaşdırılmasını, təhsilverənlərin peşəkarlıq səviyyəsinin daim yüksəldilməsini təmin etmək məqsədilə treninq mərkəzlərinin yaradılması, ayrı-ayrı ixtisaslar üzrə xarici ölkələrdən tanınmış mütəxəssislərin dəvət edilməsi, milli kadrların müvafiq ölkələrin elm və Təhsil mərkəzlərində təcrübə keçməsi və qarşılıqlı əməkdaşlığın gücləndirilməsi, bu məqsədlə xarici təcrübənin (Məsələn, Qazaxıstanın "Nazarbayev İntellektual Məktəbləri" Pedaqoji Ustalıq Mərkəzinin) öyrənilməsi məqsədəmüvafiq olardı. 2008–ci ildən indiyə qədər respublikada fəaliyyət göstərən məktəblərin I-VI siniflərində dərs deyən müəllimlərin, demək olar ki, hamısı müvafiq kurslardan keçərək eyni səviyyəli sertifikatlar alıb. Ölkədə və xaricdə müvafiq kurslardan keçən, müasir təhsil–tərbiyə texnologiyasını mənimsəyən, tədris uğurları ilə seçilənlərlə yanaşı, müvafiq göstəriciləri olmayan müəllimlərin fəaliyyətinin eyni meyarlarla dəyərləndirilməsi, eyni əməkhaqqının verilməsi nə dərəcədə doğrudur? Böyük şairimiz Şəhriyar deyirdi ki, hamının başını eyni ülgüclə qırxmaq olmaz. Aqillər əbəs yerə demirlər ki, qanı damara görə alarlar. Köhnə stereotiplərdən əl çəkilməli, müəllimlərin əmək haqqı diferensiallaşdırılmalıdır. Bu, sağlam rəqabət mühitinin yaranmasını şərtləndirməklə bərabər Azərbaycan təhsilinin beynəlxalq rəqabətə davamlılıq göstəricilərinin yüksəldilməsinə zəmin yaratmış olardı. Treninqlərdən keçən təhsilverənlərin peşəkarlıq və səriştəlilik səviyyəsi əvvəlcədən hazırlanmış meyarlar əsasında yoxlanılmalı, aldıqları müvafiq sertifikatlara (I-II-III dərəcəli) uyğun olaraq fəaliyyətləri stimullaşdırılmalı, peşəkarlığa əsaslanan stimullaşdırıcı əməkhaqqı sistemi yaradılmalıdır. Avropada və Yaponiyada müəllimlər yüksək əməkhaqqı alanlar kateqoriyasına aiddir. Yaponiyada müəllimlərin əməkhaqqı dövlət qulluqçularının orta əməkhaqqından 25% çoxdur. Fransada kollec və lisey

müəllimləri adi dövlət qulluqçularından 2 dəfə çox maaş alırlar. Onu da qeyd edək ki, Qərbi Avropada bir müəllimə təxminən 20, Yaponiyada 24, Rusiyada 15, Azərbaycanda isə 10 şagird düşür. Xarici ölkələrdə əhalinin çox yaşadığı regionlarda şagirdlərin sayı normadan artıqdır. Məsələn, Yaponiyada elə məktəb var ki, orada hər sinifdə 40 şagird təhsil alır.

Azərbaycanda fəaliyyət göstərən məktəblərin 1300-ə yaxınında şagirdlərin sayı normadan aşağıdır. Şagirdlərin sayı 30-dək olan 387, 50-dək olan 238, 100-dək olan 614 məktəb fəaliyyət göstərir (Azərbaycan müəllimlərinin XIII qurultayı, Bakı, 2009, s.54-55). Son illərdə regionlarda təhsil alan şagirdlərin sayının bir az da azalmasını nəzərə alaraq, strategiyada göstərildiyi kimi ümumi təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması sahəsində ciddi addımlar atılmalıdır. Həmin məktəblərdə dərs saatları xeyli az olduğundan onları bütün fənlər üzrə ixtisaslı müəllimlərlə təmin etmək, təhsilin keyfiyyətini yüksəltmək qeyri-mümkündür.

Ötən əsrin ikinci yarısından başlayan, müasir dövrdə həyəcan doğuracaq bir həddə çatmış məktəblərdə gedən feminizasiya prosesinin qarşısını almaq məqsədilə oğlanların müəllimlik peşəsini seçmələri üçün zəruri tədbirlər görülməlidir. Feminizasiya effektlərini təhlil edən prof.Əbdül Əlizadə oğlanların tərbiyəsində qadınların–evdə ananın, məktəbdə isə çoxluq təşkil edən qadın müəllimlərin daha fəal rol oynaması faktına diqqəti cəlb edir: günün çox hissəsini qadınlarla ünsiyyət şəraitində keçirən oğlan uşaqları çox vaxt onların təkcə düşüncə tərzini götürmür, həm də məhz qadın meyarlarını mənimsəyir, başqa sözlə, dünyaya qadın gözü ilə baxmağa başlayır. (Ə.Əlizadə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2004, s.308). Deməli, onda qadın xarakteri formalaşır. Xarakter insan şəxsiyyətinin mahiyyətini, istiqamətini, meyilini, məqsədini, hislərini, fəaliyyət tərzini ifadə edir. Xarakter insanın həyat yolundan, tərbiyəsindən və özünütərbiyəsindən asılı olaraq dəyişir. Qüvvətli və möhkəm xarakterin formalaşması təhsilverənlərin xarakterindən asılıdır. Əbəs yerə demirlər ki, xarakteri xarakter formalaşdırır. Ali pedaqoji təhsil müəssisələrinə qəbul olan tələbələrin böyük əksəriyyətinin, hətta mühəndis-pedaqoji ixtisasına daxil olanların 90%-ə qədərinin qızlardan ibarət olması həyəcan təbili çalmağa bizi sövq edir. Qeyri-adekvat olan bu vəziyyətin aradan qaldırılması məqsədi ilə oğlanların pedaqoji peşəni seçmələri üçün stimullaşdırıcı tədbirlərin həyata keçirilməsi, onlara xüsusi təqaüdlərin və imtiyazların verilməsi, müəllim işlədiyi dövrdə bazar iqtisadiyyatı tələbatına uyğun əməkhaqqı ilə təmin edilməsi, hərbi xidmətdən azad edilməsi kimi vacib və təxirəsalınmaz işlər görülməlidir.

Strategiyada müasir tələblərə uyğun və ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması strateji istiqamət kimi müəyyənləşdirilmişdir. Ali təhsilin zamanın tələblərinə uyğun qurulması onun infrastrukturunun təkmilləşdirilməsini tələb edir. Yüksək elmi-pedaqoji kadr potensialına, güclü maddi-texniki bazaya, müasir və yeni kompuslara malik olmadan təlimin keyfiyyətini Avropa standartları səviyyəsində təmin etmək real görünmür. Keyfiyyətli və səriştəli müəllim kadrlarının hazırlanması ali pedaqoji təhsil müəssisələrinin nəzdində baza məktəblərinin, təcrübə-istehsalat mərkəzlərinin yaradılmasının vacibliyini ön plana gətirir. Məktəbəqədər, ümumtəhsil, texniki peşə, musiqi məktəbləri üçün pedaqoji kadr hazırlığını həyata keçirən ADPU-nun nəzdində bağça-məktəb-lisey kompleksinin, musiqi və peşə məktəbinin yaradılması nəzəriyyə ilə praktikanın vəhdətini, gələcək müəllimlərin təhsil prosesinə çevik və dinamik adaptasiya olunmasını təmin

etməklə yanaşı, innovativ təlim metodlarını öz işinə uğurla tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsinə nail olan səriştəli və peşəkar müəllimlərin yetişməsini təmin edər. Pedaqoji təhsilin vacib komponentlərindən biri olan pedaqoji təcrübənin səmərəliliyinin artmasına imkan yaradar. Pedaqoji təcrübənin məqsədi tələbəni həm fənn müəllimi, həm də sinif rəhbərinin funksiyası ilə tanış etmək və onu bu istiqamətdə gələcək fəaliyyətə hazırlamaqdır. Universitetlərin nəzdində belə məktəblər olarsa (Azərbaycan Tibb Universitetinin nəzdindəki tədris klinikaları kimi), gələcək müəllimlər müntəzəm şəkildə həmin məktəblərin nümunəsində təhsil-tərbiyə şəraiti, direktor-müəllim, müəllim-şagird, şagird-şagird münasibətləri, təlim texnologiyaları və resursları, təlim strategiyaları və qiymətləndirmə mexanizmləri ilə tanış olar, müəllimlik peşəsinin sirlərini öyrənər, praktik bacarıqlar qazanarlar. Məktəblər universitetlərin tədris laboratoriyalarına çevrilərsə, professor-müəllimlərin təhsil-tərbiyənin praktik problemləri ilə bağlı eksperimentlər aparmasına, nəzəri fikirlərinin məktəb təcrübəsinə tətbiq etməsinə əlverişli şərait yaranar.

Ümumtəhsil məktəb şagirdlərinin pedaqoji peşəyə istiqamətləndirilməsi üçün təhsil müəssisələrində karyera və resurs mərkəzlərinin yaradılmasına, pedaqoji peşəyə qəbul üçün müvafiq bal həddinin müəyyənləşdirilməsinə, ümumtəhsil məktəbinin yekun imtahanının qəbul imtahanı ilə birləşdirilməsinə, pedaqoji peşə təhsilinin "sifariş-təklif" əsasında təşkilinə böyük ehtiyac vardır.

Pedaqoji təcrübəsi az olan müəllimlərə, pedaqoji təcrübə və internatura keçən gələcək müəllimlərə himayədarlıq etmək məqsədilə məktəblərdə mentorluq sisteminin yaradılması pedaqoji prosesin qurulmasının, gedişinin, təşkilinin və məqsədə nail olmağın daha səmərəli variantının seçilməsinə (pedaqoji prosesin optimallaşdırılmasına), müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsinə real kömək etmiş olardı.

Pedaqoji ixtisaslar üzrə bakalavriat təhsil pilləsini uğurla bitirən, ən azı birillik internatura təhsili keçən, fəaliyyəti lisenziyalaşdırılan məzunlara müəllim işləmək hüququnun verilməsi, internatura təhsili üçün xüsusi proqramın (kurikulumun) hazırlanması keyfiyyətli müəllim kadrları hazırlığında mühüm amil kimi dəyərləndirilməlidir. Hesab edirik ki, ali təhsilin bakalavriat pilləsini bitirən məzunlardan müəllim işləmək istəyənlər ən azı bir il internatura keçməli, qabaqcıl müəllimlərin təcrübəsini öyrənməli, tədris prosesində şəxsən iştirak etməklə müəllimlik sənətinin sirlərini mənimsəməli, sonda isə elmi, metodiki, pedaqoji qabiliyyətini, peşəkarlıq səviyyəsini, şagirdlərlə işləmək bacarığını nümayiş etdirməli, tədris edəcəyi fənn üzrə dərslər verməli və buna müvafiq olaraq fəaliyyəti lisenziyalaşdırılmalıdır.

Ali təhsil müəssisələrinin yataqxanasının olmaması və ya müasir tələblərə cavab verməməsi ölkəmizdə təhsil almaq istəyən əcnəbi tələbələrin müvafiq təhsil müəssisələrində oxumalarına mane olur. ADPU-nun yataqxanasının olmaması yüksək balla qəbul olunmuş maddi vəziyyətləri ağır olan bəzi tələbələrin təhsildən imtina etməsinə səbəb olur. Yataqxana təkcə yaşayış yeri deyil, həm də tələbələrin sosiallaşmasının, birgəyaşayış qaydalarına uyğunlaşmasının, əməkdaşlığa alışmasının, sosial işə hazırlanmasının vacib məkanıdır. Ali təhsil müəssisələri üçün yeni kompusların tikilməsi, xüsusilə də yataqxanalarla təmin olunması Boloniya prosesinin əsas tələblərindən biri olan tələbə mobilliyinin həyata keçirilməsinə kömək etmiş olardı.

İlkin müəllim hazırlığının təkmilləşdirilməsi məqsədilə "Azərbaycan Respublikasında ali təhsilin bakalavr pilləsində

* 6

ibtidai sinif müəllimlərinin hazırlığı üzrə çərçivə Kurikulumu" hazırlanmış, 3 pilot ali təhsil müəssisəsində (Azərbaycan Dövlət Pedaqoji Universiteti, Azərbaycan Müəllimlər İnstitutu, Gəncə Dövlət Universiteti) tətbiqinə başlanılmışdır. Strategiyada təhsilin bütün pillələri, o cümlədən ali təhsil üzrə yeni kurikulumların, səriştəyə əsaslanan standartların hazırlanması zəruri və vacib hesab olunur. Azərbaycan Respublikasının təhsil naziri M.Cabbarov müsahibələrinin birində haqlı olaraq qeyd etmişdir ki, müəllim hazırlığı üzrə yeni kurikulumlar tətbiq edilsə də, bütövlükdə ali təhsil müəssisələrinin kurikulumları əmək bazarınının müasir şərtlərinə uyğun gəlmir ("Azərbaycan müəllimi"qəzeti, 29 noyabr 2013-cü il). Strategiyada isə göstərilir ki, ali təhsil pilləsində kurikulumların inkişafı iqtisadiyyatın inkişaf dinamikasından geri qalır. Dövlətin ali təhsildən, xüsusi ilə də ali pedaqoji təhsillilərdən gözləntiləri böyükdür. Millətin mənəvi potensialının formalaşması onların dərin və hərtərəfli biliyə, praktik bacarığa, yüksək mədəniyyətə, məsuliyyət hissinə və müasir dünyagörüşə hansı səviyyədə malik olmalarından asılıdır. Müasir dövrdə cəmiyyətdə intensiv olaraq dəyişən sosial-iqtisadi münasibətlər təhsil sisteminin bu proseslərə çevik və dinamik adaptasiyasını tələb etdiyindən, ildən–ilə öyrənmə prosesinin keyfiyyətini yüksəltmək müəllimlərdən təhsil prosesinə daha səriştəli yanaşma tələb edir.

Ali təhsil müəssisələrinin təhsil-tədqiqat-innovasiya mərkəzlərinə çevrilməsinə dəstək verən və rəqabət qabiliyyətli mütəxəssis hazırlığını təmin edən ali təhsil standartlarının tətbiqini zərurətə çevirir. Təbii ki, yeni məzmun yeni müəllim kadrları hazırlığını tələb edir. Müasir müəllim araşdırmalar aparmağı bacarmalı, müasir təhsil, tərbiyə, inkişaf texnologiyalarından baş çıxarmalı, düzgün diaqnozlaşdırma, proqnozlaşdırma, layihələşdirmə, informasiyavermə, təşkiletmə, qiymətləndirmə, nəzarətetmə və korreksiya funksiyalarını bilməli, tədqiqatçılıq keyfiyyətinə malik olmalıdır. Tədqiqatçılıq bacarığı olmayan müəllim bu keyfiyyəti öz şagirdlərinə aşılaya bilməz. Müasir məktəbin müəllimi yaradıcı olmalı, dərs dediyi şagirdin inkişafını bütün mərhələlər üzrə görməyi bacarmalı, onların şəxsiyyət kimi formalaşmasını düzgün istiqamətləndirməlidir. Məsuliyyətini dərk edən, demokratiya prinsiplərinə və xalqın milli ənənələrinə, insan hüquq və azadlıqlarına hörmət edən, azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək üçün müəllim şagirdin yaradıcı təfəkkürünə məxsus bütün psixo-pedaqoji xüsusiyyətləri bilməlidir. Bunun üçün isə vahid konsepsiya olmalıdır. Ali pedaqoji təhsillə bağlı ölkə üzrə vahid strategiya və konsepsiyanı, məzmun və texnologiyanı müəyyənləşdirən, dövlət standartlarını (pedaqoji təhsillə bağlı kurikulumu) hazırlayan, tədris resurslarına (dərslik, dərs vəsaiti, proqram, metodik vəsait və s.) rəy verən və onun monitorinqini keçirən, pedaqoji kadr hazırlığı ilə məşğul olan təhsil müəssisələrinin nümayəndələrinin iştirakı ilə baş ali pedaqoji məktəbdə - Azərbaycan Dövlət Pedaqoji Universitetində elm-tədris və metodik mərkəzin yaradılması müəllim hazırlığı sistemində keyfiyyətin təmin olunmasına şərait yaradardı.

Strategiyada ali və ümumi təhsil üzrə dərsliklərin elmi və metodik baxımından təkmilləşdirilməsi tələb olunur. Qeyd edək ki, ümumtəhsil məktəbləri, xüsusilə I-VI siniflər üçün dərsliklərin yeni nəsilləri yaradılmışdır. 12 illik ümumi təhsilə keçidlə əlaqədar olaraq ümumtəhsil məktəblərinin bütün dərsliklərini yenidən hazırlamaq zərurəti yaranmışdır. Ali təhsil üçün dərslik və dərs vəsaitlərinin hazırlanması və nəşri 25 ildir ki, özfəaliyyət xarakteri daşıyır, bu sahəyə dövlət vəsaiti ayrılmır. Ali təhsil müəssi-

sələrində tədris olunan fənlər üzrə yeni nəsil dərsliklərin müsabiqə yolu ilə hazırlanması, dövlətin maliyyə vəsaiti hesabına çap olunması, onların elektron variantlarının hazırlanması, tələbələrin müasir tələblərə cavab verən dərsliklərlə, tədris resursları ilə təmin olunması kadr hazırlığının keyfiyyətini təmin edən əsas amillərdən biri kimi dəyərləndirilməlidir.

Ali təhsilin ikinci pilləsində təhsilin məzmunu ciddi şəkildə təkmilləşdirilməli, yeni kurikulumlar hazırlanmalıdır. İndiki halda əsas məqsədi tələbənin tədqiqatçılıq bacarığının formalaşdırılması və inkişafından ibarət olan magistratura proqramları bakalavr hazırlığının məzmunundan o qədər də fərqlənmir. Ali təhsilin bakalavriat və magistratura pillələrindəki təkrarçılığı aradan qaldırmaq, magistratura və doktorantura (fəlsəfə və elmlər doktoru proqramları üzrə) pillələrində varisliyi təmin etmək şərti ilə müasir təhsil standartlarının hazırlanmasında ali təhsil müəssisələrinin, AMEA –nın və AAK-ın mütəxəssislərinin əməkdaşlığı faydalı olmaqla yanaşı, həmin sənədlərin uzunömürlülüyünü təmin etmiş olardı. Bir məsələni də qeyd etmək yerinə düşər: respublika üzrə elmlər və fəlsəfə doktorunun yaş həddi dünya elmi ilə müqayisədə Azərbaycan elmində təhlükəli həddə çatıb. Ölkədə fəaliyyət göstərən 1918 nəfər elmlər doktorunun, 8976 nəfər fəlsəfə doktorunun böyük əksəriyyəti ali təhsil müəssisələrində çalışır. Ali təhsil müəssisələrində çalışan 9506 nəfər elmi-pedaqoji işçinin arasında 30 yaşa kimi bir nəfər də olsa elmlər doktoru yoxdur, fəlsəfə doktorlarının sayı isə cəmi 46 nəfərdir (0,48 %).

Tədrisin keyfiyyətini yüksəltmək, professor–müəllimlərin elmi-metodiki hazırlığını, peşəkarlıq səviyyəsini artırmaq məqsədilə 5 ildən bir keçirilən ixtisasartırma və stajkeçmənin modelinin dəyişdirilməsi zəruridir. Belə ki, ixtisasartırma təhsil müəssisələri tərəfindən təklif edilən proqramlar bu təhsilə cəlb olunan müəllimlərin ehtiyaclarına uyğun hazırlanmır, ümumiyyətlə, bu ehtiyacların dəqiq müəyyənləşdirilməsi sahəsində etibarlı mexanizmlər yoxdur. Avropada bu sahədə fərqli mexanizmlər tətbiq olunur, ixtisasartırma təhsili – modul –kredit sisteminə əsaslanır. Modullar üzrə zəruri kreditləri toplayan müəllimlər sertifikat alır ki, bu da onların karyerasının inkişafı və əməyin stimullaşdırılmasında mühüm rol oynayır, ixtisasartırma təhsilinin statusunu yüksəldir və ona marağı artırır. İxtisasartırma təhsilinin maliyyələşdirmə mexanizmi dəyişdirilməlidir. Respublikamızda bu vəsait təqdim etdiyi xidmətin səviyyəsindən asılı olmayaraq ixtisasartırma təhsilini həyata keçirən müəssisələrə verilir. İndiki dövrdə tanınmış tədqiqatçı alimlərin xarici ölkələrin elm və təhsil mərkəzlərində ixtisasartırma və staj keçməsi daha effektli ola bilər.

Strategiyada istedadlı uşaqlarla yanaşı, xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün də inkişaf və inklüziv təlim proqramlarının hazırlanması məsələsinə diqqət yetirilir. Xüsusi qayğıya ehtiyacı olan uşaqların hamısı üçün bərabər təhsilalma imkanlarının yaradılması, inklüziv təlimə keçidin reallaşdırılması istiqamətində xeyli uğurlu işlər görülmüşdür. İlk vaxtlar övladlarının xəstə uşaqlarla birgə təhsil almalarına qarşı çıxan valideynlər, həmin sinifdə işləməkdən imtina edən müəllimlər az sonra bu xeyirxah missiyanın təbliğatçılarına çevrilmişlər. Müəllimlər inklüziv təhsil sahəsində bacarıqlar əldə etmiş, sağlamlıq imkanları məhdud olan uşaqlara fərdi yanaşmanı və fərdi inkişaf planları tərtib etməyi öyrənmişlər.

Xüsusi qayğıya ehtiyacı olan uşaqların keyfiyyətli təhsil alması üçün müəllim – defektoloqların hazırlanması zəruridir. Ali pedaqoji məktəblərdə hazırlanan defektoloq kadrları müasir tələblərə cavab vermir. Respublikada inklüziv təhsilə ehtiyacı olan

şagirdlərin sayının çox olmasını nəzərə alaraq, müvafiq ixtisaslar üzrə-surdopedaqoq, tiflopedaqoq, oliqofrenopedaqoq, loqoped hazırlanması, sağlamlıq imkanları məhdud olan şagirdlərlə işləmək istəyən gələcək müəllimlərə aldıqları ixtisaslarla (tarix, riyaziyyat, fizika, ədəbiyyat, coğrafiya və s.) yanaşı, surdopedaqoq, tiflopedaqoq, oliqofrenopedaqoq, loqoped ixtisaslarından birini almaları üçün şəraitin yaradılması məqsədəuyğun hesab edilməlidir. Beynəlxalq təcrübəyə görə, xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsil aldıqları sinifdə müəllim köməkçiləri fəaliyyət göstərməlidir.

Ölkənin kadr potensialını qoruyub saxlamaq və inkişaf etdirmək məqsədilə ali təhsilin bakalavriat və magistratura səviyyələri üzrə ixtisasların təsnifatı yenidən hazırlanmalı, sonrakı illərdə zəruri və vacib olacaq peşələr (ixtisaslar) müəyyənləşdirilməli, həmin sahədə kadr hazırlığına başlanılmalıdır. Ali təhsil müəssisələrində peşəkarlığa əsaslanan stimullaşdırıcı əməkhaqqı sisteminin yaradılması üçün meyarların hazırlanması ("müəllim tələbənin gözü ilə" sorğusunun keçirilməsi, açıq dərslərin təşkili, dərs dediyi tələbələrin nailiyyətlərinin müvəffəqiyyət və keyfiyyət göstəricilərinin təhlili, yerli və xarici mətbuatda ixtisası üzrə elmi məqalələrlə çıxışı, Respublika və beynəlxalq konfranslarda iştirakı, elmi-pedaqoji kadr hazırlığındakı fəaliyyəti, tələbələrinin respublika və beynəlxalq müsabiqələrdə, tələbə elmi cəmiyyətlərdə iştirakı, ictimai – siyasi fəallığı və s.), peşəkarlıq səviyyəsi yüksək olan müəllimlərə əlavə əməkhaqlarının verilməsi, mütəmadi olaraq akademik göstəriciləri aşağı olan müəllimlərlə əmək müqavilələrinin ləğv edilməsi keyfiyyətli müəllim kadrları hazırlığında mühüm rol oynaya bilər.

Dövlətin təhsil siyasətini elmi–pedaqoji əsaslarla reallaşdırmaq, pedaqoq, psixoloq və metodist alimlərin qüvvəsini eyni məcraya yönəltmək, onların nüfuzunu yüksəltmək məqsədilə Təhsil Nazirliyinin nəzdində "Azərbaycan Respublikasının təhsil sahəsində islahat Proqramı"nda təşkili nəzərdə tutulan Təhsil Akademiyasının yaradılması məqsədəuyğun olardı. Bu sahənin inkişafında müstəsna xidmətləri olan elmlər doktorlarının AMEA-nın müxbir və həqiqi üzv seçkilərində iştirakının təmin edilməsi elmi-pedaqoji kadrların inkişafına mühüm təsir edə bilər.

Strategiyada nəzərdə tutulan strateji istiqamətlərin reallaşdırılması təhsilin məzmununun, kadr hazırlığının, təhsili idarəetmə sisteminin və təhsil infrastrukturunun beynəlxalq təcrübəyə və Azərbaycanın inkişaf konsepsiyasına uyğun yenidən qurulmasını, informasiya cəmiyyətinin davamlı inkişafını, ölkədə biliklərə əsaslanan iqtisadiyyatın bərqərar olmasını təmin edəcəkdir.

**Müsahibəni apardı: "Azərbaycan məktəbi" jurnalının məsul katibi, Azərbaycan Jurnalistlər Birliyinin üzvü, dosent Ənvər Abbasov**

# AZƏRBAYCAN TƏHSİLİ YENİ İNKİŞAF YOLUNDA

**Müsahibimiz Yeni Azərbaycan Partiyası Səbail rayonu "Pedaqoqlar" ərazi ilk təşkilatının sədri, ADPU-nun kafedra müdiri, filologiya elmləri doktoru, professor Himalay Qasımovdur.**

O dedi:

2013-cü il Azərbaycan təhsilinin tarixinə həkk olunan mühüm bir hadisə ilə başa çatdı. Bu, respublika müəllimlərinin XIV qurultayı idi. Ölkəmizdə aparılan islahatlarla eyni dövrə düşən bu qurultay özünün tarixi missiyasını yerinə yetirməklə pedaqoji aləmdə hər kəs üçün əlamətdar bir hadisəyə çevrildi. Bir neçə ay keçməsinə baxmayaraq, təhsillə bağlı ünvanlar həmin hadisəni XXI əsrin başlanğıcında Azərbaycan müəllimlərinin həyatında böyük sosial-mədəni hadisə kimi dəyərləndirirlər. Himalay müəllim, Siz də bir ali məktəb müəllimi kimi bu qurultayın nümayəndəsi olmusunuz. Bu möhtəşəm tədbir haqqında hansı təəssüratlarınız vardır?

Azərbaycan müəllimlərinin XIV qurultayının dünya memarlığının nadir incilərindən hesab olunan əzəmətli və möhtəşəm Heydər Əliyev Mərkəzində 2013-cü ildə baş tutması mühüm tarixi məna kəsb edir. Ona görə ki, məhz 2013-cü il Ulu Öndər Heydər Əliyevin 90 illik yubileyinin, həm də Azərbaycan Respublikasının Prezidenti, möhtərəm cənab İlham Əliyevin üçüncü dəfə böyük ümumxalq coşğusu ilə dövlətimizin başçısı seçildiyi, süni peykimizin kosmosa göndərildiyi ildir. Daha doğrusu, 2013-cü il şanlı tarixdir və Azərbaycan müəllimlərinin XIV qurultayının da sözügedən ildə keçirilməsi bu baxımdan təsadüfi deyil. Təhsil ictimaiyyətinin tarixi hadisə kimi səciyyələndirdikləri bu qurultayı stimullaşdıran ən mühüm cəhət, əlbəttə ki, ölkə Prezidenti Cənab İlham Əliyevin "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" haqqında sərəncamı olmuşdur. Azərbaycan Respublikasının təhsil naziri hörmətli Mikayıl Cabbarovun intellektual düşüncədən boy göstərən, qlobal dəyərləndirmələri özündə ehtiva edən məruzəsinin məğzində məhz "Dövlət Strategiyası"ndan qaynaqlanan istiqamətlərin konseptual şərhi və qarşıya qoyulan vəzifələrin qurultay nümayəndələrinin diqqətinə çatdırılması dururdu. Cənab nazirin müasir Azərbaycan təhsilinin strateji istiqamətləri, o cümlədən təhsil standartlarının yaradılması, şəxsiyyətyönümlü təhsil, təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi, təhsildə cavabdehlik, təhsil infrastrukturu, dünyanın aparıcı təhsil sistemlərinin standartları ilə bir səviyyədə dura bilən təhsil sisteminin yaradılması kimi konkret hədəfləri, konseptual açıqlamaları, özündə ehtiva edən məruzəsi hər kəsdə məmnunluq hissi doğurdu. Məruzədə o da xüsusi vurğulandı ki, dünyanın aparıcı təhsil sistemlərinin standartları dərindən öyrənilməlidir ki, həmin səviyyəyə çata bilən və iqtisadi cəhətdən dayanıqlı olan milli təhsil sisteminin modelini yaratmaq mümkün olsun. O da məxsusi qeyd olundu ki, belə bir sistemin gerçəkləşməsi üçün məhz maddi baza, yüksək intellekt mühüm şərtdir.

Eyni zamanda təhsilin keyfiyyətinə və əhəmiyyətinə qoyulan yeni tələblərin təhsil sistemi anlayışına baxışı yeniləşdirdiyindən özünütəhsil yolu ilə biliklərə yiyələnmə, təhsilverənlə təhsilalan arasında əlaqə, təhsilverənin səriştəliliyi, təlim metodologiyasına uyğun nəticə əldə etmək üçün informasiya–kommunikasiya texnologiyalarından lazımınca istifadə məsələlərindən söhbət açıldı.

Məruzənin fəlsəfəsindən qaynaqlanan

və konseptuallığı ilə diqqəti çəkən çıxışlarda, irəli sürülən təkliflər qurultayın mühüm səmərə verəcəyinə böyük inam yaratdı.

Qurultay hər bir təhsilverən üçün nəticələrə görə cavabdehlik məsələsinin, təhsilin nəticəyönlü olması üçün təhsil müəssisələrində şəffaf idarəetmə modelinin yaradılmasının vacibliyini də önə çəkdi.

- Yüksək təhsil səviyyəsinə malik peşəkar kadrlar yetişdirmək, ölkənin intellektual potensialını artırmaq, əlbəttə ki, hər bir müəllimin fəaliyyətinin başlıca hədəflərindən hesab edilir. Qurultayda da bu məsələyə xüsusi toxunulmuşdur. Bu barədə Sizin yanaşmanız necədir? Hansı texnologiyalardan istifadə səmərəliliyi təmin edəcəkdir?

Elektron dərslik, dərs vəsaiti və mühazirə mətnləri səmərəliliyi təmin edən müasir vasitələr kimi genişlənir. Universitetlər bu məsələlərin səmərəli şəkildə reallaşmasına xüsusi səy göstərirlər.

Təhsilin məzmununda irəliləyişlərin mümkünlüyünü, bunun üçün beynəlxalq təcrübənin öyrənilməsini yeni kurikulumların hazırlanması və tətbiqi məsələlərini kimi heç vaxt unutmuruq. Çünki kurikulumlar bilik və bacarıqların, səriştələrin aşılanmasına imkan yaradır. Ali təhsil verən konkret bir universitetin müəllimi kimi çalışırıq ki, kurikulumların da məzmununu texnoloji irəliləyişlərdən qaynaqlanan yenilikləri nəzərə almaqla daim inkişaf etdirək. Əks halda müxtəlif təhsil pillələrində spesifik yanaşmalar reallaşa bilməz. Çünki ali təhsil kurikulumunun inkişafı əmək bazarı subyektlərinin tələblərinin sistematik şəkildə öyrənilməsini tələb edir. Başqa sözlə, tələb və təklif: əmək bazarının nəzərə alınması hər bir ali təhsil müəssisəsi üçün mühüm şərtdir. Təhsilalanın öyrənməsi və inkişafını stimullaşdıran müəllim amilinin həlledicin rola malik olduğu da inkar olunmaz həqiqətdir. Təhsil infrastrukturu üçün yeni dərsliklərin yaranmasında alimlərimizin üzərinə mühüm vəzifələr düşdüyü də heç zaman yaddan çıxmır. Səriştəli təhsilverənlər hazırlamaq üçün ilk növbədə, təlim metodologiyası önə çəkilməli və hər bir öyrənci elektron dərsliklərlə yüklənmiş kompyuter – planşetlə təmin olunmalıdır. Çalışdığımız təhsil müəssisəsinin reytinqini artırmaq üçün hər birimiz qabaqcıl təcrübələri öyrənməli və onu təlim prosesi ilə əlaqələndirməyə çalışmalıyıq.

- İşlədiyiniz universitetdə bu məsələlər necə qarşılanır?

Yeni Azərbaycan Partiyası Səbail rayonu “Pedaqoqlar” ərazi ilk təşkilatının sədri, Azərbaycan Dövlət Pedaqoji Universitetinin professoru və eyni zamanda Azərbaycan müəllimlərinin XIV qurultayının nümayəndəsi olaraq məruzə və çıxışlar məndə  böyük təəssürat və qürur doğurdu. Həm də ona görə ki, hörmətli təhsil naziri Mikayıl Cabbarovun qlobal düşüncədən boy göstərən məruzəsinin əsas məqamları “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” haqqında sərəncamın fəlsəfəsi ilə üzvi vəhdət təşkil edirdi. Məruzənin ortaya qoyduğu bilgini biz kollektivin hər bir üzvü ilə bölüşür, fikir mübadiləsi aparır, bir təhsilverən olaraq təhsilalanlarımızın inkişafına vətəndaşlıq qayğısını diqqət mərkəzində saxlamağa çalışırıq. Çalışdığım ali təhsil müəssisəsində rəqabət mühitinin inkişafına təkan verən çeşidli amillər mövcuddur ki, bunların da sırasında “İlin alimi” və “İlin müəllimi” müsabiqəsi önəm kəsb edir. Tələbə gənclərimizin müxtəlif elmi konfranslarda öz biliklərini nümayiş etdirmələrinə, onların qabaqcıl təcrübəni mənimsəmələrinə münbit zəmin yaratmağa çalışırıq. Fəaliyyətimizin şəxsiyyətyönümlü təhsil konsepsiyası hədəflərinin düzgün müəyyənləşdirilməsi və təlim prosesinin müasirləşdirilməsi ilə birbaşa bağlılığı vardır.

**Müsahibəni apardı: “Azərbaycan məktəbi” jurnalının baş redaktor müavini, qabaqcıl təhsil işçisi, Azərbaycan Jurnalistlər Birliyinin üzvü**
**Nəsrəddin Musayev**

# ZAMAN ÖZ İŞİNİ GÖRÜR

**Müsahibimiz Hacıqabul Rayon Təhsil Şöbəsinin müdiri, əməkdar müəllim, Azərbaycan Jurnalistlər Birliyinin üzvü Şükür Məmmədovdur.**

Azərbaycan Müəllimlərinin XIV qurultayı hər bir qurultay iştirakçısında, o cümlədən qurultay nümayəndəsi kimi məndə də yüksək təəssürat yaratdı. Tale elə gətirib ki, işimlə əlaqədar mən Azərbaycan müəllimlərinin XII və XIII qurultaylarının da nümayəndəsi olmuşam. Bu səbəbdən müəllimlərin XIV qurultayının fərqli cəhətləri yaddaşımda dərin izlər buraxdı. İlk növbədə qeyd etmək lazımdır ki, qurultayın müasir dünya memarlığının incisi sayılan, ulu öndər, ümummilli lider Heydər Əliyevin adını daşıyan Mərkəzdə keçirilməsi qurultayın əzəmətini artırdı. Qurultayda yüksək dövlət və hökumət nümayəndələrinin, millət vəkilləri, QHT nümayəndələri, elm adamlarının iştirak etməsi Azərbaycan müəllimlərinə, eləcə də qurultayda müzakirə olunacaq məsələlərə yüksək diqqətin təcəssümü idi.

Etiraf edim ki, qurultay zaman baxımından çox uzun olmasa da, məzmunca, müzakirə olunan məslələlər, təhsil sisteminin mövcud durumunun dəyərləndirilməsi, qloballaşan dünyada təhsilimizin gələcək inkişaf yollarının, yeni strateji istiqamətlərin və qarşıda duran başlıca hədəflərin müəyyən olunması baxımından çox əhəmiyyətli və dəyərli oldu. Azərbaycan Respublikasının təhsil naziri cənab Mikayıl Cabbarovun qurultaya təqdim etdiyi məzmunlu və Azərbaycan təhsilinin yeni keyfiyyət mərhələsinə keçidi istiqamətində genişmiqyaslı tədbirlərin həyata keçirilməsini nəzərdə tutan hərtərəfli məruzəsi düşüncələrimizdə dərin iz buraxdı. Düz 107 il bundan qabaq, 1906-cı ildə Azərbaycan müəllimlərinin I qurultayının keçirilməsindən bu günümüzə bir mənəvi körpü salan təhsil naziri cənab Mikayıl Cabbarov öz məruzəsində “Azərbaycan Respublikasının dövlət bayrağındakı rənglərin daşıdığı məna və onların yuxarıdan aşağı yerləşmə ardıcıllığı ilə bu gün təhsil sistemimizin qarşısında duran əsas hədəflərin prioritetliyi arasında müəyyən bir paralelliyi müşahidə etmək olar: təhsil sisteminin yetişdirdiyi vətəndaş, ilk növbədə, öz köklərinə bağlı və milli mənsubiyyəti ilə fəxr edən vətənpərvər, dərin biliyə malik müasir baxışlı və mütərəqqi insan, öz xalqının adət-ənənələrinə və mənəvi dəyərlərinə sadiq bir şəxs olmalıdır” fikri ilə müasir dövrdə təhsil sistemimizin qarşısında duran hədəfləri müəyyən etdi. Məruzəni dinlədikcə “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın reallaşdırılması nəticəsində təhsilimizin yüksələcəyi keyfiyyətcə yeni bir mərhələ gözlərimiz önündə canlanırdı. Növbəti tədris ilində artıq təhsilalanların həftəlik və gündəlik dərs yükünü azaltmaqla paralel olaraq tədris ilinin müddətinin artırılması, müəllim peşəsinin ictimai nüfuzunun artırılması, onun yüksək maddi və mənəvi motivasiyası, müəllimlərin peşəkarlıq səviyyəsinin könüllü əsaslarla yoxlanması və bunun nəticələrinə əsasən diferensiallaşdırılmış əmək haqqının verilməsi kimi atılacaq addımlar ümumi orta təhsil sahəsində çalışan bir insan kimi hafizəmdə daha dərin izlər buraxdı.

Qurultayda ən yaddaqalan məqamlardan biri Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin qurultay iştirak-

çılarına ünvanlanmış təbrik məktubunun oxunması oldu.

Qurultayda məruzə ətrafındakı çıxışlar da yaddaqalan oldu. Çıxış edənlərin keyfiyyət tərkibinin düzgün, həm də çox zəngin və hərtərəfli seçilməsi diqqətdən kənarda qala bilməzdi. Çıxışlarda təhsilin bütün pillələrində çalışan, həmçinin təhsillə bağlı olan bütün qurumların nümayəndələri əhatə olunmuşdu. Qurultaydakı çıxışlarda təhsilin inkişafı ilə bağlı dəyərli fikirlərin, təkliflərin səslənməsi də yaddaqalan oldu.

Təhsil naziri M.Cabbarovun məruzəsində Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın geniş şərh olunması həmin sənədin ölkəmizin təhsil sisteminə gətirəcəyi yeniliklər barədə hər bir qurultay nümayəndəsində dərin təəssurat yaratdı. Qurultay Strategiyada göstərilən istiqamətlər üzrə qarşıya qoyulan hədəflərə çatmaq yollarının müəyyən olunduğu, təhsil quruculuğunda yeni mərhələyə start verildiyi əlamətdar bir tədbir, yaddaqalan hadisə kimi düşüncələrimizdə dərin iz buraxdı.

Qurultaydan keçən dövr ərzində ölkəmizin hər yerində olduğu kimi, Hacıqabul rayonunda da qurultay materiallarının dərindən öyrənilməsi və təbliğ olunması istiqamətində işlər aparılır. Rayonun bütün təhsil müəssisələrində Azərbaycan müəllimlərin XIV qurultayında təhsil naziri cənab Mikayıl Cabbarovun məruzəsinin öyrənilməsi və məruzədə irəli sürülən müddəaların hər bir təhsil işçisinə çatdırılması üçün "Dəyirmi masa"lar təşkil olunur. Keçirilən "Dəyirmi masa"larda qurultaya təqdim olunmuş məruzə perspektivdə təhsil sahəsində aparılacaq islahatlarda təhsil işçilərinə yol göstərən konseptual sənəd kimi dəyərləndirilmişdir. Ona görə də hesab edirik ki, qarşıdakı dövrdə qurultayda irəli sürülən hər bir ideya rayonumuzun təhsil işçiləri tərəfindən dərindən öyrənilməlidir. Bu ideyaların gerçəkləşdirilməsi üçün təhsilverənlərin hər biri bilik və bacarıqlarını əsirgəməməlidirlər. Rayon Təhsil Şöbəsi qurultayda təhsilin inkişafı ilə bağlı müəyyən olunmuş strateji hədəflərə çatmaq üçün rayonun bütün pedaqoji kollektivlərini səfərbər etmişdir.

Azərbaycan müəllimlərinin XIV qurultayı artıq tarixə çevrilmişdir. İnanırıq ki, Azərbaycan təhsilinin özünün zəngin ənənələrinə, milli-mənəvi və ümumbəşəri dəyərlərinə, beynəlxalq təcrübəyə əsaslanaraq daha da inkişaf etməsində, dünya təhsil sistemində öz layiqli yerini tutmasında Azərbaycan müəllimlərinin XIV qurultayının əhəmiyyəti daha böyük olacaqdır.

**Müsahibəni apardı: "Azərbaycan məktəbi" jurnalının məsul katibi, Azərbaycan Jurnalistlər Birliyinin üzvü, dosent Ənvər Abbasov**

# QURULTAYA YAXŞI GÖSTƏRİCİLƏRLƏ GƏLMİŞİK

**Müsahibimiz Neftçala Rayon Təhsil Şöbəsinin müdiri Əjdər Kərimovdur. O, rayon təhsil ictimaiyyətinin qurultayaqədərki fəaliyyəti, qazanılan uğurlar, mövcud olan problemlər və onların həlli yollarından danışdı.**

Müasir mərhələdə bütün sahələrdə həyata keçirilən iqtisadi, sosial, mədəni islahatların nəticəsi olaraq ölkəmiz dinamik inkişaf yolu ilə inamla irəliləyir, onun beynəlxalq aləmdə nüfuzu güclənir. Respublikamızda hər bir sahədə müşahidə olunan fasiləsiz inkişaf tendensiyası özünü təhsil sektorunda da göstərir. Bu inkişafın əsasında ulu öndər Heydər Əliyevin ideyaları və həmin ideyaların işığında həyata keçirilən aydın və ardıcıl strateji kurs dayanır. Möhtərəm Prezidentimiz İlham Əliyevin rəhbərliyi ilə müəyyənləşdirilən və icra edilən dövlət proqramları təhsil sistemində keyfiyyətcə yeni inkişafa, yüksək nəticələrin əldə edilməsinə geniş imkan və şərait yaradır. Ölkəmizdə aparılan islahatlar təhsil siyasətinin səmərəliliyini artıran nəticələrə gətirib çıxarmışdır. İslahatın qarşıya qoyduğu vəzifələrin uğurla həyata keçirilməsi isə müəllimin pedaqoji – psixoloji hazırlığı onun işə yaradıcı münasibəti və pedaqoji ustalığı ilə çox bağlıdır. Yalnız yüksək savada və intellektual potensiala malik olan, tədris etdiyi fənnin metodikasını, müasir təlim metodlarını mükəmməl bilən, yeni texnologiyalardan yaradıcılıqla istifadə etməyi bacaran müəllim bu işlərin öhdəsindən məharətlə gələ bilər. Tədris prosesində nəzəriyyə ilə praktikanın vəhdəti mühüm amildir. Yalnız müasir düşüncə tərzinə malik olan yenilikçi müəllimlər şagirdlərlə münasibətlərini pedaqoji etika üzərində qurub, öz yetirmələrinə yüksək mədəniyyətlə yanaşa bilər. Belə müəllimlər təlim prosesində şagirdləri fəallaşdırmağın müxtəlif vasitə və üsullarından ustalıqla yararlanırlar.

Təlim metodlarını seçərkən tədris fənlərinin xüsusiyyətlərini, dərsin didaktik məqsədini, sinfin hazırlıq səviyyəsini nəzərə almaqla dərsin səmərəli təşkilinə nail olmaq mümkündür. Unudulmamalıdır ki, təlimin tərbiyəedici xarakteri yalnız onun məzmununun ideya-tərbiyə istiqamətləri ilə deyil, həm də tədris işinin metodları və təşkilati formaları, şagirdlərin fəallaşdırılması ilə ölçülür. Bu səbəbdən də xüsusilə son dövrlərdə müəllim hazırlığı və onun peşə səriştəliliyinin artırılması istiqamətində əhəmiyyətli işlər görülür. Bu da təbiidir. Çünki peşəkar müəllim elə mütəxəssisdir ki, peşə normalarını bilir, qarşısına müstəqil məqsəd qoyur, öz təşəbbüsü ilə peşə qabiliyyətini inkişaf etdirir, yüksək motivasiya və özünütənzim səviyyəsinə malik olur, öz fəaliyyətini düzgün idarə etməyi bacarır. Peşə bacarıqlarına ixtisas (fənn) bacarıqlarından daha çox şəxsiyyət keyfiyyətləri daxildir. Peşə bacarığına malik olan müəllim pedaqoji fəaliyyətini, ünsiyyətini tələb olunan səviyyədə həyata keçirir, şagirdlərin təlim və tərbiyəsi işində yüksək nəticələr əldə edir.

Beləliklə, peşə bacarığının inkişafı dedikdə, müəllimin şəxsi yaradıcılığının inkişafı, yeniliyi qəbul etmək sahəsində formalaşması, ixtisasını, fənnini, onun tədrisi metodikasını və uşaq psixologiyasını dərindən bilmək əsasında pedaqoji innovasiyaları dərk etməsi və tətbiq etmək bacarığı başa düşülür. Müəllimin peşə bacarığının yüksəldilməsi təhsilin, təlim və tərbiyənin keyfiyyətini yüksəltməyin əsas şərtlərindən biridir.

Dünya təcrübəsinə də nəzər salsaq görərik ki, təhsil potensialı onun inkişafının əsasını təşkil edir. Əldə olunmuş bütün nailiyyətlər təhsil sahəsindəki irəliləyişlərin nəticəsi kimi meydana çıxmaqla özünü göstərir. Parlaq gələcək bu günün təhsil sütunları üzərində qurulur. Elmin, təhsilin nailiyyətlərinə əsaslanaraq formalaşır. Ulu öndər Heydər Əliyevin təbirincə demiş olsaq, "Gələcək bilikli, elmli insanların çiyinlərində qurulacaqdır". Müstəqillik yolunda addımlayan Azərbaycanın inkişafında təhsil önəmli yer tutur. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin dediyi kimi, "Təhsil Azərbaycanın davamlı inkişaf strategiyasının ən önəmli istiqamətlərindən biridir... Azərbaycanın gələcək inkişafı məhz təhsillə bağlıdır". Bu vaxta qədər təhsilə cəmiyyətin prioritet sahəsi kimi baxılması, onun islahatyönümlü fəaliyyət sahəsinə çevrilməsi məhz bu zərurətdən irəli gəlir.

Təhsil islahatının başlandığı vaxtdan indiyədək təhsilin, demək olar ki, bütün sahələrində müvafiq dəyişikliklərin aparılması onun hansı məzmunda və istiqamətlər üzrə həyata keçirildiyini aydın şəkildə göstərir. Xüsusilə ümumi təhsil sahəsində maddi-texniki bazanın möhkəmləndirilməsi, yeni məzmunun və texnologiyaların yaradılması, müəllim kadrlarının hazırlanması sahəsindəki tədbirlər bilavasitə görülmüş işlərdən və onların keyfiyyət səviyyəsindən xəbər verir. Son illərdə icbari ümumi təhsilin həyata keçirilməsində, yeni tipli tədris müəssisələrinin yaradılmasında, məktəbyaşlı uşaqların təhsillə əhatə olunması üçün təxirəsalınmaz tədbirlərin həyata keçirilməsində, təhsil sahəsi üzrə sosial-iqtisadi inkişaf planlarının, islahatla bağlı müvafiq proqramların hazırlanmasında ardıcıl addımlar atılır. Təhsil sahəsində çalışanlar üçün seminarların, müşavirələrin, konfransların təşkili, digər nazirliklər, idarə, beynəlxalq humanitar və yerli ictimai təşkilatlarla müvafiq istiqamətlər üzrə əlaqələrin inkişaf etdirilməsi, yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi istiqamətlərində müvafiq tədbirlərin həyata keçirilməsi, şagird nailiyyətlərinin qiymətləndirilməsi mexanizmlərinin yaradılması istiqamətində aparılan işlər ümumi təhsil sahəsinin dinamik inkişafını təmin edir. Rayonumuzda 52 ümumtəhsil məktəbi, o cümlədən 28 tam orta (onlardan biri humanitar təmayüllü liseydir), 16 ümumi orta, 1 internat ümumi orta, 7 ibtidai məktəb, habelə Uşaq Gənclər İdman və Şahmat məktəbləri fəaliyyət göstərir. Ötən dərs ilində ümumtəhsil məktəblərində 9865 nəfər şagird təhsil almış, onların təlim-tərbiyəsi ilə 1632 nəfər müəllim-pedaqoji işçi məşğul olmuşdur.

Ölkə Prezidentinin qayğısı, habelə Təhsil Nazirliyinin təhsilin daha da inkişafı naminə həyata keçirdiyi çox mühüm işlər qarşıya qoyulmuş vəzifələrin həllində əsas rol oynamış, təhsilin ayrı-ayrı sahələri üzrə Dövlət Proqramlarının yerinə yetirilməsi istiqamətində əməli tədbirlər planı həyata keçirilmiş, RTŞ tərəfindən hazırlanıb təsdiq edilmiş, fəaliyyət planının icrası əsasən yerinə yetirilmişdir.

Təhsil İslahatlarının hazırkı mərhələsində müəllimlərin hazırlığına xüsusi diqqət yetirilir. Rayonumuzun ümumtəhsil məktəblərinin V və VI siniflərində dərs deyəcək müəllimlərin yeni fənn proqramları (kurikulumları) üzrə treninqləri keçirilmiş, ümumilikdə 450 nəfərə yaxın müəllim treninqlərdən keçərək nəzəri və praktik hazırlıqlarını təkmilləşdirmişlər. İslahatın tələblərinə uyğun olaraq rəhbər təhsil işçilərinin də kurikulum üzrə treninqləri keçirilmiş, habelə idarəetmədə qərarların verilməsi üçün təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi

və monitorinq tədqiqatları nəticələrindən istifadə üzrə yerli təhsili idarəetmə heyətinin treninqi keçirilmişdir.

Məktəblərin informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilməsi sahəsində işlər davam etdirilir. Hazırda rayonun ümumtəhsil məktəblərində 404 ədəd kompyuter dəsti, 29 ədəd proyektor, 32 ədəd noutbuk vardır. 28 kompyuter kabineti quraşdırılmışdır. Rayon Təhsil Şöbəsi və 11 məktəb sürətli internetə qoşulmuşdur. Daha 14 məktəbin sürətli internetə qoşulması üçün lazımi texniki işlər görülmüşdür.

Yeni dərs ilində 1012 nəfər şagird I sinfə qəbul edilmişdir. Bundan başqa, "Xüsusi istedada malik uşaqların vaxtından əvvəl I sinfə qəbulu Qaydaları"nın təsdiq edilməsi barədə Təhsil Nazirliyinin 17 iyul 2013-cü il tarixli 739 nömrəli əmrinə əsasən Rayon Təhsil Şöbəsində komissiya yaradılmışdır. Komissiyaya müraciət edən 116 nəfərdən 94 nəfəri müsahibədən uğurla keçmişdir.

Attestatların verilməsi ilə bağlı ölkə Prezidentinin göstərdiyi humanizm rayonumuzun təhsil işçiləri və valideynləri tərəfindən yüksək qiymətləndirilmişdir. Ötən dərs ilində ümumtəhsil məktəblərini bitirən, XI sinifdə yekun qiymətləri məqbul olan, buraxılış imtahan qiymətindən asılı olmayaraq hər bir kəs attestat, IX sinfi bitirən şagirdlər isə şəhadətnamə aldılar. Məzunları və onlardan daha çox narahatlıq keçirən valideynləri bu cür problemlərdən azad etməklə cənab İlham Əliyev hər bir Azərbaycan vətəndaşının prezidenti olduğunu bir daha nümayiş etdirdi.

Ali məktəblərə tələbə qəbulunda uzun illərdir ki, rayonumuz Respublikada yüksək nəticə göstərən rayonlardan biri olur. 2013-cü ildə ali məktəblərə cəmi 222 nəfər abituriyent qəbul olunmuşdur. Məzunların sayına görə qəbul faizi 2012-ci ildə 24%, abituriyentlərin sayına görə qəbul faizi isə 40,7% olmuşdursa, 2013-cü ildə bu rəqəm artaraq məzun sayına görə qəbul faizi 27,8%, abituriyentlərin sayına görə qəbul faizi isə 53,1% olmuşdur.

Fənn olimpiadalarının nəticələri də uğurla olmuş, şagirdlərdən 7 nəfəri I yerə layiq görülərək Respublika turunda iştirak etmişlər. Bunlar Xıllı qəsəbə 1 nömrəli, Bankə qəsəbə 2 nömrəli, Qırmızıkənd, Qədimkənd, Mirqurbanlı və Cəngən kənd tam orta məktəblərinin şagirdləri olmuşlar. İştirakçılardan Bankə qəsəbə 2 nömrəli tam orta məktəbin XI sinif şagirdi Ələkbərova Əsmər Azərbaycan tarixi fənni üzrə IV yeri tutaraq Respublika qalibi olmuşdur.

Prezident sərəncamı ilə hər il keçirilən "İlin ən yaxşı müəllimi" Respublika müsabiqəsində ötən il rayonun Qırmızıkənd kənd tam orta məktəbinin Azərbaycan dili və ədəbiyyat müəllimi Ruhəngiz Nəcəfova müsabiqə qalibi olmuşdur.

Ümummilli lider Heydər Əliyevin anadan olmasının 90-ci ildönümü münasibətilə ulu öndərin həyatı və fəaliyyətinə həsr olunmuş inşa-yazı müsabiqəsinin rayon qalibi olmuş Xıllı qəsəbə 1 nömrəli tam orta məktəbin IX sinif şagirdi Yaqubova Nüşabə Bakı şəhərində keçirilmiş Respublika inşa-yazı müsabiqəsində iştirak edərək IV yer tutmuş və mükafatlandırılmışdır. Onun inşa-yazısı "Ümummilli lider Heydər Əliyev uşaqların gözü ilə" kitabına daxil edilmişdir. Müsabiqənin rayon turunda Neftçala şəhər 4 nömrəli, Bankə qəsəbə 1 nömrəli, Aşağı Surra, Mirqurbanlı, Xıllı qəsəbə 2 nömrəli tam orta məktəbləri, "Muğan" liseyi, şəhər internat və Aşağı Qaramanlı kənd ümumi orta məktəblərinin şagirdləri yüksək bilik nümayiş etdirmişlər.

Ümummilli lider Heydər Əliyevin anadan olmasının 90-cı ildönümü münasibətilə "Heydər Əliyev və müstəqil Azərbay-

can" mövzusunda keçirilmiş rəsm müsabiqəsində 3 nəfər şagirdimiz – Qədimkənd kənd tam orta məktəbin IX sinif şagirdi Gözəlov Məzahim, Aşağı Qaramanlı kənd ümumi orta məktəbin IV sinif şagirdi İmanov Şamil və "Muğan" liseyinin VIII sinif şagirdi Ələkbərov Emin iştirak etmiş, onlardan 2-nin- Qədimkənd və Aşağı Qaramanlı kənd məktəblərinin şagirdlərinin rəsm işləri qalib hesab edilərək xüsusi kataloqa daxil edilmişdir.

"İstedadlı uşaqlar festivalı - 2013"də 4 nəfər şagirdimiz – Bankə qəsəbə 2 nömrəli tam orta məktəbin XI sinif şagirdi Ələkbərova Əsmər, Bankə qəsəbə 1 nömrəli tam orta məktəbin IX sinif şagirdi İsmayılov Mirağa, Boyat kənd tam orta məktəbin IX sinif şagirdi Cəfərov Kənan, Aşağı Qaramanlı kənd ümumi orta məktəbin VII sinif şagirdi Kərimli Sadiq iştirak etmiş, onlardan ikisi-Əsmər Ələkbərova və Mirağa İsmayılov Azərbaycan Respublikası Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsinin "İstedadlı uşaqlar 2013-cü il ərzində göstərdiyi nailiyyətlərə görə diplomu"nu, habelə komitənin emblemini və hədiyyələr almışlar.

Bundan başqa əməkdar elm xadimi, tibb elmləri doktoru, akademik, oftalmoloq alim Zərifə xanım Əliyevanın unudulmaz xatirəsinə həsr olunmuş "Ana-müqəddəslik zirvəsi" mövzusunda inşa və rəsm müsabiqəsi keçirilmişdir. Müsabiqədə I yer tutmuş Qırmızıkənd kənd tam orta məktəbin XI sinif şagirdi Söylü Ağazadə və Mirqurbanlı kənd tam orta məktəbin X sinif şagirdi Aysel Hüseynovanın inşa-yazı işləri (elektron variantı ilə birlikdə), habelə Qədimkənd kənd tam orta məktəbin XI sinif şagirdi Aysunur Gözəlovanın rəsm işi Respublika müsabiqəsinə təqdim edilmişdir.

"Ekoerudit" məktəblilərin Respublika ekoloji breyn-rinq yarışının rayon qalibi olmuş Qədimkənd kənd tam orta məktəbinin 5 nəfərdən ibarət komandası Lənkəran şəhərində keçirilmiş Zona müsabiqəsində iştirak edərək III yer tutmuşlar.

"Şahin" hərbi-idman yarışlarının rayon turunda Bankə qəsəbə 2 nömrəli tam orta məktəbin komandası I yer, Astanlı kənd tam orta məktəbin komandası II yer, şəhər 3 nömrəli tam orta məktəbin komandası III yeri tutmuşdur. Bankə qəsəbə 2 nömrəli tam orta məktəbin komandası Bakı şəhərində keçirilmiş final yarışlarında iştirak etmişdir.

Rayonumuzun məktəblilərindən təşkil olunmuş idman komandaları Sabirabad şəhərində keçirilmiş məktəblilərin VII Respublika spartakiadasında müvəffəqiyyətlə iştirak edərək zona üzrə "Atletika" yarışlarında I yer, futbol yarışlarında II yer, voleybol yarışlarında isə III yeri tutmuşdur.

Təhsilin maddi-texniki bazasının möhkəmləndirilməsi, bir qayda olaraq diqqət mərkəzində saxlanılır. Belə ki, II Qaralı kənd məktəbi üçün inşa edilən 200 yerlik, Xəzər kənd tam orta məktəbi üçün inşa edilən 260 yerlik yeni məktəb binaları şagirdlərin istifadəsinə verilmişdir. Yuxarı Qaramanlı kənd tam orta məktəbi üçün tikilən 360 yerlik yeni məktəb binasının inşası davam etdirilir.

Məktəblərin təmiri əsasən başa çatdırılmışdır. Məktəblər yerli büdcənin, bələdiyyələrin və imkanlı valideynlərin hesabına cari təmir edilmişdir. Təkcə 2013-cü ildə 541 ədəd parta dəsti, 29 ədəd yazı lövhəsi, 26 ədəd müəllim masası, 64 ədəd stul İSO, 41 ədəd kitab şkafı, 18 ədəd kompyuter dəsti, 4 ədəd noutbuk, 3 ədəd printer, 4 ədəd proyektor, 3 ədəd surətçıxaran və 15 ədəd seyf, 73 adda 15557 ədəd dərslik gətirilib məktəblərə vermişdir.

Qeyd etmək lazımdır ki, müəyyən nailiyyətlər qazanılmasına baxmayaraq, rayonun ümumtəhsil məktəblərində müəyyən nöqsanlar və problemlər hələ də qalmaq-

dadır.

Məktəb şəbəkəsinin optimallaşdırılması sahəsində zəruri tədbirlərin görülməməsi, əvvəllər kadr siyasəti düzgün aparılmadığından eyni zamanda siniflərin sayı azaldığı üçün məktəblərdə müəllim, xüsusilə ibtidai sinif müəllimi sıxlığı yaranmışdır. Əmək Məcəlləsinə edilmiş dəyişikliklər kadr sıxlığının azaldılmasına müəyyən qədər kömək edir.

Ümumtəhsil məktəblərinin və digər təhsil müəssisələrinin əksəriyyəti hələ də vaxtı ilə başqa məqsədlər üçün tikilmiş uyğunlaşdırılmış binalarda yerləşir. Hal-hazırda 14 məktəb üçün yeni binanın tikintisinə, 24 məktəbin əsaslı təmirinə, 4 məktəbin cari təmirinə, 16 məktəb üçün 1600 şagird yerlik, 80 əlavə sinif otağının tikintisinə, RTŞ binasının əsaslı təmirinə ciddi ehtiyac vardır.

Yeni dərs ilində Rayon Təhsil Şöbəsi və rayonun bütün təhsil müəssisələri qarşısında çox mühüm vəzifələr durur. Təhsilin ayrı-ayrı sahələri üzrə qəbul edilmiş dövlət proqramlarının yerinə yetirilməsi istiqamətində işlər hər vasitə ilə sürətləndirilməli, fəallıq və işgüzarlıq artırılmalıdır. Hər şeydən əvvəl, Rayon Təhsil Şöbəsi və bütün pedaqoji kollektivlər əlaqədar təşkilatlarla sıx təmasda işləyərək yuxarıda sadalanan nöqsan və problemlərin həllinə ciddi səy göstərməlidirlər.

Bu gün ümumi təhsilin prioritet problemlərindən biri kimi onun yeni məzmununun tətbiqi istiqamətində işlər aparılır, yeni təhsil proqramları (kurikulumları) tətbiq olunur. Artıq bir neçə ildir ki, bu proses davam etməkdədir. Daha konkret demiş olsaq, bu il əvvəlki siniflərin davamı kimi VI sinifdə yeni təhsil proqramları (kurikulumları) tətbiq olunur.

Yeni təhsil proqramları (kurikulumları) ilə işləyən müəllim bütün fəaliyyəti boyu məntiqi və yaradıcı yanaşma tərzi ilə özünün orijinal konstruktiv və yaradıcı pedaqoji nümunələrini meydana qoymalıdır. İlkin təcrübələr göstərir ki, dərsləri yalnız bu yolla quru, sxematik, cansıxıcı təsir dairəsindən çıxarmaq, onu maraqlı bir prosesə çevirmək mümkündür. İstər Rayon Təhsil Şöbəsi, istərsə də məktəb rəhbərləri, həmin siniflərdə tədris, təlim-tərbiyə işlərinə rəhbərlik, nəzarət və metodiki köməklik işini gündəlik diqqət mərkəzində saxlamalı, bunu özlərinin bir nömrəli vəzifələri hesab etməlidirlər. Rayonun bütün fənn müəllimləri, pedaqoji kollektivlər fənn kurikulumlarına aid dövlət sənədlərini ciddi öyrənməli, treninqlərdən keçməli, kollektivlərdə işgüzar müzakirələr aparılıb, əməli təkliflər irəli sürülməlidir.

İstedadlı uşaqlarla iş aparmaq Azərbaycanda təhsil siyasətinin mühüm bir istiqamətini təşkil edir. Azərbaycan Respublikası Konstitusiyasının 47-ci maddəsində təsbit olunmuş belə bir müddəa vardır: "Dövlət maddi vəziyyətindən asılı olmayaraq istedadlı şəxslərin təhsili davam etdirməsinə təminat verir, sosial müdafiəyə ehtiyacı olanların təhsil almasına şərait yaradır".

İstedadlılarla iş daha geniş miqyasda anlaşıldığından onun reallaşdırılmasının ölkənin hər bir yerində, rayonun hər bir təhsil müəssisəsində, hətta hər bir sinifdə izlənilməsi vacib hesab edilir. Bu məsələ uşaqlarla işləyən hər kəsin diqqət mərkəzində olmaqla onun vətəndaşlıq borcuna çevrilməli, ölkənin təhsil siyasətindən irəli gələn bir vəzifə kimi həll edilməlidir.

Məlum olduğu kimi, məktəb və valideyn əlaqələrinin qurulması pedaqoji məsələ kimi həmişə aktual olmuşdur. Lakin informasiyalı cəmiyyətin yarandığı, məlumatların genişləndiyi bir zamanda təhsilin məzmununu yeniləşdirmək, təşkilini daha səmərəli qurmaq üçün məktəbin fəaliyyət imkanlarının genişlənməsinə yardım göstərən qüv-

vələrdən istifadə olunmasına ehtiyac yaranır. Valideyn bunların içərisində maraqlı olan tərəf kimi ən etibarlı qüvvədir. O, müasir təhsil şəraitində özünün əvvəlki seyrçi funksiyasını dəyişməli, məktəbin idarə olunmasında və tədirs prosesində fəal iştirakçıya çevrilməlidir. Əks halda, məktəb şagirdlərin təlim-tərbiyəsində öz missiyasını yerinə yetirməkdə çətinlik çəkəcəkdir. Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarov ümummilli lider Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş məktəblilərin Respublika inşa-yazı müsabiqəsi qaliblərinin mükafatlandırılması mərasimindəki çıxışında bu məsələyə münasibətini belə bildirmişdir: “Məktəb elə bir məkandır ki, burada biz uşaqlarımızın mənəviyyatının əsasını qoyuruq. Məktəbdə hökm sürən psixoloji atmosfer övladlarımızın gələcək həyat yoluna, mənəvi dəyərlərinə və əqidələrinə, milli identifikasiyasına və vətəndaşlıq hislərinə bilavasitə təsir göstərir. Mən bu məsələdə valideynlərin də rolunu qeyd etmək istərdim. Təhsil sahəsində nazirliyin və ya təhsil müəssisəsinin təkbaşına səyləri ilə vəziyyətin düzəldilməsinə inanmaq sadəlövhlük olardı. Bu, eyni zamanda hər bir ailənin və bütövlükdə cəmiyyətin ümumi işidir. Bizim mövqeyimiz ondan ibarətdir ki, məktəblərin idarə olunmasında və təhsil ocaqlarında müsbət atmosferin yaradılmasında valideynlərin rolu artmalı, bunun üçün islahatlar aparılmalıdır”.

Mühüm bir məsələ-müəllimlərin hazırlığı məsələsi də gündəmdə dayanan məsələlərdən olmalıdır. Çünki təhsil islahatının ən zəruri istiqamətlərindən biri onun hərəkətverici qüvvələrinə çevrilən müəllim kadrlarının pedaqoji-psixoloji cəhətdən inkişaf etdirilməsi, peşəkarlıq cəhətdən müasir texnologiyalarla işləməyə hazırlanmalarıdır.

Eyni zamanda məktəblərin pedaqoji-metodik laboratoriyaya çevrilməsi, müəllimin ardıcıl və sistemli olaraq elmi-metodik təminatının ödənilməsi üçün potensial imkanların gücləndirilməsi istiqamətində tədbirlər həyata keçirilməlidir.

Möhtərəm Prezidentimizin ölkədə gənclərin avanqard rolunun gücləndirilməsi sahəsində yürütdüyü xoşməramlı siyasətlə bağlı istedadlı gənc müəllimlərin fəaliyyətinin təkmilləşdirilməsi və stimullaşdırılması üzrə təhsil nazirinin 15 iyul 2011-ci il tarixli 1436 nömrəli əmri ilə təsdiq edilmiş xüsusi fəaliyyət planının icrasına ciddi əməl olunmalıdır.

Ümumiyyətlə, yeni dərs ilində Rayon Təhsil Şöbəsi öz fəaliyyətinin müasir tələblər nəzərə alınmaqla yenidən qurulmasına hərtərəfli diqqət yetirir. İş sahələri üzrə planlaşdırmanın nəticələr əsasında qurulması, məktəb şəbəkəsinin və şagird kontingentinin optimallaşdırılması, təlim nəticələrinə görə özünü doğrultmayan məktəblərin tipinin dəyişdirilməsi, icbari ümumi təhsilin yerinə yetirilməsi, məktəb rəhbərləri və müəllimlərin icra intizamının, peşəkarlıq səviyyəsinin yüksəldilməsi, müasir idarəetmə mexanizminin tətbiqi, təhsilin keyfiyyətinə nəzarəti təmin etmək məqsədilə təcrübədə sınaqdan çıxmış vasitələrdən səmərəli istifadə olunması istiqamətində düşünülmüş, ardıcıl işlər həyata keçirilir.

**Müsahibəni apardı: “Azərbaycan məktəbi” jurnalının baş redaktor müavini, qabaqcıl təhsil işçisi, Azərbaycan Jurnalistlər Birliyinin üzvü Nəsrəddin Musayev**

# İNKLÜZİV TƏHSİL PSİXOLOJİ HAZIRLIQDAN BAŞLAMALIDIR

**Müsahibimiz 43 nömrəli məktəb-liseyin direktoru Qafar Hüseynovdur.**

Azərbaycan Respublikasının inkişaf konsepsiyasına uyğun olaraq şəxsə hərtərəfli bilik və bacarıqların verilməsi ilə təhsil sisteminin əsasları, insan resursları inkişaf etdirilməsi nəzərdə tutulmuşdur. Təhsilin inkişafı isə ölkədə əhalinin rifahının yaxşılaşması üçün zəmin yaradır. Müasir anlamda təhsil insanlara yeni texnologiyaları çevik mənimsəmək, həyatda layiqli yer tutmaq, ömür boyu təhsil prosesinə qoşula bilmək, sağlam həyat tərzi, mürəkkəb həyati situasiyalarda düzgün mövqe nümayiş etdirmək imkanı verir. Bundan başqa təhsilin xalqın milli-mənəvi dəyərlərinin və mədəniyyətimizin qorunub saxlanmasında çox böyük rola malik olduğunu düşünsək, 2013-cü il 24 oktyabr tarixli sərəncamı ilə Azərbaycan Respublikası Prezidentinin Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası adlı sənədinin nə qədər önəmli olduğu aydın olur. Axı təhsil prosesində əldə olunan kompetensiyalar təhsilalanın cəmiyyətin layiqli üzvü olması üçün lazımi şərait yaradır. Heç təsadüfi deyil ki, bu sərəncam Azərbaycan müəllimlərinin XIV qurultayı ərəfəsində qəbul edilmişdir. Təhsilin aparıcı qüvvəsi sayılan müəllimlərin qayğısına qalmaq beynəlxalq səviyyədə də hər zaman önəmli məsələlərdən olmuşdur. 1994-cü il oktyabrın 5-də Parisdə xüsusi Dövlətlərarası müəllimlərin statusu haqqında (Spesial Ingoverinmental Confrerense on the status of teschers) baş tutan konfrans keçirilib, həmin konfransın nəticəsi olaraq YUNESKO və Beynəlxalq əmək təşkilatının nümayəndələri tərəfindən “Müəllimlərin statusu ilə bağlı tövsiyələr” adlı sənəd imzalanmışdır.

Müsahibəsini bu müqəddimə ilə başlayan Qafar Hüseynov XIV qurultayın nümayəndəsi, filologiya elmləri doktoru, Pyotr Elmlər Akademiyasının müxbir üzvüdür.

- Qafar müəllim, XIV Respublika Müəllimlər qurultayı təhsil aləmində son dövrlərdə bir-birini izləyən çox maraqlı hadisələrdən biridir. Qurultay haqqında təəssüratınız necədir?

- Fəxr hissi ilə qeyd etmək istərdim ki, mən də müstəqillik dövründə keçirilən növbəti qurultayın iştirakçısı oldum. Qurultay maraqlı çıxışları ilə uzun müddət yadda qalacaq. Hörmətli nazirimizin məruzəsi isə sanki günün nəbzi ilə üst-üstə düşmüş, konseptual sənəddir.

Məruzəçinin yeni təhsil sistemi ilə bağlı gərəkli mülahizələri təhsil işçilərini və bütün xalqı razı saldı. Onu da qeyd etmək istərdim ki, Qurultayın keçirildiyi məkan onun əhəmiyyətini daha da artırdı! Ən layiqli, fədakar təhsil işçiləri qurultaya nümayəndə kimi gəlmişdi.

- Qurultaya məktəbinizin hansı uğurları ilə gəlmişdiniz?

- Əlbəttə, hər bir məktəb şagirdlərin uğurları ilə önəmlidir. Ötən dərs ilində 5 şagirdimiz Fənn olimpiadasında fəxri yerlərə sahib olmuşdur, 14 şagirdimiz 600-700 bal ilə universitetlərə qəbul olunmuşdur və 1 şagird prezident təqaüdçüsüdür, 5 şagirdimiz isə orta məktəbi qızıl medalla başa vurub, müvəffəqiyyətlə ali məktəbə daxil olmuşdur. Müəllimlərdən 9-u təlimçi statusu, 3 müəllimimiz fəlsəfə doktoru adını almışdır. Yeni sahə kimi tətbiq edilən inklüziv təhsildə qazanılan uğurları ayrıca qeyd etmək istərdim.

- Bütün dünyada gedən bu mərhəmətli prosesə münasibəti kimi məktəbimizin direktor müavini Kəmalə Bədəlova da tövsiyələrini söylədi. Sizcə inklüziv təhsil özünü

doğruldurmu? Belə şagirdlərlə işləməyin daha hansı yolları var?

- İnklüziv təshil günümüzün tələbidir desək yanılmarıq. Uşaq hüquqlarının qorunması məsələsi hər cür uşağın eyni hüquqlara malik olması anlamına gəlir. Artıq bir neçə ildir ki, bizim ölkəmizdə də xüsusi qayğıya ehtiyacı olan uşaqlar digər uşaqlarla bir yerdə təhsil alırlar. Əgər bu iş 8 il qabaq 12 uşaqla başlamışdısa, bu rəqəm 8 ildə xeyli artmışdır. Lakin bunu o qədər də sevindirici bir fakt kimi də qəbul edə bilmirəm. Bunun üçün şagirdlərimizə inklüziyanın yaranma səbəblərini aydınlaşdıran tibbi biliklər verilsə yaxşı olar. Çünki cəmiyyətimiz belə uşaqlara qayğısını nə qədər artırsa da, dünyaya gələn uşaqların sağlam və yaxud məktəbəqədər dövrdə uşaqların ciddi nəzərə alınması, həkim nəzarəti altında olmaları üçün valideynləri maarifləndirmək işinin vacibliyi nəzərə alınaraq bu məsələnin labüdlüyü qeyd olunmalıdır. Belə olarsa, uşaqlar erkən yaşdan müalicə və reabilitasiya alaraq məktəbə psixoloji hazırlıq dövrünü uğurla başa çatdıra bilərlər.

Əlbəttə ki, bugünkü tələblərə uyğun olaraq hər bir inklüziv uşağın gələcəkdə cəmiyyətə inteqrasiyası üçün uşağın özündən inkişafca irəlidə olan uşaqlarla birgə təhsil ala bilmələri onlara müsbət təsir göstərəcək başlıca faktorlardandır. İnklüziv təhsil-bəşəriyyətin mərhəmətə çağırışlarındandır. Ona görə də bu təhsilin öhdəsindən, əlbəttə ki, qəlbi mərhəmət hissi ilə dolu olan insanlar – istər müəllimlər, istərsə də şagirdlər uğurla gələ bilərlər. Bu işdə məktəbdə psixoloji xidmətin də rolu böyükdür. Axı psixoloq hər situasiyanın ən obyektiv cəhətlərini təhlil edərək hər kəsi bu təhsilin xüsusi qayğıya ehtiyacı olan uşaqların həyatında nə qədər önəmli olduğuna inandıra bilər. Onun yaratdığı çətinliklərin öhdəsindən gəlməkdə həm müəllimlərə, həm də şagird yoldaşlarına əsas yardımçı məhz müdiriyyətlə birgə psixoloq ola bilər. Bu barədə ölkəmizdə geniş təcrübə toplanmışdır. Ona görə də, bu ildən məktəbimizdə ayrıca psixoloq otağı fəaliyyət göstərir.

- Hazırda məktəbinizin maddi-tədris bazası sizi qane edirmi?

- Bu gün maddi tədris bazasının daha çox gələcəkdə müasir peşəyönümlü olmasını arzulayardım. Tez-tez valideynlərlə, yuxarı sinif şagirdləri ilə söhbət, test keçirirəm və görürəm ki, onların da arzusu odur. Yeni təhsil strategiyasında da bu məsələyə xüsusi önəm verilir. Yəqin ki, zamanın axarı bunu da öz yoluna qoyacaqdır.

- Qafar müəllim, məktəbinizin beynəlxalq əlaqələri haqqında nə deyə bilərsiniz?

- Hal-hazırda məktəbimiz Qazaxıstanın, İtaliyanın, Rusiyanın bir neçə məktəb-liseyləri ilə əməkdaşlıq edir. Bundan əlavə Rusiyanın bir neçə muzey kompleksləri ilə əlaqələrimiz var. Müəllimlərimiz müxtəlif universitetlərdə ayrı-ayrı fənlər üzrə distant təhsil verən kurslara cəlb olunublar. YUNİSEF-lə də əməkdaşlıq da işlərin müasirləşməsi və nəhayət, Avropa təhsilinə inteqrasiya məsələlərini reallaşdırmağa xidmət edir.

- “Azərbaycan məktəbi” jurnalına və onun oxucularına arzularınız?

- Əvvəla “Azərbaycan məktəbi” hamımızın jurnalıdır. O, 90 ildir öz vəzifəsini şərəflə yerinə yetirir. Oxucuları isə, jurnalı oxumağa, ondan faydalanmağa çağırıram. Axı bu jurnal bizim elmi-pedaqoji təfəkkürümüzün mərəzidir. Onu oxumamaq olarmı?

Çox sağ olun, Qafar müəllim! Biz də jurnalımızda tez-tez sizin yazılarınızı görmək istəyirik.

**Müsahibəni apardı: Azərbaycan Jurnalistlər Birliyinin üzvü, pedaqogika üzrə fəlsəfə doktoru Elnarə Məmmədova**

# QƏTİYYƏTLİ ADDIMLAR

**Müsahibimiz 132-134 nömrəli Təhsil Kompleksinin direktoru, Əməkdar müəllim Sara Xanlarovadır.**

Azərbaycanda təhsilin dünyanın inkişaf tendensiyalarına və beynəlxalq standartlara cavab verən hazırkı səviyyəyə çatması və inkişafında ümummilli liderimiz Heydər Əliyevin müstəsna xidmətlərinin olması tarixi həqiqətdir. Bu gün sürətlə dünya birliyinə inteqrasiya edən müstəqil Azərbaycan dövləti, onun çağdaş milli tarixinin son bir qərinəsi Heydər Əliyevin fəaliyyəti ilə bağlıdır və bu dövr Azərbaycan Respublikasında sosial-iqtisadi və mədəni sahələrin, xüsusilə də təhsilin inkişafında önəmli mərhələ təşkil edir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında ölkəmizdə, bütün sahələrdə olduğu kimi, təhsil sahəsində də həyata keçirilən çoxşaxəli, ardıcıl siyasət məhz Heydər Əliyev ideyalarının təntənəsidir. Bu gün ölkəmizin birinci xanımı, Heydər Əliyev Fondunun Prezidenti, millət vəkili Mehriban xanım Əliyeva istər ölkəmizdə, istərsə də Vətəndən uzaqlarda ən yüksək kürsülərdə öz işi, bacarığı və əvəzsiz keyfiyyətləri ilə Azərbaycanın adını daim zirvələrə ucaldır. Qeyd edim ki, Heydər Əliyev Fondunun təhsillə bağlı qarşıya qoyduğu əsas məqsəd Azərbaycanda bu sahənin qloballaşan dünyanın tələbləri səviyyəsində qurulmuş, milli təhsil modelinin gerçəkləşdirilməsinə zəmin formalaşdırmaqdan ibarətdir. Fondun təhsil sahəsində gördüyü işlər sırasında respublikamızın müxtəlif bölgələrində reallaşdırılan "Yeniləşən Azərbaycana yeni məktəb" proqramı müstəsna əhəmiyyətə malikdir. Layihə çərçivəsində ölkəmizin müxtəlif bölgələrində rekord sayda məktəb binasının və əlavə tədris korpuslarının tikilərək istifadəyə verilməsi, onların lazımi avadanlıqlarla təchiz olunması bu sahəyə əvəzsiz töhfədir.

132-134 nömrəli Təhsil Kompleksi də bu məktəblərdən biridir. Təhsil ocağımız, xüsusən də çox qədim tarixi olan bu tarixi memarlıq abidəsinə göstərdiyi böyük qayğıya görə, dövlətimizin başçısına minnətdarıq. Təhsil Kompleksinin yenidən qurularaq istifadəyə verilməsi nəinki biz müəllimlərin, şagirdlərin, valideynlərin, həmçinin vaxtilə buranın məzunu olmuş yüzlərlə insanın sevincinə səbəb olmuşdur. Bu sevinc hissləri bundan sonra hələ neçə-neçə nəsillərə də nəsib olacaqdır.

2013-cü il oktyabrın 24-də Azərbaycan Respublikası Prezidentinin təsdiq etdiyi və ölkəmizin tarixində mühüm hadisəyə çevrilmiş "Azərbaycan Respublikasının təhsil sahəsində Dövlət Strategiyası" sənədini, orada müəyyən olunmuş və xalqımızın gələcək inkişafı ilə bağlı hədəfləri, onlarla bağlı üzərimizə düşən vəzifələrin məsuliyyətini çox dərindən dərk edirik. Eyni zamanda nümayəndəsi olduğum Azərbaycan müəllimlərinin XIV qurultayında müzakirə edilmiş və perspektivlərlə bağlı müəyyən olunmuş vəzifələri yaxşı başa düşürük. Anlayırıq ki, müasir dünyanın təhsil məkanı heç də bəşəriyyətin tarixi boyu insanların yol yoldaşı olan, onların savadlı və bilikli olmalarında həlledici rol oynayan təhsil məkanı ilə eyni deyildir. Bu günün təhsili bütövlükdə insanın şəxsiyyətinin inkişafına yönəlmiş bir sistem olmaqla tam mənasında yeni bir mahiyyət kəsb edir. Orada dəyərlərin əldə olunması, yeni keyfiyyət göstəricilərinin qazanılması əsas göstərici kimi təhsil müəssisələrinin atributuna çevrilir. Yaxud keyfiyyətli təhsil nailiyyətlərinə sahib olmaq üçün peşəkarlığı ilə seçilən yüksək səviyyəli pedaqoji kadrların yetişdirilməsi, eləcə də təhsilini yeni infrastrukturunun maliyyə və idarəetmə mexanizmlərinin yaradılması fəaliyyət hə-

dəfləri kimi xüsusi aktuallıq kəs edir.

Azərbaycan müəllimlərinin XIV qurultayı da, bütövlükdə ölkədə qəbul olunmuş mühüm strateji hədəflərin reallaşdırılması istiqamətində müzakirə obyektinə çevrilməklə təhsilimizin inkişafındakı yeni mərhələni, onun prioritet problemlərini müəyyən etdi. Düşüncə və təfəkkür məktəbinə doğru atılacaq addımların nəzəri-konseptual, eləcə də inkişafetdirici xarakterindən danışıldı, müzakirələr aparıldı.

Müəllimin fəaliyyət imkanlarının, eləcə də yaradıcılıq potensialını inkişaf etdirməklə nüfuzunun yüksəldilməsi üçün strateji fəaliyyət istiqamətləri müəyyənləşdirildi.

Düşünürəm ki, bütün bu vəzifələrin yerinə yetirilməsində ölkəmizin digər təhsil müəssisələri kimi bizim Tədris Kompleksinin də üzərinə çox ciddi vəzifələr düşür. Belə ki, bu kompleksdən Azərbaycanın müstəqil inkişafının təminatçısı olan, gənc nəslin yetişdirilməsində klassik təcrübə qazanmış avanqard təhsil müəssisəsi kimi fəaliyyət göstərməsi tələb olunur.

Yeni standartlara uyğun maddi-texniki tədris bazası olan bu Tədris Kompleksində hazırda 2300-dən artıq şagird təhsil alır, 197 nəfər müəllim fəaliyyət göstərir. Təhsil Kompleksi YUNESKO Assotiativ məktəblər şəbəkəsinə daxildir. Ötən ilin sonunda kompleksdə “Samsung Smart School” proqramı çərçivəsində elektron lövhə və planşetlərlə təmin olunmuş sinfin açılış mərasimi olmuşdur. Burada yaradılmış xüsusi sinif 35 planşet, 1 noutbuk, müvafiq proqram təminatı bir-biri ilə əlaqəli olan interaktiv lövhə və printerlə təchiz edilmişdir.

Təhsil Kompleksi Azərbaycanda, bəlkə də, ilk təhsil müəssisəsidir ki, uşaqlar 3 yaşından 17 yaşına qədər məhz burada təhsil alır. Avropa (Fransa) modeli olan – “Ana məktəb” layihəsi 3 yaşından təhsil alan hər bir uşağın məktəb təliminə hazırlanması, xarici dillərin öyrədilməsi, psixoloji inkişafı əsas istiqamətlər kimi götürülür. Burada uşaqlara ingilis, fransız dilləri hazırda tədris olunmaqdadır, bu ildən isə italyan dili də bu dillərə əlavə olunacaqdır. Təhsil Kompleksi artıq 3 ildir ki, elektron məktəb layihəsinə qoşulub. Kompleks daxilində də hər ayın sonunda hər bir şagirdin qiymətləndirilməsi həyata keçirilir. Bununla da şagirdlərin qiymətləri elektron jurnallara köçürülür. Beləliklə də, valideynlər övladlarının aldıqları nəticələri “Elektron gündəlik” layihəsinə qoşularaq görmək imkanına malik olurlar.

Məktəbimizdə gedən bu dəyişikliklər ölkəmizdəki təhsil islahatlarına uyğun olaraq aparılır. Heç təsadüfi deyil ki, məktəbimizin müəllimləri peşəkarlıq səviyyələrini daim Respublika daxili və xarici ölkələrdə keçirilən müxtəlif təlim treninqlərində fəal iştirak edərək artırırlar. Məktəbdə yeni yaradılmış Kurikulum Mərkəzi onun yeni metodik infrastrukturunu müəyyən edir. Bu mərkəzin məzmunu və strukturu yeni təhsil siyasətinə uyğun qurulmaqla mühüm strateji əhəmiyyət daşıyır. Orada məktəb üzrə müəllimlərin ehtiyac və tələbatlarının öyrənilməsi, yeni pedaqoji texnologiyalardan istifadə etmələrinə dəstək verilməsi, fəaliyyətlərin stimullaşdırılması və qiymətləndirilməsi sahələrində planlı və ardıcıl işlər aparılır.

Azərbaycanın təhsil məkanında uğurları gündən-günə artır. Biz bu inkişafın canlı şahidi, həm də iştirakçısı kimi əminliklə deyə bilərik ki, onun daha böyük nailiyyətləri bizim kimi təhsil işçilərinin ardıcıl və inamlı fəaliyyətindən çox asılıdır.

**Müsahibəni apardı: “Azərbaycan məktəbi” jurnalının məsul katibi, əməkdar müəllim Ənvər Abbasov**

# UĞURLARIMIZ BİZİ ARXAYINLAŞDIRMIR

**Müsahibimiz, Azərbaycan Müəllimlərinin XIV qurultayının nümayəndəsi, Bakı şəhərindəki A.Şərifov adına 114 nömrəli orta məktəbin direktoru Ceyran Novruzovadır.**

- Ceyran xanım, XIV qurultay nümayəndəsi seçiləndə ilk növbədə nə barədə düşündünüz?

- Məlumat üçün bildirmək istəyirəm ki, məktəbimiz Azərbaycan Respublikası Prezidentinin 05 iyun 2010-cu il tarixli, 997 nömrəli Sərəncamı ilə 2009/2010-cu tədris ilində keçirilmiş yaxşı ümumtəhsil məktəb müsabiqəsinin 50 qalibindən biri olmuşdur. Əlbəttə, buna uzun illərin zəhmətinin nəticəsi kimi baxılmalıdır. Həm də qurultay nümayəndəsi kimi bu sevinci mən üçüncü dəfədir ki, yaşayıram. Fəxr edirəm ki, Azərbaycan Müəllimlərinin 23.09.2008-ci il tarixində keçirilmiş XIII qurultayının, həmçinin 14.12.2013-cü il tarixində keçirilmiş Azərbaycan qadınlarının IV qurultayının nümayəndəsi olmuşam. Azərbaycan müəllimlərinin indiki XIV qurultayında isə, daha böyük uğurları olan məktəbin direktoru kimi iştirak etmişəm.

Son illərdə məktəbimizin adı qabaqcıllar sırasında çəkilir. Yaxın illərdə məktəbimizin 50 yaşı tamam olacaqdı.

Suraxanı rayonundakı 114 nömrəli məktəb qapılarını şagirdlərinin üzünə 1966-cı ilin 1 sentyabrından açmışdır. Məktəbimizin indiki səviyyəyə çatması üçün çox iş görülmüşdür.

İlk növbədə məktəbin maddi-texniki bazasını möhkəmləndirmək məqsədilə 2006-cı ildə 300 yerlik 15 sinif otağına malik 3 mərtəbəli bina tikilmişdir. Şagird kontingentinin genişlənməsi ilə əlaqədar 2010-cu ildə 800 yerlik 40 sinif otağı üçün 3 mərtəbəli yeni bina da inşa edilmişdir. Məktəbdə ulu öndərimiz Heydər Əliyevin xatirəsini əbədiləşdirən heykəl, peşəsini və şərəfli ömür yolunu əks etdirən muzey fəaliyyət göstərir. Muzeydə uşaqları maraqlandıran çoxlu şəkillər, məlumatlar vardır.

Məktəb öz qarşısına "Azərbaycan Respublikası Təhsil Qanunu"nda və "Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda qarşıya qoyulan məsələlərin yerinə yetirilməsi üçün onu möhtəşəm vəzifələr gözləyir. Bunun üçün ilk növbədə məktəbin idarə edilməsində şəffaflığı və aşkarlığı artırmaq, cəmiyyət və məktəb, cəmiyyət və müəllim arasında sağlam münasibətlərin bərqərar olunmasında yardımçı olmaq, fənn kurikulumlarının mahiyyətinin valideynlərə çatdırılması üçün maarifləndirmə işlərini gücləndirmək, məktəblilərin sağlamlığının qorunmasına və fiziki tərbiyəsinə diqqətin artırılması yolu ilə onların pis vərdişlərdən çəkindirilməsinə və sağlam böyümələrinə şərait yaratmaq və b. problemlərin həlli bizi gözləyir. Pedaqoji kollektivdə sağlam mənəvi iqlimin, pedaqoji psixoloji mühiti müasir tələblər səviyyəsinə qaldırmaq üçün maddi-texniki bazanı yaxşılaşdırmaq, psixoloji mühiti optimallaşdırmaq, müəllim-şagird münasibətini tənzimləmək, məktəb-valideyn münasibətini inkişaf etdirmək, təlimin yeni məzmununun tətbiqinə çalışmaq, təlim prosesində qabaqcıl təcrübəni, o cümlədən xarici təcrübəni genişləndirmək, müasir təlim və texnologiyalardan istifadəyə geniş yer vermək kimi prinsiplər müasirlik səviyyəsində qurulmalıdır.

Şagirdlərin milli ruhda, Heydər Əliyev ruhuna sədaqət ruhunda tərbiyələnməsini ardıcıl davam etdirmək məqsədilə bu sahədəki

tədbirlərin keyfiyyəti günü-gündən yaxşılaşdırılmalıdır.

Uşaqların təhlükəsizliyini təmin etmək kimi incə mətləblər hər an diqqət mərkəzində olmalıdır.

Bütün bunlar üçün məktəbimizdə hər cür şərait yaradılmışdır. Məktəbin zəngin kitabxanası vardır. Burada 10725 ədədə yaxın kitab fondu saxlanılır. Məktəbdə 126 kompyuter otağı, 2 ədəd noutbuk, 5 ədəd printer, 3 ədəd proyektorla təmin olunmuş kompyuter otağı vardır. Məktəb internet şəbəkəsinə qoşulmuşdur. Kompyuter otaqlarından biri elektron vəsaitlərlə təchiz olunub. Müəllimlər tədris prosesini fənlər üzrə elektron vəsaitlər vasitəsilə qururlar.

Məktəb Təhsil Nazirliyinin layihələrinə müvafiq olaraq "Yeni Təhsil Konsepsiyası–Kurikulumun inkişafı" layihəsinə qoşulmuşdur. Hazırda "Mədəd", "İntel" gələcək üçün təhsil proqramının kurslarında iştirak edir. "Vektor" Beynəlxalq Elmi Mərkəzi XXI əsr Azərbaycan ziyalıları beynəlxalq layihəsində də fəallıqla çalışır.

Sevindirici haldır ki, son illərdə məktəbin pedaqoji kollektivimizin səmərəli fəaliyyəti nəticəsində böyük uğurlar qazanılmışdır. Artıq müəllimlərimizin və şagirdlərimizin adları qaliblər sırasında çəkilir. Məsələn, bədən tərbiyəsi müəllimimiz Qurbanov Cəmşid 2007-ci ildə Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyi tərəfindən "Əməkdar məşqçi" fəxri adını almışdır.

2005-ci ildə "Təhsil sistemində müasir yanaşmaların təşəkkülü ili" çərçivəsində də ən yaxşılar sırasına düşmüşük.

"İl çərçivəsində" keçirilən Pedaqoji mühazirələrdə Babayeva Sevil (2004) və Nağıyeva Ruhiyyə (2005) qalib sayılmışlar.

Salayeva Zenfira (2001), Əfəndiyeva Dilzar (2007) "İlin müəllimi" müsabiqəsinin qalibləri olmuşlar.

Nağıyeva Ruhiyyə (2003) "Təhsildə keyfiyyət ili" çərçivəsində keçirilən "İlin ən yaxşı psixoloqu" müsabiqəsinin qalibi, Məmmədova Firəngiz Abdulla (2006) Amerika Təhsil Şurası və Azərbaycan Respublikası Təhsil Nazirliyinin birgə keçirdiyi "İngilis dili və Amerika ölkəşünaslıq fənlərinin tədrisi üzrə yüksək mükafat" (TEA) müsabiqəsinin qalibi sayılmışdır.

Ümummilli lider Heydər Əliyevin anadan olması qeyd olunan yubiley günləri münasibətilə ümumtəhsil məktəb şagirdləri arasında keçirilən "Heydər Əliyev məktəblilərin gözü ilə" inşa yazı müsabiqəsində məktəbimizin şagirdləri Hüseynov Elvar, Yusubov Ələsgər, Cabarlı Pərvin, Səmədov Nicat müvafiq yerlər tutub qalib adını almışlar.

Heydər Əliyev şəxsiyyətinə, irsinə olan sonsuz məhəbbət şagirdləri bu irsin öyrənilməsilə bağlı keçirilən "Heydər Əliyev irsinin öyrənilməsi" müsabiqəsinə sövq etmiş və bunların içərisindən 33 nəfər qalib seçilmişdir.

Lakin uğurlarımız bizi arxayınlaşdırmır. Qurultayda təhsil nazirimiz Mikayıl Cabbarovun məruzəsində və çıxışlarda müasir dünya təhsilinə inteqrasiya məsələlərinə çox həssaslıqla yanaşılmış, ona həqiqətən, müasir münasibət bildirilmişdir. Hazırda bütün ölkədə olduğu kimi, məktəbimizdə də qurultay materialları öyrənilir, təlim məzmunundakı dəyişikliklər bütün müəllimlər tərəfindən mənimsədilir, gündəlik işlərində tətbiq olunması üçün fəaliyyət planı tərtib olunur və böyük işlərin icrasının təməli qoyulur.

**Müsahibəni apardı: "Azərbaycan məktəbi" jurnalının əməkdaşı, Azərbaycan Jurnalistlər Birliyinin üzvü Sveta Məmmədova**

***Bunları bilmək maraqlıdır***

# AZƏRBAYCAN MÜƏLLİMLƏRİNİN III QURULTAYI

## (20 avqust – 1 sentyabr 1919-cu il)

Məktəb islahatı sahəsində məsələləri ətraflı müzakirə etmək, müəyyən təkliflər hazırlayıb hökumətə təqdim etmək məqsədilə Azərbaycan hökumətinin qərarı ilə 1919-cu il avqustun 20-dən sentyabrın 1-dək Bakıda Azərbaycan müəllimlərinin qurultayı çağırılır. Qurultayın keçirilməsi xərcləri üçün Azərbaycan hökumətinin 2 avqust 1919-cu il tarixli qərarı ilə Xalq Maarif Nazirliyinin sərəncamına 35.600 manat məbləğində vəsait də ayrılır.

Azərbaycan müəllimlərinin 1906-cı (avqust) və 1907-ci (avqust) illərdə keçirilmiş birinci və ikinci qurultaylarından sonra sayca üçüncüsü olan həmin qurultay 1919-cu il avqustun 20-də saat 11-də Bakı I realnı məktəbin (indiki Azərbaycan Dövlət İqtisad Universitetinin) akt zalında öz işinə başlayır və nəzərdə tutulan müddətdə öz işini başa çatdırır. Qurultayda Azərbaycanın bütün bölgələrini və tədris müəssisələrini təmsil edən nümayəndələr iştirak edirdilər. Qurultayı Azərbaycan Türk Müəllimləri İttifaqının sədri Ağabəy İsrafilbəyov açmış, qurultayda Xalq Maarif Nazirliyi adından nazir müavini Həmid bəy Şahtaxtinski böyük nitq söyləmişdir.

Qurultayın Xalq Maarif Nazirliyinə təqdim etdiyi təkliflər əsasında bütövlükdə məktəb islahatı və xüsusi olaraq təhsilin məzmunca milliləşdirilməsini əsas tutan proqram və dərslik islahatı üzrə müvafiq proqram hazırlamaq məqsədilə hökumət komissiyası yaradılır. 1919-cu il noyabrın 7-də Xalq Maarif Nazirliyi yanında yaradılan hökumət islahat komissiyasına xalq maarif nazirinin müavini Həmid bəy Şahtaxtinski (sədr), Nurməhəmməd bəy Şahsuvarov, Azad bəy Əmirov, Fətulla bəy Rzabəyev, Soltan Məcid Qənizadə, Abdulla bəy Əfəndiyev, Sara xanım Yaqubova, Sara xanım Xuramoviç, Əhməd bəy Pepinov, Xədicə xanım Ağayeva, Məmmədağa Şahtaxtinski, Cabbar bəy Orucəliyev və Saleh bəy Vəkilov daxil idilər. Hökumət bu komissiya qarşısında növbəti dərs ilinin əvvəlinə kimi məktəb islahatı, o cümlədən təhsilin məzmunu ilə bağlı məsələlərin həlli üzrə hökumət proqramını hazırlamaq missiyası qoymuşdu. Komissiya öz işini başa çatdırana kimi milli hökumət devrildisə də, həmin məsələlər üzrə müəyyən işlər də görə bildi. Belə ki, bu komissiyanın təşəbbüsü və rəhbərliyi ilə 1919-cu ilin dekabrında Bakıda keçirilmiş müəllim seminariyaları, xalq maarifi inspektorları, ali, ibtidai və orta məktəb müdirlərinin 15 günlük müşavirəsində ümumtəhsil müəssisələrində istifadə olunan dərsliklər məsələsini geniş müzakirə edərək müəyyən təkliflər hazırlandı. Bununla yanaşı, müxtəlif fənlər üzrə, o cümlədən Mahmud bəy Mahmudbəyovun sədrliyi ilə ana dili və ədəbiyyat fənni (7 nəfər) üzrə, Pənah Qasımovun sədrliyi ilə tarix fənni (2 nəfər) üzrə, Səməd bəy Acalovun sədrliyi ilə riyaziyyat fənni (4 nəfər) üzrə, Cəmo bəy Cəbrayılbəylinin sədrliyi ilə təbiət fənni (8 nəfər) üzrə komissiyalar yaradıldı. Azərbaycan hökuməti dərslik islahatı sahəsində işləri stimullaşdırmaq məqsədilə ana dilində dərslik

hazırlayan komissiyalara dövlət büdcəsindən ayrıca vəsait ayrılması barədə qərar da qəbul etmişdi. Bu komissiyalar Azərbaycan Xalq Cümhuriyyəti qurultayınadək ibtidai məktəblərdə istifadə olunan dərslikləri ətraflı müzakirə edərək onlardan tədrisə yararlı olanlarının müvəqqəti istifadəsinə (yeni dərsliklər yaradılanadək) icazə vermək barədə Xalq Maarif Nazirliyinə təkliflər hazırladı. Eyni zamanda bir sıra yeni dərsliklər də hazırlandı ki, bu işdə görkəmli maarifçilərdən Səməd bəy Acalov, Mahmud bəy Mahmudbəyov, Fərhad Ağazadə, Cəmo bəy Cəbrayılbəyli, Ağabəy İsrafilbəyov, Abdulla Şaiq, Hüseyn Cavid, Abdulla bəy Əfəndizadə, Qafur Rəşad Mirzəzadə, Axund Yusif Talıbzadə, Firidun bəy Köçərli və başqalarının xidmətlərini böyük minnətdarlıq hissləri ilə yad edirik. Azərbaycan hökumətinin mövcud dərsliklərdən istifadə və ya yeni dərsliklərin yaradılması sahəsində apardığı məqsədyönlü iş nəticəsində, dərslik üzrə nazirliyin xüsusi komissiyalarının təklifləri əsasında təkcə 1919-cu ildə "Son Türk əlifbası", "Türk çələngi", "Ədəbiyyat dərsləri", "Müntəxəbat", "Rəhbəri-sərf", "Təzə elmi-hesab", "Yeni məktəb", "Tarixi-təbii" kimi yeni dərsliklər hazırlandı, yaxud məzmunca, yeni şəraitə uyğunlaşdırılaraq kütləvi tirajla nəşr edilərək məktəblilərin istifadəsinə verildi...

***Azərbaycan müəllimlərinin qurultayları, I-XII kitabından. Bakı, 2008. səh. 54-55.***

***O illərdəki çıxışlardan:***

# BAKI ŞƏHƏRİNDƏKİ 190 NÖMRƏLİ MƏKTƏBİN MÜƏLLİMİ, SOSİALİST ƏMƏYİ QƏHRƏMANI ZƏRBƏLİ SƏMƏDOVUN ÇIXIŞI

— Hörmətli yoldaşlar! Azərbaycan müəllimlərinin IX qurultayı əlamətdar vaxtda keçirilir.

Fərəhli haldır ki, Vətənimizin hər yerində olduğu kimi, respublikamızda da xalq maarifi yüksək sürətlə inkişaf edir. Hamılıqla orta təhsilə keçid əsasən başa çatdırılmış və dünyada ilk dəfə olaraq gənclərin orta təhsil alması haqqında qanun yeni Konstitusiyamızda qanunvericiliklə təsbit olunmuşdur.

Artıq 33 ildir ki, mən 190 nömrəli məktəbdə işləyirəm. Son 10 ildə məktəbimizdə böyük irəliləyiş olmuşdur. O, sözün əsl mənasında qabaqcıl təcrübə məktəbinə çevrilmişdir. Ucsuz-bucaqsız Vətənimizin müxtəlif guşələrindən, hətta xarici ölkələrdən bura hər il yüzlərlə qonaq gəlir. Məktəbimiz haqqında onların rəy kitabındakı təəssüratlarını həyəcansız oxumaq mümkün deyildir.

Qonaqlar məktəbimizdə şagirdlərin kommunist tərbiyəsinin düzgün quruluşunu bir daha təsdiq edir və bütün bunlar bizi sevindirir. Biz təlim-tərbiyə işlərini partiya və hökumətin məktəb haqqındakı yeni qərarının tələblərinə müvafiq surətdə qurmağa çalışırıq.

Cəmiyyətimizin mahiyyətindən irəli gələn dostluq, qardaşlıq, beynəlmiləlçilik hislərinin şagirdlərə aşılanması müəllimlərimizin gündəlik vəzifələrinə çevrilmişdir.

Şagirdlərin beynəlmiləl tərbiyəsinin nümunəvi təşkilinə görə məktəbimiz SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin qızıl medalı və Xarici Ölkələrlə Mədəni Əlaqələr Cəmiyyətinin Fəxri Fərmanı ilə təltif edilmişdir.

Mən ədəbiyyat müəllimiyəm və buna görə də həmin fənnin tədrisi üzərində bir qədər geniş dayanmaq istəyirəm.

Məlumdur ki, ədəbiyyat məktəblilərin ideya-siyasi, estetik tərbiyəsində, onların kommunist dünyagörüşünün formalaşmasında son dərəcə əhəmiyyətli rol oynayır. Şifahi xalq yaradıcılığının, klassik və sovet ədəbiyyatının ən yaxşı nümunələri timsalında uşaqlarda yüksək əxlaqi keyfiyyətlər tərbiyə edirik.

Şagirdlərdə vətənpərvərlik, beynəlmiləlçilik, əməksevərlik, humanizm, qəhrəmanlıq və yoldaşlıq kimi bəşəri hislər aşılamaqla, biz onları partiyaya, xalqa, sosialist vətənimizə dərin məhəbbət, burjuaziya əxlaqına nifrət ruhunda tərbiyələndiririk.

Görkəmli yazıçı və şairlərdən Nizami, Füzuli, Vaqif, Puşkin, Cəlil Məmmədquluzadə, Sabir, Maksim Qorki, V.Mayakovski, C.Cabbarlı, S.Vurğun, Süleyman Rüstəm, Məmməd Rahim, R.Rza və bir çox başqalarının əsərləri gənc nəslin kommunist tərbiyəsində əvəzsiz vəsait, qiymətli vasitə hesab olunur.

Biz fəaliyyətimizi sinifdəki 45 dəqiqəlik dərs saatı ilə məhdudlaşdırmırıq. Sinifdənxaric tədbirlər prosesində də fənnin öyrənilməsinə ciddi diqqət yetiririk. Bu məqsədlə vaxtaşırı oxucu konfransları, disputlar keçirir, ədəbi-bədii axşamlar təşkil edir, muzeylərə gedir, kollektiv surətdə yeni bədii və sənədli filmlərə tamaşa edir və onların müzakirəsini keçiririk.

Fürsətdən istifadə edərək, qurultayın

yüksək tribunasından bəzi təkliflərimi də bildirmək istəyirəm.

"Maarif" nəşriyyatının ədəbiyyat fənninin daha yaxşı öyrənilməsinə xidmət edən metodik və əyani vəsait buraxılışını artırmasını istərdik.

Yazıçı və şairlərimizə müraciətlə xahiş edirik ki, onlar öz əsərlərində müasir tələblərə cavab verən sovet müəlliminin parlaq obrazını yaratsınlar, onların zəngin mənəvi aləmini, şərəfli müəllim əməyini əks etdirən yeni əsərlər yazsınlar; gənc oğlan və qızlar - yuxarı sinif şagirdləri haqqında daha çox kitab nəşr etdirsinlər.

Cəfər Cabbarlı adına "Azərbaycanfilm" kinostudiyası və respublika Televiziya və Radio Verilişləri Komitəsindən də bir xahişimiz var; qoy onlar sovet müəllimi obrazının yaradılmasına mümkün qədər ciddi yanaşsınlar. Axı müəllim gənc nəslin tərbiyəsi prosesinin başında dayanır. Sovet müəllimi özünün yüksək şəxsi əxlaqi keyfiyyətləri ilə hamı üçün nümunə olmalıdır. Yeni insanın formalaşması ilə məşğul olan sovet müəllimi özünün nəcib keyfiyyətləri ilə fərqlənməlidir. Görkəmli Azərbaycan maarifçisi Həsən bəy Zərdabinin qiymətli sözlərini xatırlatmaq istəyirəm: "Əgər məndən soruşsaydılar ki, ən şərəfli sənət hansıdır? Mən o zaman iftixarla belə deyərdim:

- Müəllimlik!"

Bu cür hörmətli, əvəzsiz sənətin şərəfini qorumaq bizim müqəddəs vəzifəmizdir.

Nəhayət, biz istərdik ki, respublika qəzetlərinin səhifələrində qabaqcıl maarif işçiləri haqqında daha çox material dərc olunsun.

İcazə verin, öz adımdan, çoxsaylı həmkarlarım adından hökumətimizi əmin edim ki, biz gənc nəslin tərbiyəsi ilə əlaqədar qarşımıza qoyulan vəzifələri şərəflə yerinə yetirəcək, yüksək savadlı, mənəviyyatca təmiz və zəngin, əməksevər oğlan və qızlar tərbiyə etməkdə bilik və qüvvəmizi əsirgəməyəcək, keçdiyimiz hər bir dərsin, məşğələnin keyfiyyət və səmərəliliyini daim yüksəldəcəyik.

**18-19 may, 1978**

**Azərbaycan müəllimlərinin qurultayları, I-XII kitabından. Bakı, 2008, səh. 443-446.**

# TOVUZ RAYONUNDAKI BOZALQANLI KƏND ORTA MƏKTƏBİNİN MÜƏLLİMİ, SOSİALİST ƏMƏYİ QƏHRƏMANI MƏHƏR QULİYEVİN ÇIXIŞI

- Yoldaşlar! Azərbaycan müəllimlərinin IX qurultayı bütün sovet xalqları üçün əlamətdar olan tarixi günlər şəraitində keçir...

Ölkəmiz ötən 60 il ərzində misilsiz müvəffəqiyyətlərə nail olmuşdur. Bunu doğma respublikamızın - Sovet Azərbaycanının timsalında daha aydın görmək olar. Respublikamız xalq təsərrüfatının bütün sahələrində, o cümlədən maarif və mədəniyyət sahəsində son illər xüsusilə böyük nailiyyətlər əldə etmişdir.

Sov.İKP MK Siyasi Bürosu üzvlüyünə namizəd, Azərbaycan KP MK-nın birinci katibi H.Ə.Əliyev yoldaşın dərin məzmunlu, parlaq nitqini hamımız böyük maraq və həyəcanla dinlədik. Burada müəllimin, xalq maarifi işçilərinin əməyinə yüksək qiymət verilmiş, ümumtəhsil məktəblərinin fəaliyyətinin daha da yaxşılaşdırılması üçün məsul vəzifələr irəli sürülmüşdür.

Mən fəxr edirəm ki, H.Ə.Əliyev yoldaşın adlarını çəkdiyi qabaqcıl tədris müəssisələri arasında bizim məktəbin-Bozalqanlı kənd məktəbinin də adı vardır.

Respublikanın xalq maarifi sahəsindəki müvəffəqiyyətlərinin Tovuz rayonu məktəblərinin timsalında da görmək olar. Rayonda 74 məktəb fəaliyyət göstərir ki, bunlardan da 36-sı orta məktəbdir. Həmin tədris müəssisələrində 32269 şagird təhsil alır. Rayonda hamılıqla orta təhsilə keçid başa çatdırılmışdır. 1977-ci ildə VIII sinifləri bitirənlərin hamısı orta təhsillə əhatə olunmuşdur. Keçən il rayonun 17 məktəbi ikiilliksiz işləmiş, 559 müəllim yüz faiz müvəffəqiyyət əldə etmişdir.

Mənim işlədiyim Bozalqanlı kənd məktəbində 1604 şagird oxuyur. Onların təlim-tərbiyəsi ilə 107 nəfər müəllim məşğuldur. Pedaqoji kollektiv yenilik hissi ilə yaşayır, daim yaradıcılıq axtarışları aparır.

Mən kimya müəllimiyəm və kimyanın tədrisində səmərəli təlim metodlarından geniş istifadə etməyə çalışıram. Məktəblilər maraqlı təcrübələr qoyur, nəzəri materialı öyrənməklə yanaşı, bitkilər üzrə müşahidələr aparır, müxtəlif vegetasiya dövrlərində onlara qulluq edir, kənd təsərrüfatı ziyanvericiləri ilə mübarizədə yeni metodlar müəyyənləşdirir, tədqiqatçılıq işləri ilə məşğul olurlar və s. Məktəbin üzüm bağı onların əli ilə yaşıl laboratoriyaya çevrilmişdir.

1971-ci ildə rayonda ilk dəfə yaranan kimya dərnəyi genişlənərək indi 139 şagirdi əhatə edən D.İ.Mendeleyev adına gənc kimyaçılar cəmiyyətinə çevrilmişdir. Cəmiyyət üzvləri gənc kimyaçıların Ümumittifaq baxışında, habelə respublika olimpiadasında müvəffəqiyyətlə iştirak etmişlər. Onlar iki dəfə gənc kimyaçıların Ümumittifaq, bir dəfə isə respublika baxışının qalibi olmuşlar.

Biz Ümumittifaq kimya cəmiyyəti ilə möhkəm əlaqə saxlayır, onlardan lazımi məsləhət və tövsiyələr alırıq.

RSFSR-in əməkdar elm xadimi, texnika elmləri doktoru K.Kozlov məktəbimizə göndərdiyi məktubunda yazır: “Mən fəxr edirəm ki, Ümumittifaq baxışının 14 qalibindən ikisi - Tovuz rayonundakı Bozalqanlı və Xatınlı kənd məktəblərinin – Azərbaycanın payına düşür!”

Məktəbimizin kimya laboratoriyası Moskvadakı 204 nömrəli eksperimental

məktəbin laboratoriyası ilə yarışır.

1975-ci ildə kimya üzrə respublika olimpiadası Tovuz rayonundakı Bozalqanlı kənd məktəbinin bazasında keçirilmişdir. Olimpiadada iştirak edən alimlər məktəbin əldə etdiyi müvəffəqiyyətləri yüksək qiymətləndirmişlər.

Məktəbin kimya laboratoriyası özünəməxsus metodik mərkəzə çevrilmişdir. Rayonun müxtəlif məktəblərində çalışan müəllimlər burada qabaqcıl təcrübəni öyrənməyə gəlir, fikir mübadiləsi aparırlar ki, bu da ümumi işimizə xeyli fayda verir. Rayonumuzdakı Çobansığnaq, Xatınlı kənd, Qovlar qəsəbə, şəhərdəki 26 Bakı Komissarı adına və A.S.Puşkin adına məktəblərdə çalışan müəllimlər də məhz qabaqcıl təcrübədən səmərəli istifadə etmək sayəsində yüksək göstəricilərə nail olmuşlar.

Qeyd etmək lazımdır ki, keçən ilin sonunda Sov.İKP MK və SSRİ Nazirlər Sovetinin məktəb haqqında qəbul etdikləri qərar ümumtəhsil məktəblərinin fəaliyyəti, o cümlədən əmək tərbiyəsi və peşə yönümünə diqqətin artırılması sahəsində geniş üfüqlər, yeni yaradıcılıq imkanları açır.

Yeni qərarla əlaqədar şəxsiyyətin formalaşmasında əmək tərbiyəsinin rolunun yüksəldilməsinə yönəldilən tədbirlər üzərində bir qədər ətraflı dayanmaq istərdim.

Məktəbimizin şagird istehsalat briqadası bir neçə ildir ki, fəaliyyət göstərir. Briqada öz sırasında hazırda 125 nəfər yuxarı sinif şagirdini birləşdirir. Onlar 120 hektar sahəyə xidmət edir və bir qayda olaraq həmişə yüksək məhsul toplayırlar. Bu işdə onlara məktəbin kimya dərnəyində torpağın xüsusiyyətlərinin öyrənilməsi, kimyəvi gübrələrin tərkibi və s. məsələlərə dair yiyələndikləri bilik, bacarıq və vərdişlər də xeyli kömək etmişdir.

Təcrübə tarlaları bizdə eksperimentlər aparılan, təcrübələr qoyulan, biologiya, aqrokimya, aqrotexnika üzrə praktik məşğələlər həyata keçirilən əsl yaşıl laboratoriyaya çevrilmişdir. Təsadüfi deyildir ki, təcrübə işləri sovxozun marağı, ehtiyacı ilə sıx əlaqələndirilir və nəticədə məzunların böyük əksəriyyəti həvəslə doğma sovxozda qalıb işləyir.

Yoldaşlar! Diqqətinizi ən ümdə məsələlərdən birinə yönəltmək istərdim.

Cəmi bir neçə il bundan əvvəl respublikadankənar şəhərlərin ali məktəblərində oxuyanları, necə deyərlər, barmaqla saymaq olurdu. Keçən il isə orta məktəb məzunlarından 800 nəfərdən çoxu respublikadankənar şəhərlərin ali məktəblərinə qəbul olunmuşdur. Hazırda həmin ali məktəblərdə təkcə Tovuz rayonundan 72 nəfər təhsil alır ki, onlardan da 12-ni Bozalqanlı məktəbini bitirənlər təşkil edir. Bu, partiya və hökumətin respublikamızda maarifin inkişafina göstərdikləri böyük qayğının təzahürüdür.

Partiya və hökumətimizin qayğısına biz kənd müəllimləri daha böyük səylə və yaradıcı əməyimizlə, kommunizm qurucularının ləyaqətli əvəzedicilərini tərbiyə etməklə cavab verməliyik.

**18-19 may, 1978**

**Azərbaycan müəllimlərinin qurultayları, I-XII kitabından. Bakı, 2008, səh. 452-455.**

# YEVLAX RAYONUNDAKI XALDAN KƏND ORTA MƏKTƏBİNİN DİREKTORU, SSRİ XALQ MÜƏLLİMİ ZAHİD ŞÖYÜBOVUN ÇIXIŞI

Respublika müəllimlərinin IX qurultayı bu gün Azərbaycanın maarif işçilərinin müvəffəqiyyəti haqqında Vətənə raport verir.

Kommunizm quruculuğunun müasir mərhələsi biz maarif işçilərinin qarşısında yüksək tələblər qoyur. Deməli, biz öz işimizi həmin tələblər səviyyəsində qurmalı, nailiyyətimizi bu günün, müasir həyatın irəli sürdüyü vəzifələrlə sıx əlaqələndirməliyik.

Müəllimin qayğısı heç də şagirdlərə dərin və əsaslı bilik verməklə məhdudlaşmır. Onları əməksevərlik, əməyə və əmək adamlarına məhəbbət ruhunda tərbiyələndirmək də müstəsna əhəmiyyət kəsb edir. Çünki oğlan və qızların məhz ictimai-faydalı əməkdə fəal iştirakı onların iradə və xarakterini möhkəmlədir. Bununla əlaqədar bəzi nümunələr gətirmək istərdim.

Məktəbimizin şagirdləri keçən beşillikdə 500 min ədəd meyvə və bəzək ağacı əkib becərmişlər. Məktəbin pioner və komsomolçuları son dərəcə faydalı bir təşəbbüs irəli sürmüşlər: Kür boyu Tuğay meşələrini bərpa etmək!

On hektarlıq sahə artıq bərpa olunmuşdur.

Bu nəcib təşəbbüs təkcə respublikamızda deyil, onun sərhədlərindən kənarda da şagird meşəçiləri tərəfindən rəğbətlə qarşılanmışdır.

Məktəbdə 200-dən çox şagirdi əhatə edən gənc pambıqçılar, meşəçilər və inşaatçılar briqadası fəaliyyət göstərir. Şagirdlərin həmin briqadalardakı iştirakı isə, hər şeydən əvvəl, onların peşəyönümünə xeyli kömək edir.

Şagirdlərin fiziki tərbiyəsini inkişaf etdirmək məqsədilə məktəbimizdə pioner və komsomolçuların təşəbbüsü və fəal iştirakı ilə futbol, voleybol, həndbol, basketbol, yüngül atletika, gimnastika, eləcə də üzgüçülüklə məşğul olmaq üçün hər cür şəraiti olan idman şəhərciyi yaradılmışdır. Burada şagirdlər ƏHM normalarını yerinə yetirməyə hazırlaşır və müvəffəqiyyətlə nail olurlar.

Böyük Vətən müharibəsində qələbəmizin 30 illiyi münasibətilə komsomolçular məktəbin həyətində müharibədə həlak olan xaldanlıların şərəfinə abidə ucaltmışlar.

Görülən işlərin, həyata keçirilən tədbirlərin hamısı haqqında müfəssəl danışmaq qeyri-mümkündür. Təkcə bunu demək kifayətdir ki, keçən müddət ərzində şagirdlərin ictimai-faydalı əməyi və məktəbin ərazisində keçirilən iməciliklər nəticəsində 200 min manatlıq iş görülmüş, tədris-təcrübə sahəsindən 100 min manatlıq gəlir əldə edilmişdir. Həmin vəsaitin hesabına məktəbdə təlim-tərbiyə işlərini idarə edən gözəl mərkəz yaradılmış, 40 min manatlıq müxtəlif avadanlıq, vəsait alınmışdır ki, bütün bunlar təlim-tərbiyə işlərinin keyfiyyətinin yüksəldilməsinə, orta təhsilin müvəffəqiyyətli tətbiqinə, əxlaq tərbiyəsinin, əmək və fiziki tərbiyənin yaxşılaşmasına müsbət təsir göstərir.

Hazırda Xaldan kənd orta məktəbində müasir avadanlıq və mebellə təchiz olunmuş 27 fənn kabineti, laboratoriya və emalatxana, habelə bir sıra digər təlim-tərbiyə mərkəzi fəaliyyət göstərir. Təlim-tərbiyə işlərinin təşkilində məktəbdə yaradılan televiziya mərkəzi xüsusi rol oynayır. Məktəbin bütün fənn kabinetlərinə, emalatxana və laboratoriyalarına telefon çəkilmiş, onlar radiolaşdırılmışdır. Burada aparılan işlər televiziyada əks etdirilir. Müəllim telefon vasitəsilə zəng vurur, bu və ya digər tədris filminin mavi ekrana buraxılmasını xahiş edir. Göstəriş dərhal yerinə yetirilir.

Teleməkəz məktəbin təşəbbüsü və tədris-təcrübə sahəsindən əldə edilən vəsait hesabına yaradılmışdır. Yeri gəlmişkən, onu da qeyd edək ki, Xaldandakı televiziya mərkəzi respublikada, bəlkə də ölkəmizdə kənd məktəbləri arasında ilk başlanğıcdır.

Məktəbimizdə şagirdlərin sovet vətənpərvərliyi və sosialist beynəlmiləlçiliyi tərbiyəsi üzrə də zəngin təcrübə toplanmışdır. Xaldan kənd məktəbi uzun illərdir ki, Ukraynın Kirovoqrad vilayətindəki Boqdanovka kənd orta məktəbi ilə yaxından dostluq əlaqəsi saxlayır. Məktəblərimizin müəllim və şagird kollektivlərinin dostluğunu bütün ölkə bilir.

Son zamanlar dostluq meridianımız daha da genişlənmişdir. İndi biz Moskva vilayətinin Balaşıx şəhərindəki 1 nömrəli və Stavropol diyarındakı Qırmızı Əmək Bayrağı ordenli 2 nömrəli Qriqoropol orta məktəbləri ilə də dostluq edirik.

Böyük Oktyabr sosialist inqilabının 60 illik yubiley təntənələrində iştirak etmək üçün moskvalı, ukraynalı və stavropollu müəllim və şagird dostlarımızın bir qrupu Xaldana qonaq gəlmişdi. Qonaqları kəndin bütün zəhmətkeşləri məhəbbət və səmimiyyətlə qarşıladılar.

Adları çəkilən 4 məktəbin hər biri hər il beynəlmiləl əmək və istirahət düşərgəsi təşkil edir.

Xaldan kənd məktəbinin ölkəmizin qabaqcıl məktəbləri ilə dostluq əlaqələrini əks etdirən xüsusi film çəkilmiş, sənədli povest yazılmışdır.

Yoldaşlar!

Xaldan kənd orta məktəbinin təcrübəsi Yevlax rayonu məktəblərində geniş yayılır. Biz fəxr edirik ki, əldə etdiyimiz təcrübədən respublikamızın digər məktəbləri də istifadə edirlər.

Xaldan kənd məktəbinin təcrübəsi ilə tanış olmaq məqsədilə Moskva, Volqoqrad vilayətlərindən, Stavropol diyarından, Ukrayna, Qazaxıstan, Gürcüstan və digər qardaş respublikalardan da bizə çoxlu nümayəndələr gəlir.

Azərbaycan SSR Maarif Nazirliyi keçən ilin fevral ayında Xaldan kənd orta məktəbinin bazasında rəhbər maarif işçilərinin respublika müşavirəsini keçirmişdir.

Yoldaşlar! İşimizdə hələ nöqsanlar da vardır. Xalq maarifinin daha da inkişaf etdirilməsi ilə əlaqədar bəzi problemlərin həllində bir sıra çətinliklərlə qarşılaşmalı oluruq. Respublikanın kənd məktəbləri şagirdlərin estetik tərbiyəsi və musiqi təliminin yaxşılaşmasına ehtiyac duyur.

Görkəmli sovet bəstəkarı Dmitri Borisoviç Kabalevski musiqi-nəğmə təliminin nə qədər böyük əhəmiyyətə malik olduğunu bilərək, 4 il bundan əvvəl Moskva məktəblərinin birində özünün tərtib etdiyi proqram əsasında həmin fənni tədris etməyə başlamışdır. İndi, necə deyərlər, Kabalevski məktəbinin sayı təkcə RSFSR-də 2500-ə çatır. Bizim respublikada da tanınmış bəstəkar az deyildir. İstərdik ki, bizdə də Kabalevski məktəbləri fəaliyyət göstərsin.

Yaxud başqa bir məsələni-məktəb binalarının layihələşdirilməsində buraxılan nöqsanları götürək. Məktəb binalarının layihəsini hazırlayanlar xalq maarifinin inkişaf perspektivini nəzərə almalıdırlar.

Sov.İKP MK Siyasi Bürosu üzvlüyünə namizəd, Azərbaycan KP MK-nın birinci katibi H.Ə.Əliyev Xaldan kənd orta məktəbi kollektivinin müvəffəqiyyətlərini yüksək qiymətləndirmişdir. Bu, kollektivimizin qarşısında son dərəcə məsul vəzifələr qoyur. Biz qazanılan müvəffəqiyyətləri möhkəmləndirib artırmaq, gənc nəslin-kommunizm cəmiyyətinin gələcək qurucularının təlim-tərbiyəsini daha yüksək səviyyədə qurmaq üçün bütün səy və qüvvəmizi sərf edəcəyik.

**18-19 may, 1978**

**Azərbaycan müəllimlərinin qurultayları, I-XII kitabından. Bakı, 2008, səh. 457-461.**

# AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN PROFESSORU, FİZİKA ÜZRƏ ELMİ-METODİK ŞURANIN SƏDRİ MİRZƏLİ MURĞUZOVUN ÇIXIŞI

- Hörmətli nazir!

Hörmətli nümayəndələr!

Ölkəmizdə aparılan milli təhsil quruculuğunda ən əsas istiqamətlərdən biri də təhsilin məzmunca yeniləşdirilməsi və dərslik yaradıcılığıdır. Bu sahədə başlıca vəzifəni ölkə Prezidenti möhtərəm cənab Heydər Əliyev belə bir konseptual fikirlə ifadə etmişdir: “Dövlət müstəqilliyinin xalqımıza bəxş etdiyi nemətlərdən biri də odur ki, biz artıq öz təhsil sistemimizi xalqımızın, millətimizin tarixinə, mənəviyyatına, ənənələrinə uyğun qururuq. Burada dərsliklərin dəyişilməsi, yeni dərsliklərin yaranması xüsusi əhəmiyyət kəsb edir... İndi dərs alan uşaqlar, gənclər gərək mütləq və mütləq bizim yeni dərsliklər əsasında oxusunlar...”.

Vaxtilə Dekard demişdir: “Tikinti materiallarının olması hələ o demək deyildir ki, ev tikmək olar. Onlarla necə davranmaq lazımdır? Hansı qaydalarla, hansı prinsip və qanunauyğunluqlara əməl etmək lazımdır?” Proqram və dərsliklərin yaradılması da buna bənzəyir.

Aydındır ki, yeni proqram və dərslik yaratmaq məsuliyyətli və çətindir. Çünki burada söhbət milyonlarla gəncin elmi dünyagörüşünün düzgün formalaşdırılmasından gedir.

Son illərə kimi fundamental və dəqiq elmlər üzrə orta məktəbdə rus dilindən tərcümə edilmiş dərsliklər müəyyən üstün cəhətlərə malik olsa da, qüsurlu və milli ruhdan uzaq idi. Fizika dərsliyinin nümunəsində bunu daha aydın görmək olar.

Keçmiş proqram və dərsliklərin quruluş və məzmunu orta təhsil sisteminin quruluşu ilə uzlaşmırdı. Belə ki, həmin dövrlərdə əsas və orta təhsil pilləsində tədris materialları kurs boyunca düzgün və rasional paylanmadığından təhsildə sistemsizlik hökm sürürdü. Belə hallar digər fənlərin proqram və dərsliklərində də özünü göstərirdi.

Keçmiş dərsliklərdəki əsas qüsurlardan biri də təbiət və cəmiyyət hadisələrini təsvir edərkən bir çox hallarda eyni anlayışların və təriflərin müxtəlif dərsliklərdə müxtəlif cür verilməsi idi. Nəticədə şagirdlər hansının doğru olduğunu ayırd edə bilmirdilər. Bu da fənlərarası vahid əlaqəli sistemin olmamasından irəli gəlirdi. Belə bir faktı xatırlamaq yerinə düşərdi ki, XVIII əsrin II yarısında kimya elmində təriflər və anlayışlar dəyişik salındığına görə kimyanın inkişafı dayandırılmışdı. Bu böhranı vaxtilə çox çətinliklə Lavuaze aradan qaldıra bildi.

XX əsrin 70-ci illərindən etibarən fundamental elm sahələrində bir çox yeni kəşflər, nəzəriyyələr və ideyalar meydana gəlməsinə baxmayaraq, onlar keçmiş proqram və dərsliklərdən kənarda qalmışdır. Bir elm sahəsi olan fizika elə bir inkişaf mərhələsinə gəlib çatmışdır ki, o bütün təbiət elmlərinin universal dilinə çevrilmişdir. Riyaziyyatın fizikada oynadığı rolu indi fizika təbiət elmlərində oynayır. Son tədqiqatlar göstərir ki, təbiətdə təcrid olunmuş fiziki, kimyəvi, bioloji hadisələr yoxdur. Bütün təbiət hadisələri qarşılıqlı əlaqədə baş verir və onları bölmək şərtidir. İndi elmin yeni sahələri yaranmışdır. Bəzi sistemlərdə özünütəşkil qanunauyğunluğu formalaşır ki, bu da fizika, kimya, biologiya, sosiologiya, iqtisadiyyat, psixologiya, dilşünaslıq və s. sahələrdə geniş tətbiq olunur. Artıq bunların inteqrasiyası nəticəsində təbiət-insan-həyat-cəmiyyət və dövlət qanunları formalaşır. Bu gün respublikamızda keçirilən dərslik islahatında istər təbiət, istərsə də humanitar elmlərin inteqrasiyası sahəsində xeyli

işlər görülmüşdür.

Yeni proqram və dərsliklərə daxil edilmiş tədris materialları şagirdlərdə etnik, dil mədəniyyəti, milli dəyərləri fərqləndirmək və qoruyub saxlamaq kimi vətənpərvərlik keyfiyyətləri tərbiyə edir. Orta əsrlərdən bu günə kimi dünya elminə öz töhfələrini bəxş etmiş Azərbaycanın bir çox filosof və alimlərinin elmi yaradıcılıqları dərsliklərdə öz əksini tapmışdır. Azərbaycanda fizika elminin əsasını qoymuş və bu il 1010 illiyini qeyd etdiyimiz görkəmli Azərbaycan filosofu Bəhmənyarı nümunə göstərmək olar.

Təbiət, insan və cəmiyyət hadisələrində qlobal təkamülçülük intellektin xeyrinə işləyir. Təkcə belə bir maraqlı faktı göstərmək kifayətdir ki, elektrik cərəyanının kəşfi ilə onun tətbiqi arasında əvvəllər 50 il vaxt tələb olunduğu halda, sonralar ondan daha mürəkkəb olan bir prosesdə-Uran nüvəsinin bölünməsinin kəşfi ilə onun tətbiqi (reaktorun qurulması) arasındakı zaman 3 il vaxt tələb etmişdir. Bu və digər faktlar göstərir ki, insan intellekti zaman keçdikcə yüksəlir. Ona görə də müasir dərsliklərdə bunlar nəzərə alınmış, mövzular sadə və anlaşıqlı dildə olmaqla yanaşı, yüksək və müasir elmi səviyyədə hazırlanmışdır.

Dərslik islahatındakı bu prinsiplər nazirliyin diqqət mərkəzində durmuşdur. Bu məqsədlə müxtəlif fənlərdən proqram və dərsliklər yaratmaq üçün tanınmış alim və orta məktəb müəllimlərindən ibarət işçi qrupları yaradıldı. Onların qarşısında, ilk növbədə, proqram və dərsliklərin məzmunu ilə məktəbin quruluşu arasındakı uyğunsuzluğu aradan qaldıran, elmi nəzəriyyənin praktika ilə əlaqələndirilməsində səmərəli sistemi müəyyənləşdirən, şagirdlərə təşəbbüskarlıq, məntiqi düşünmək, yaradıcılıq, kollektivçilik qabiliyyətləri aşılayan dərsliklərin hazırlanması vəzifəsi qoyuldu. Bu gün qurultay iştirakçılarına, bütün xalqımıza iftixarla deyə bilərik ki, respublikamızda təhsilin məzmunca yeniləşdirilməsi prosesi, yeni proqram və dərsliklərin yaradılması prosesi uğurla davam edir.

Hazırda müstəqil Azərbaycanımızın məktəblərində təhsil alan şagirdlər üçün müasir elmi, psixoloji və pedaqoji tələblərə cavab verən nəfis, yüksək bədii tərtibatda yeni dərsliklər və şagirdlər üçün iş dəftərləri hazırlanaraq istifadəyə verilmişdir. Məsələn, VII-IX siniflər üçün "Cəbr", X-XI siniflər üçün "Cəbr və analizin başlanğıcı", VII-XI siniflər üçün "Həndəsə", VII-VIII siniflər üçün "Fizika", V-IX siniflər üçün "Azərbaycan dili" və s. yeni dərsliklərinin nəşri təhsilimizdə hadisə kimi qiymətləndirilə bilər. Bu gün dərsliklərimizin təkmilləşdirilməsi, stabilləşdirilməsi və uzunömürlü olması sahəsində ardıcıl iş aparılır.

Müasir dərsliklərimizin poliqrafik tərtibatı da xeyli fərqlənir. Şəkillər, qrafiklər, cədvəllər üçün istifadə olunmuş rənglər dərsliklərdə zövqlə seçilmiş, onların əyaniliyi maksimum təmin olunmuşdur. Dərsliklər keyfiyyətli kağızda, oxunaqlı səviyyədə çap olunmuşdur.

10 il bundan əvvəlki dərsliklər bugünkü dərsliklərimiz ilə qətiyyən müqayisə oluna bilməz.

İndi dərsliklərimiz ancaq dünyanın qabaqcıl ölkələrinin dərslikləri ilə müqayisə edilə bilər. Onların hər birindən təbiətimizin, tariximizin, dilimizin, mədəniyyətimizin, adət-ənənələrimizin və elmimizin ətri duyulur.

Çox təəssüf ki, təhsildən o qədər də xəbəri olmayan adamlar proqram və dərsliklərimiz haqqında qeyri-obyektiv fikirlər söyləyirlər. Keçmiş konsepsiyadan ayrıla bilməyən, milli təhsilimizin uğurlarına göz yumub, ona qara yaxanlara bir sözümüz var:

"Dövrün inkişaf gəmisində hərəkətdə olanlar üçün yeni konsepsiyaya keçid təbii və müqavimətsiz başa gəlir. Sahildə oturub bu gəmiyə arxadan tamaşa edənlər üçün gəmi tezliklə görünməz olur".

Bu gün Azərbaycan məktəbi təkamüldə olan təbiətin özü kimi sürətlə formalaşmaqda, inkişafda və mükəmməlləşməkdədir.

**XII qurultay, 04 oktyabr 2003-cü il**